*Bu əsər "**Nizami**. Lirika. Sirlər xəzinəsi. Şərəfnamə "*
*(Bakı, Yazıçı, 1988) kitabı əsasında*
*təkrar nəşrə hazırlanmışdır*

Farscadan tərcümə edəni və izahların müəllifi: **Xəlil Rza Ulutürk**

Ön sözün müəllifi və elmi redaktor: **Xəlil Yusifli**
*filologiya elmləri doktoru, professor*

894.361'1 - dc 21
AZE
**Nizami Gəncəvi.** Sirlər xəzinəsi. "Lider nəşriyyat", Bakı, 2004,
264 səh.

"Sirlər xəzinəsi" poeması "Xəmsə"nin birinci kitabıdır. Bu əsərdə dahi Azərbaycan şairi Nizami Gəncəvi qəddar şahları, hökmdarları ədalətli olmağa çağırmış, tənbəlləri, ikiüzlüləri tənqid etmiş, halal zəhmətlə yaşayan sadə adamlara öz yüksək məhəbbətini bildirmişdir.

**ISBN 9952-417-06-1**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# NİZAMİ GƏNCƏVİ VƏ ONUN "SİRLƏR XƏZİNƏSİ" POEMASI

Dahi Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvi bəşər mədəniyyətinin yetirdiyi nadir şəxsiyyətlərdəndir. Söz dünyasının günəşi, hələ sağlığında ikən əsərləri möcüzə sayılan Nizami özü də yaradıcılığının dəyərini yaxşı bilmişdir. Şair "Sirlər xəzinəsi" poemasında belə bir fikir yürüdür ki, elmin, mədəniyyətin, ədəbiyyatın inkişafında dəmir bir qanunauyğunluq var. Nizami özündən əvvəlkilərlə müqayisədə şeri elə bir əlçatmaz yüksəkliyə qaldırmışdır ki, sonradan gələn sənətkarlar artıq ondan yüksəyə qalxmaq xülyasına düşməmiş, onun yolu ilə getməyi, ona bənzəməyi, onun şagirdi olmağı özləri üçün fəxarət saymışlar. Nizami mövzularında əsərlər yazmaq, ondan mənalar iqtibas etmək artıq bir ənənəyə çevrilmişdi.

Nizami Gəncəvi 1141-ci ildə Gəncə şəhərində anadan olmuşdur. Şairin əsərlərindən anlaşılan budur ki, o, təhsilini də öz doğma şəhərində almışdır. Bu dövrdə Gəncə şəhərində təhsil almaq üçün kifayət qədər geniş imkanlar var idi. Şair "Xəmsə"də adının İlyas, atasının adının Yusif, babasının adının Zəki Müəyyəd olduğunu göstərmişdir. Alimlər onun babasının adındakı iki sözdən birinin ləqəb olduğunu düşünürlər ki, bu da şairin mövqe, hörmət sahibi olduğunu düşünməyə əsas verir. Şair əsərlərində ancaq Nizami təxəllüsünü işlətmişdir. Bu söz nizamlı, ölçülü sözə, nəzmə, başqa ifadə ilə desək, şerə mənsub olan adam deməkdir. Nizaminin ləqəbini bəzi qaynaqlar Nizaməddin, yaxud Cəmaləddin kimi yazırlar, ancaq şairin əsərlərində bu ləqəbi təsdiqləyəcək əlamətlər yoxdur.

Nizami dayısının adını Xacə Ömər kimi xatırlayır, onun ölümünü özü üçün böyük itki sayır, "Leyli və Məcnun" poemasındakı Səlim Amiri surəti ilə dayısına olan məhəbbətini əks etdirir. Xacə Ömər adının əvvəlindəki Xacə sözünü isə müxtəlif şəkillərdə izah edirlər. Ağa mənasında işlənən bu söz daha çox vəzirlərin, tacirbaşı və başqa yüksək rütbə, mövqe sahiblərinin adının əvvəlinə artırılırdı. Bizə görə bu adam yüksək rütbəli bir ziyalı, bəlkə Gəncədə mədrəsə müdiri və ya buna bənzər vəzifə sahibi olmuşdur.

Nizaminin doğulduğu, ömrü boyu yaşadığı və vəfat etdiyi yer Gəncə şəhəridir. Bütün qədim və etibarlı mənbələr də onun Gəncədən olduğunu yazır. Nizami əsərlərinin XIV-XV əsrlərə aid əlyazmalarında şairin Gəncəyə gəlmə olduğu barədə heç bir qeyd yoxdur. Ancaq Nizami əsərlərinin XVI əsrdə və sonralar köçürülmüş nüsxələrində "İqbalnamə"nin bir yerində şair Gəncədən danışan zaman fikir yarımçıq kəsilərək aşağıdakı dörd misra artırılmışdır:

Gəncə dənizində olsam da pünhan,
Yerim Qum şəhridir, yurdum Qohestan.
Təfrişdə Ta adlı bir kənd dayanıb,
Nizami ad-sanı ordan qazanıb!

Burada söhbət İranın Qum vilayətindən, oradakı Təfriş adlı elmin Ta adlı kəndindən gedir. Qohestan Qum vilayətinin şərqində böyük bir ərazinin tarixi - coğrafi adıdır. Nizami irsinin ən gözəl bilicilərindən biri kimi tanınan və şairin əsərlərini yeddi cilddə şərhlərlə birlikdə nəşr edən Vəhid Dəstgerdi yuxarıdakı misraları yersiz bir artırma sayır. V.Dəstgerdi Nizaminin Əcəm İraqından olduğunu iddia etsə də, yuxarıdakı misralarda irəli sürülən fikri qəbul etmir. Dəstgerdinin Nizamini iraqlı hesab etməsi şairin tez-tez İraqı tərifləməsi, ora getməyi arzu etməsinə əsaslanır. Halbuki, Xaqani də dönə-dönə İraqı vəsf etmiş, ora getmək arzusunu bildirmişdir, ancaq onun şirvanlı olduğu məlumdur.

Nizami İraqa getmək arzusunu bildirərkən müxtəlif şəkillərdə Gəncəni öz vətəni, öz ölkəsi kimi qeyd etməyi unutmur. "Ləl öz mədənindən çıxmayınca ona qiymət verilməz" deyən şair köklü, əsilli bir gəncəli olduğunu bir daha nəzərə çarpdırır. Təəssüflər olsun ki, XVI əsrdən sonra yazılan bir çox təzkirələrdə Nizaminin babasının, yaxud atasının İranın Qum vilayətinin Təfriş elinin Ta kəndindən olduğu barədə və bu kimi fikirlər yürüdülmüşdür.

Nizami yaradıcılığa çox erkən başlamış, ilk çağlardan sarayların diqqətini cəlb etmişdir. Dərbənd hakimi Bəybars ibn Müzəffərə göndərdiyi hər şeirə görə qiymətli hədiyyələrə layiq görülmüş, ərməğanı olan Afaq adlı qadınla evlənmiş və ondan da 1174-cü ildə Məhəmməd adlı bir oğlu olmuşdur. "Xosrov və Şirin" poeması yazılarkən bu qadın artıq həyatda yox idi. Sonralar şair daha iki dəfə evlənsə də, Afaqı ömrü boyu böyük sevgi ilə xatırlamış, taleyinin uğursuzluğundan gileylənmişdir.

Nizami 1209-cu il martın 12-də doğma şəhəri Gəncədə vəfat etmişdir. İndi onun məzarı üzərində möhtəşəm bir məqbərə ucalmaqdadır. Dahi şair və mütəfəkkirin adı doğma vətəni Azərbaycanda əbədiləşdirilmiş, əsərləri dəfələrlə kütləvi tirajla nəşr olunmuşdur. Nizami Gəncəvinin anadan olmasının 800 və 840 illik yubileyləri geniş qeyd edilmişdir.

* * *

Nizaminin ilk iri həcmli əsəri "Sirlər xəzinəsi" poemasıdır. Yaxın və Orta Şərq ədəbiyyatında didaktik poema janrının ən qiymətli nümunəsi olan bu əsər dahi şairin yaradıcılığında epik şeir sahəsində ilk qələm təcrübəsi idi. Əsər hicri tarixilə 570-ci ildə yazılmışdır ki, miladi təqvimilə 1174-1175-ci illərə uyğun gəlir. "Azərbaycan ədəbiyyatı tarixi"nin birinci cildində (Bakı, 1960) mexaniki səhv nəticəsində poemanın 1170-ci ilin əvvəllərində yazıldığı göstərilmişdir. Təəssüf ki, bu mexaniki səhv sonra yazılmış bütün əsərlərdə, o cümlədən dərsliklərdə təkrar olunmuşdur. Poemadakı

Beş yüz ilə yetmiş olub, qalx, oyan,
Gün qalxıb, məclisə gəl durmadan

beyti və bir sıra başqa faktlar poemanın 1174-cü ilin avqustundan 1175-ci ilin iyul ayına qədər olan dövrdə yazıldığını təsdiq etməkdədir. Poemanın bəzi əlyazmalarında olan artırma misralara görə, əsər 1176-cı il sentyabr ayının 30-da tamamlanmışdır. Bu, yəqin ki, əsər yazılandan bir qədər sonra köçürülən nüsxələrdən birinin tarixidir.

"Sirlər xəzinəsi" adından da göründüyü kimi, zahirən Nizamiyə qədər Yaxın və Orta Şərq ədəbiyyatında geniş yayılan didaktik əsərlər silsiləsinə daxildir. Mövzuca, məqsədcə müəyyən dərəcədə "Kəlilə və Dimnə", "Qutadqu bilik", "Hədiqətül-həqiqə", "Siyasətnamə", "Qabusnamə", "Cəhar məqalə" və b. kimi əsərlərə yaxın olan "Sirlər xəzinəsi" həm də onlardan fərqlənir. Dahi şair sanki özünəqədərki didaktik ədəbiyyatı yekunlaşdırıb ona daha yüksək humanist, demokratik istiqamət vermişdir.

Sənai Qəznəvi artıq XII əsrin əvvəllərində "Hədiqətül-həqiqə" ("Həqiqət bağçası") poeması ilə didaktik poema janrını yeni bir yüksəkliyə qaldırmışdı. "Hədiqətül-həqiqə"dən əlavə bir sıra kiçik

poema, çoxlu qəsidə, qəzəl və rübailər müəllifi olan Sənainin yaradıcılığı farsdilli poeziyada humanist fikirlərin təsdiqi baxımından xüsusi mərhələ təşkil edir. XII əsrin bir çox şairləri, o cümlədən Əbül-Üla Gəncəvi, Xaqani Şirvani humanist poeziya sahəsində onun varisi olmaları ilə fəxr etmişlər.

Dahi Azərbaycan şairi Nizami Gəncəvinin də öz ilk poemasını Sənai Qəznəvinin "Hədiqətül-həqiqə" əsərinə nəzirə kimi yazması təsadüfi deyildir. Bu, Nizaminin, özündən əvvəlki humanist şeirin nailiyyətləri ilə hesablaşması, ona biganə qalmaması ilə izah edilməlidir. Şair sələfinin əsərinin adına uyğun ad seçməklə bərabər, onun bəzi fikirlərinə də şərik olduğunu bildirmiş, hətta bir çox hekayələrini onun hekayələri ilə mübahisə şəklində yazmışdır. "Sultan Mahmud və qarı" hekayəsi ilə "Sultan Səncər və qarı" hekayələri dediklərimizə misal ola bilər.

Bir həqiqətdir ki, Nizaminin "Sirlər xəzinəsi" məzmunu, mündəricəsi, humanizmi, aşıladığı fikirlər və sənətkarlıq baxımından Sənainin poemasından qat-qat yüksəkdə durur. "Sirlər xəzinəsi"nin özündə də bu həqiqət müəllif tərəfindən aydın şəkildə göstərilir:

Gəldi iki namə iki ölkədən,
Hər biri bir Bəhramı tərif edən.
Köhnəcə kandan o tökübdür zəri,
Tapdı təzə bəhrdə bu gövhəri.
Qəznədə qaldırdı o, yerdən ələm,
Vurdu bu Rum sikkəsinə bir rəqəm.
Olsa da ol sikkədə söz zər kimi,
Yaxşı bil ondan zərimi, sikkəmi.
Azsa da ondan yükümüz, varımız,
Yaxşıdır ondan ki, xiridarımız.[1]

Nizami özü aydın şəkildə Sənainin didaktik poema janrında dəfələrlə işlənmiş vəzn və formadan istifadə etdiyini (Sənainin əsəri xəfif behrində yazılmış, hekayələr müəyyən prinsip gözlənmədən verilmişdir) göstərməklə onun əsərini qızıla bənzədir. Başqa sözlə, Sənainin poemasının yüksək ədəbi qiymətini etiraf edir.

[1]"Sirlər xəzinəsi"ndən götirilən şeir parçalarının tərcüməsi bizimdir. Orijinalın vəznini saxlayan bu tərcümə əsərdəki fikir gərginliyini daha aydın nəzərə çarpdırır.

"Sirlər xəzinəsi"ni, sözün həqiqi mənasında, Nizaminin yaradıcılıq manifesti adlandırmaq olar. "Xəzinə" adını şair əsərə təsadüfən verməmişdir; "Sirlər xəzinəsi", doğrudan da, həyatın ayrı-ayrı sahələrini əhatə edən, cəmiyyətin müxtəlif təbəqələrinin rəngarəng surətlər silsiləsini yaradan, yeni fikirlər, ideya və qənaətlər ifadə edən bir əsərdir. Böyük şair didaktik poema janrının imkanlarından bacarıqla istifadə edib, oxucu ilə lirik monoloqlar şəklində söhbət edir, onu düşündürən, narahat edən problemlərə toxunur, bütün hallarda orta əsrlərin qatı zülməti içərisindən işığa, həqiqətə, xeyrə səsləyir.

Poema müxtəlif məsələlərə həsr edilmiş müqəddimə, 20 məqalət (söhbət) və bu məqalələri epik lövhələrlə əks etdirən 20 kiçik hekayədən ibarətdir. Kitabın tamamlanması haqqında kiçik bəhslə poemaya yekun vurulur. Başlanğıcda şair tovhid, minacat, nət adlı başlıqlar altında Allahdan, peyğəmbərdən söhbət açır, islam dini ehkamları çərçivəsində onları tərifləyir. Zamanın tələbinə uyğun hərəkət edən şair bu bəhslərin özündə belə ənənəvi dini ifadələrlə olsa da, çox ciddi ictimai problemlərə toxunur. Nizaminin sənətkar mövqeyi bu hadisələrə münasibətdə də açıq-aydın diqqəti cəlb edir; şair oxucunu həyəcanlandırır, şairin əhvali-ruhiyyəsi, ürək təlatümləri oxucuya da sirayət edir. Məlum olur ki, bütün bu təriflər, müraciətlər əsil mətləbə keçmək üçün bir bəhanədir. Zəmanəsindən son dərəcə narazı olan şair Allaha və peyğəmbərə də böyük ideallar naminə müraciət edir, qədim düzlük və doğruluq, təmizlik dövrünün, islamın ilk illərinin həyatını qaytarmağa çağırır:

Pərdəni at, təkcə özün çıx çölə,
Pərdə mən olsam da, onu məhv elə.
Çərxə öz acizliyini et bəyan,
Aç dəxi dünya düyünün durmadan.
Nəqşini poz, durma tez ol ruzgarın,
Surətini məhv elə ulduzların...
Kim ki sevir zülməti, nurdan sən et,
Kim ki sevir cövhər, ərəzdən gen get...
Zülm oduna tezcə su tök bir görək,
Torpağın altında qoy itsin külək...

Son misralar şairin həyəcanını daha aydın ifadə edir. Şeirdə dörd ünsür (od, su, torpaq, hava) ancaq zahiri poetik gözəllik xatirinə yox,

böyük fikirlərin obrazlı ifadəsi üçün xatırlanır. Zülm və ədalətsizlik alovları üzərinə su tökülsün, ədalət bərpa edilsin, mənəm-mənəmlik, qürrə, başqa sözlə, özbaşınalıq, haqsızlıq yeli torpağa gömülüb yox olsun - deyən şairi narahat edən onun zəmanəsi, insanların taleyidir. Eyni həyəcanlı, narahat çağırış peyğəmbərə müraciət hissəsində də özünü aydın göstərir.

Poemanın müqəddiməsində şeir və sənət məsələlərinə də xüsusi diqqət yetirən şair sözün meydana çıxması, insan həyatında rolu, onun qiyməti və s. haqqında söhbət açır. Sözü xilqətin birinci gözəli adlandıran Nizami doğru göstərir ki, qələm hərəkətə başlayan zamandan dünyanın gözünü sözlə açıbdır. Söz insanın canı, bədən isə onun mənzilidir. Bayraqlar söz qədər qələbə çala bilməz, söz hər şeydən qiymətlidir:

Kimsə alıb söz və zəri bir sabah
Sərrafa göstərdi, dedi: - Ey qoçaq,
Köhnə qızıl, ya təzə söz yaxşıdır?
Söylədi usta: - Təzə söz yaxşıdır.
Qasid olub söz haraya getmədi?
Söz kimi kimsə bir işi etmədi.

Göründüyu kimi, Nizami sözə geniş mənada yanaşır, dilin, bədii sözün, nitqin, yazının bəşəriyyətin inkişaf tarixindəki misilsiz rolundan, onun müasir həyatda əhəmiyyətindən danışıb, sözü insanın canı və özü hesab edir. Nizami ümumiyyətlə sözdən danışdıqdan sonra şeir haqqında söhbət açır, ərşin ötən bülbülü saydığı şairin zəhmətinə yüksək qiymət verir, onu peyğəmbərlərə yaxın tutur. Şair və şeir qarşısında ciddi ictimai vəzifələr qoyan Nizaminin fikrincə, şeir insanları tərbiyə etmək vasitəsidir.

Kim ki sözə verdi sığal, sahmanı,
Sözlə bişirdi çiy olan insanı.

Nizami şeirin asan yazılmadığını, dərin düşüncələr, yaradıcılıq iztirabları nəticəsində yarandığını qeyd edir. Onun yaratdığı hər söz canın bir parçasıdır, qəlbin dişi ilə yonulmuş heykəldir; o, yeni söz üçün axtarışa başlayanda gah ölür, gah dirilir. Şair yaradıcılıq prosesinə çox ciddi bir iş kimi yanaşır, onun ağırlığından danışır.

Mədən açıb tapmaq üçün bir göhər,
Yeddi göyə fikri salar rəxnələr.
Yaxşı sözü övladına tay tutar,
Səy edib ilham ataya oxşadar.
Xoş nəfəsi canlara dinclik verər,
Hər sözü dillərdə gəzər sərbəsər.
Nəqqaşısa kim bu gözəl dilbərin,
Bil ki, o, şairdir, oxu sözlərin.

Əsil sənətkar, həqiqi şair haqqında Nizaminin qənaəti belədir. Dahi şair sözü hörmətdən salan alçaq adamlara, var-dövlət və şöhrət xatirinə ona-buna mədhiyyə yazanlara da biganə qalmır, onları nifrətlə xatırlayır. Nizami dünya İntibahının ən qüdrətli şairlərindən biri kimi poeziya sənətinə onun insana, həyat həqiqətinə xidməti baxımından qiymət verir. Şairin fikrincə, hər şeir qaralayanı, qafiyə qoşanları şair adlandırmaq olmaz:

Çoxlu çaparlar bu yolu getdilər,
Alçaq olanlar onu xar etdilər.
Diddi bu söz, parçaladı bağrımı,
Söz bəzəyən tökdü sözün abrım.
Candır ürək meyvəsinin qiyməti,
Onlar üçün yox su qədər hörməti.
Tapdı əlindən necə ey çərx, aman,
Yaltaq olub şerə düyünlər salan...

Qızıl üçün saralıb-solan, qızılla sözü qiymətdən salan, sözləlini qiyməti olmayan daş-qaşa dəyişən bu şaircikləri Nizami alçaq adlandırır. Zahirən, saraylarda yüksək mövqe tutan bu adamların özlərini alçaltdığını Nizami həm nifrət və qəzəb, həm də ürəkağrısı ilə qeyd edir. O, saray şairi vəzifəsinin aqibətindən söz açır, saraylarda bir müddət zərli don geyənlərin axırda qurğuşun yediyini, civə kimi zərdən ötrü ölənlərin axırda Sultan Səncərin dəmiri ilə məhv olduqlarını xatırladır. Nizami şeiri ucuz tutmağı rəva görmür, şairdən ağır zəhmət, böyük iradə tələb edir.

Xalq və hökmdar problemi Nizami poeziyasının, o cümlədən "Sirlər xəzinəsi"nin əsasını təşkil edir. Çox vaxt bu problemi ədalətli

hökmdar ideyası şəklində ifadə edirlər. Guya Nizaminin məqsədi ədalətli hökmdar surəti yaratmaq imiş ki, şair sonrakı əsərlərində buna çalışmış, lakin arzuladığı ideal hökmdar surətini İskəndərin simasında, son əsərində yarada bilmişdir. Nizami yaradıcılığında xalq və hökmdar probleminin həllinə, inikasına bu cür yanaşmaq birtərəfli və yanlışdır. Nizaminin məqsədi ideal şah obrazı yaratmaq olsaydı, ilk əsərindən başlayaraq son əsərinəcən istənilən qədər ədalətli şah surətləri yarada bilər, onlarda heç bir nöqsan da görməzdi.

Nizami dühasının böyüklüyü ondadır ki, mütəfəkkir şair xalqla hökmdar, fərdlə cəmiyyət arasındakı münasibətləri və bu münasibətlərin kölgəli cəhətlərini qorxmadan, cəsarətlə açıb göstərə bilmiş, onların səhvlərini, cinayətlərini üzlərinə deməkdən çəkinməmiş, ibrətləndirmək, qorxutmaq, öyrətmək, xəbərdarlıq etmək yolu ilə onları ədalətə, insanlığa, sülhə istiqamətləndirmişdir. Əsərlərində şahların ədalətini təsvir etmək Nizami üçün az əhəmiyyətlidir, dövrün hökmdarlarını isə xəcalətləndirmək, utandırmaq, həvəsləndirmək, ağıllandırmaq yolu ilə ədalətə yönəltmək, onların ədalətli olmasına nail olmaq şairin zəngin ədəbi irsinin əsas qayələrindən birini təşkil edir.

"Sirlər xəzinəsi" əsərindəki bir çox məqalət və hekayələrini də şair onu çox narahat edən, düşündürən problemə həsr etmişdir. "İnsanın mərtəbəsi haqqında" birinci məqaləti, "Ədalət və insafı gözləmək haqqında" ikinci məqaləti, "Padşahın rəiyyətə qayğı göstərməsi haqqında" üçüncü məqaləti, hekayələrdən "Özündən naümid olub bağışlanan padşahın hekayəsi", "Nuşirəvan və bayquşların söhbəti", "Sultan Səncər və qarı", "Zalım padşahla zahidin dastanı", "Bir şahzadənin hekayəsi" və başqalarını xatırlamaq kifayətdir. Həmin hekayə və məqalətlərdə hamını düşündürən aktual bir məsələ - hökmdarın xalqla rəftarı məsələsi qoyulub həll edilir. Dahi şair dövrünün zalım hökmdarlarını gah axirətlə qorxudur, gah zülmün bu dünyada onlara zərər, ziyan yetirəcəyini xatırladır, onları xalqın qəzəbi ilə hədələyir.

Aləmi kim fəth eləyər zülm ilə.
Mülkü ədalətlə alarlar ələ.
Məmləkət ədlilə olar payidar,
İşlərin əql ilə olar bərqərar.

Dövrün hökmdarlarının cılızlığını, bir heç olduğunu Nizami müxtəlif boyalarla poemasının bir çox yerlərində nəzərə çarpdırır. Dəhşətlisi odur ki, qız kimi özünə sığal verib əyləncələrlə gün keçirən bu adamlar xalqı olmazın müsibətlərə düçar edir, nahaq qanlar tökür, kəndləri, şəhərləri xarabalığa çevirir, ölkənin abadlığı, xalqın rifahı qeydinə qalmırlar. Bunları gördükcə, düşündükcə şairin qəzəbi tüğyan edir, söz qılıncını çəkib bu qorxunc düşmənə qarşı hücuma keçir.

Zülm eləmək yaxşı deyil heç zaman,
Tökmə nahaq qan, gedər abrın-həyan.
Hümməti xalqın pis olar, qorx aman,
Məzlum ahından çəkin, ey hökmran.
Hümmət o yerdən ki, salar bir nəzər,
Baxma həqarətlə, əsər göstərər.
Bir neçə hümmətli kişi, sal yada,
Neylədi hümmətlə böyük Mahmuda...
Eylə zülm xəncərini sən kənar,
Oxlarına olmayasan ta düçar.
Şahlıq üçün şərtdir ədalət fəqət,
Aləmə zülm oldu, yetər, bir sənət.

Dahi Nizaminin zalım hökmdarlara qarşı bu qəzəbli hayqırtısı, hədələyici nərəsi onun xalqın oğlu olduğunu, xalqın dərdini öz dərdi kimi yaşadığını bütün aydınlığı ilə sübut etməkdədir. Bu, xalq qəzəbi və narazılığının ən parlaq poetik inikası idi. Dövrün əli qılınclı ağaları haqqında bu şəkildə cəsarətlə danışmaq həm də zamanın, ictimai-siyasi həyatda baş verən böyük irəliləyişin, xalq şüurunun oyanmasının nəticəsi idi.

"Nuşirəvan və bayquşların söhbəti" hekayəsi romantik planda işlənsə də, real həyatın eybəcərliklərini çox doğru əks etdirir. Əsərin qəhrəmanı olan Nuşirəvan islamdan xeyli əvvəl yaşamış Sasani hökmdarıdır. Lakin burada təsvir edilən həyat Nizami dövrünün həyatıdır. Nuşirəvanın ov zamanı qarşılaşdığı mənzərə XII əsrin mənzərəsi, Nizaminin gördüyü, yandığı faciənin təsviridir. Şair ədalətsizliyin, qətl və qarətin həddini aşdığını göstərmək üçün maraqlı bir üsul işlətmişdir; həmişə xarabalıq sevən bayquşlar şahı yaxşı tanıyırlar. Onlar əmindirlər ki, əgər şahları budursa, az bir vaxta min-min kənd xarabaya çevriləcəkdir. Quş dili bilən vəzirin köməyi ilə bayquşların söhbətini dinləyən Nuşirəvan xəcalət çəkir, əməllərini yadına salıb peşman olur.

Burda Nizami Nuşirəvanın daxili monoloqunu verir. Bu düşüncə-monoloq hekayənin ən güclü hissəsidir. Şahın bütün bəd əməlləri öz dili ilə sadalanır, xəcil, peşman olduğu onun öz dilindən söylənir:

Barmağını dişlədi şah: Zülmə bax.
Quşlara çatmış sitəmimdən soraq.
Gör necə zülm eylədim insanlara,
Bayquş oturtdum evə, eyvanlara.
Özgə malın zülm ilə aldım, yetər,
Qaldım ölümdən nə qədər bixəbər.
Oldu bu gün zülm tamaşa mənə,
Vay ola məhşər günü rüsva mənə.
Bəli, qiyamətdə tamam bunları,
Hey soracaqlar tökülən qanları.
Ah! Nə qədər yetdi məlamət mənə,
Bəsdir ömürlük bu xəcalət mənə.
Söylə, bu vardan ki bilinmir sayı,
Sam nə götürdü, ya Süleyman nəyi?

Şahın dili ilə deyilən bu sözlər Nizami əsrinin ədalətsiz şahları üçün ciddi ittiham idi. Bu ittiham canilərin yaşamağa haqqı olmadığını, onları məhv etmək, etdikləri günahların, qarət elədikləri malların, tökdükləri qanların hesabını bir-bir soruşub cəzalarını vermək lazım olduğunu göstərir. Bu hissədə güclü bir inkar da var. Lakin Nizami romantik sənətkar kimi qəhrəmanı dəyişdirir; Nuşirəvan ədalətli işlər görməyə başlayır, tarixdə Adil Nuşirəvan adı ilə tanınır. Bu, şairin arzusu idi. O istəyirdi ki, dövrünün zalım hakimləri Nuşirəvan kimi hərəkət etsinlər. Ancaq bunlar söz idi. Nizami də hiss edirdi ki, sözlərə əhəmiyyət verən azdır. Bununla belə, şair sənətin təsir gücünə inanır, söz, sənət vasitəsilə əməl, iş tələb edirdi. "Bəhanə gətirmə, bunlar sözdür, səndən isə iş tələb olunur. Əgər işlər sözlə düzəlsəydi, Nizaminin işləri göylərə ucalardı". Bu etirafda, bu inamda müdrik, mübariz, narahat bir qəlbin ağrıları gizlənmişdir. Şahın darğası sərxoş halda gələrək kimsəsiz qarını təhqir edir, filan gecəyarısı filanı filan küçədə kim öldürüb deyə sorğu-suala tutur, canini onun evində axtarır. Qarı bu cinayətin necə, nə üçün baş verdiyini dəqiq başa düşür. Əgər şahın darğası sərxoş olarsa, canilər qan tökəcəklər. Camaat təhqir olunacaq, şahın ədaləti yox olacaqdır.

Dəxlini mülkün talayır oğrular,
Dul qarılardan çəkilir sorğular.

Şahın üzünə, hərəkətlərinə diqqətlə baxan qarı onu yaxşıca öyrənir, hökmdarın bu zülmdə iştirak etdiyini, özbaşınalıq və cinayətlərə şərait yaratdığını başa düşür. Bu yerdən hekayənin ikinci hissəsi başlayır. Əgər birinci hissədə qarı şikayətçidirsə, ikinci hissədə bir ittihamçı - xalq ittihamçısıdır. Qarı onu şahlığa layiq olmayan qul, qarətçi, utanmaz, hünərsiz, oğru adlandırır. Qarının bu sözləri ildırımtək çaxır, alov kimi saçılır. Hekayənin axırında Nizami lirik ricətə keçir, əsərdə təsvir edilən hadisələri öz dövrü ilə əlaqələndirərək yazır:

İndi ədalətdən, aman, yox soraq,
Qaçmış o, Simürğə aparmış pənah.
Mavi bu çardaqda abır yox daha,
Əsla bu torpaqda görünmür həya.
Qalx, Nizami, yaş axıt sən yenə,
Qan yaşı səp qanlar olan qəlbinə.

Böyük sənətkarın xalqın halına nə qədər ürəkdən yandığını, elin faciəsinə necə acı göz yaşları tökdüyünü, sadə adamların dərdindən ayrı bir dərd-qəmi olmadığını göstərən və şərhə, izaha ehtiyacı olmayan bu alovlu, həm də fəryad dolu misraları Yaxın və Orta Şərq İntibahında humanizm ideyalarının ən yüksək, misilsiz bir ifadəsi kimi qiymətləndirsək, səhv etmərik.

Dərin ifşaedici məzmunu etibarilə "Zalım padşahla zahidin dastanı" və "Sultan Səncər və qarı" hekayələri bir-birinə çox yaxındır. Əgər "Sultan Səncər və qarı"da şah məmurlarının cinayətləri və şahın bu cinayətlərə laqeydliyi əks olunmuşsa, "Zalım padşahla zahidin dastanı"nda feodal gerçəkliyinin başqa bir kölgəli cəhəti açılıb göstərilmişdir. Sultan Səncər şikayətləri eşitmir, əhəmiyyət vermir, cinayətkarları cəzalandırmır, onlara şərait yaradırsa, bu hekayədə təsvir edilən zalım padşah daha qəddardır. O, hər tərəfi casuslarla doldurmuşdur, haqq deyən dilləri kəsdirir, şahın zülmündən şikayət eləyənləri məhv etdirir. Onun ölkəsində şahın əleyhinə danışmaq ən qorxulu cinayət sayılır. Bu isə Nizami dövrünün mənzərəsidir. Ona görə də Y.E.Bertels bu hekayəni "Sirlər xəzinəsi"nin açarı və poemanın

ən yaxşı hekayəsi adlandırır. Doğrudan da, Nizami "Sirlər xəzinəsi" ilə zəmanəsinin eybəcərliklərinə güzgü tutmuş, hər şeyi olduğu kimi göstərən bir poeziya aynası yaratmışdır.

"Zalım padşahla zahidin dastanı"nda, adından göründüyü kimi, iki əsas surət vardır: zalım padşah və doğruçu qoca. Zalım padşah ordusuna, xəzinəsinə, casuslarına güvənir, doğruçu qoca isə düzlüyə. Zalım padşah hamını qanla qorxudub susdurmaq, özünə tabe etmək, qul vəziyyətinə salmaq istəyir. Doğruçu qoca isə düzlüyündən dönmür, zalımın inadını sındırır, onu özünə təslim edir. Düzlüyün qarşısında cəlladın qılıncı əlindən düşür, qəzəbdən bozarmış üzü gülümsünməyə məcbur olur. Doğrudur, bu bir romantikadır, lakin onda güclü, inkar-edilməz bir həyat həqiqəti var. Düzlük eybəcərliyin, zalımlığın, qəddarlığın üzünə güzgü tutub onu özünə baxmağa, utanmağa, öz-özünü inkara məcbur edir. Zalım zalımlığını danır, haqqında zalım deyən qocanı qətlə yetirməyə hazırlaşdığı halda fikrini dəyişir, onu ifşa və inkar edən, heçliyini qorxmadan üzünə deyən gücsüz, zəif, onsuz da öldürüləcəyini düşünüb şahın yanına kəfən geyinib gələn, cəsarətli, ifşaedici sözlərindən dönməyən doğruçu qocaya cəza verə bilmir, əksinə, onu mükafatlandırır. Düzlük əyriliyə, ədalət zalımlığa, İntibah orta əsrlərə qalib gəlir. Əyrilər çox olduğu kimi düzlər də çoxdur. Zalım padşahın casusu varsa, doğruçu qocanın da sevənləri, çətinə düşəndə köməyinə gələnləri, gözlənilən təhlükəni xəbər verənləri var. Şərin casusluq edən nökərləri varsa, xeyrin də müjdə gətirənləri var. Nizami bu iki cəbhəni, qüvvələrin tənasübünü doğru görür və əks etdirir.

Nizami poeziyasında ictimai siniflərin, hakim təbəqələrlə xalqın bu şəkildə qarşı-qarşıya qoyulması, xalqın böyük gücünə inam, hökmdar və xalq probleminin tamamilə demokratik baxımdan düzgün həlli Yaxın və Orta Şərq İntibahının ən böyük nailiyyətlərindən biri idi.

Nizami bununla da kifayətlənmir, yeniliyin köhnəliklə mübarizəsi, köhnəliyə qarşı amansız döyüşkən mövqe tutması fikrini irəli sürür. O, əsrlərin dumanı arxasından gələcəyə baxaraq, yeni ideyaların qələbəsi üçün yollar göstərir. Bu məsələdə ona əxiliyin mübariz humanist baxışları istiqamət verir. Xalq içərisində böyüyüb yaşayıb müdrikləşən, şəhər sənətkarları ilə daim təmasda olan, qəlbi xalqın azadlığı və xoşbəxtliyi üçün döyünən, qələmi ilə "kiçik" adamların hüququnu müdafiəyə qalxan qüdrətli sənətkarı XII əsrin ən xəlqi fikir cərəyanlarından

olan, ayrıca birlik formasına çevrilən əxilikdən kənarda təsəvvür etmək olarmı? Ona görə də şairin poemasındakı bir çox fikirlər əxiləri şəhər sənətkarlarının bu mübariz birliyini yada salır. Nizami yeniliyin köhnəliklə mübarizəsindən danışanda əxilər kimi düşünərək köhnə əqidələri, köhnə budaqları cəsarətlə doğrayıb tökməyi məsləhət bilir. Fəallığa, hərəkətə üstünlük verir.

Nizami dünyanın zənginliyi, daimi inkişafı, get-gedə daha da gözəlləşməsi haqqında son dərəcə heyranlıqla danışır. Şairə görə, həyat daim irəliyə doğru inkişafdan ibarətdir; fikirlərdə, baxışlarda daim bir hərəkət və irəliləyiş vardır.

Gündə bu bağdan yeni bir bar gələr,
Hər şirinindən də şirin meyvələr.
Çoxlu həmaildir ürəklər tamam,
Hər biri xoşdur o birindən müdam.
Həm bu yolun yolçuları bax ki sən,
Zirək olur dəstə ötən dəstədən.

Bu irəliləyiş və inkişaf zamanı köhnəliklə yenilik qarşı-qarşıya gəlir. Köhnəlik öz yerini asanlıqla güzəştə getmir, yeniliksə onunla vuruşmaq, ona qalib gəlməklə özünü təsdiq edə bilər. Dahi şair əxilər kimi mübariz, döyüşən bir mövqedə duraraq köhnəliyi rədd edir.

Nizaminin yeniliklə köhnəliyin qarşılıqlı münasibəti haqqındakı fikirlərini "Bir şahzadənin hekayəsi" yekunlaşdırır. Hekayədə göstərilir ki, Mərvdə yaşayan gənc bir şahzadə ölkəni yeni qayda ilə idarə etmək istərkən ətrafındakı mühafizəkar, dövlətli adamların ciddi müqavimətinə rast gəlir, ölkə ona asi olur. Köhnələr təzəyə qarşı üsyan edib onu ölümlə hədələyirlər. Ümidini itirən, bədbinləşən gənc şahzadə fikirli-fikirli yuxuya gedir. Yuxusunda bir qoca ona bu vəziyyətdən qurtulmağın yolunu öyrədərək deyir:

Ey təzə ay, köhnə olan bürcü sök,
Ey təzə gül, köbnə budaqları tök.
Ölkə səninlə ola ta bərqərar,
Şadlıq elə, sən də yaşa bəxtiyar.

Deməli, yeniliyin qələbəsini təmin etmək üçün onun qarşısını alan maneələr aradan götürülməli, məhv edilməlidir. Nizaminin yenilik

tərəfdarı olan şahzadə qəhrəmanı da məhz belə edir. Yuxudan oyanan kimi iki-üç düşməni aradan götürür, köhnə qayda-qanunu pozaraq yeni qayda-qanun yaradır, ölkə yeniləşir, abadlaşır. Bu, Nizami dövrü üçün son dərəcə cəsarətli bir ideya idi. Qəhrəmanın qəti hərəkəti ilə razı olan şair hekayəyə əlavə etdiyi lirik ricətdə bu ideyanı daha da dərinləşdirir, qətiyyət və inamla belə yazır:

Ölməlidir mülkə pozuqluq salan,
Qovmalıdır olsa qoşun bədgüman,
Qol-budaq atmaz təzə şax, bil ki, sən.
Köhnə budaqları əgər kəsməsən.
Kəsməsən arxın önünü aşikar,
Göylərə qaldırmaz əli göy çinar.
Sən bulağın gözlərini açmasan,
Gözdən axıtmaz su bu yer heç zaman.

Şairin qənaəti budur ki, köhnəlik özbaşına təslim olmaz, onu güc,lə, silah yolu ilə təslim etmək lazımdır.

"Ovçu, it və tülkü" hekayəsində biz inamlı bir şəxsin təntənəsi ilə qarşılaşırıq. Ovçunun sədaqətli, qoçaq iti birdən yoxa çıxır. Ovçu çox kədərlənir, lakin canını dişinə tutub gözləyir, inamını itirmir, gücündən artıq bir səbrlə dözür. Bir tülkü gəlib ovçuya istehza edir, itinə qarşı vəfasız olduğuna, ondan ötrü qəm çəkmədiyinə görə ona tənə edir. Ovçu tülküyə inamla belə cavab verir:

- Hamilədir zil gecə,
Bir gün olar qəm keçəcək gör necə,
Mən bu dar ovlaqda onunçün şadam,
Şadlıq ilə qəm qala bilməz müdam...
Qaçdısa bir dəm itim, ey hiyləgər,
Sən kimi bir ovla geri tez dönər.

Ovçu bu sözləri deyib qurtarmamış toz dumanı qalxır, it duman içindən çıxıb tülkünü tutur. Ən ümidsiz halda belə inam insanı mükafatlandırır. Dahi şair bu dərin fəlsəfi məzmunlu hekayəni inam haqqında himnlə bitirir:

Kimdə inam olsa iradətlə yar,
Daim olar sonda səadətlə yar.
Getsə inamla ayaq olmazmı baş?!
Böylə fikirlə zərə dönməzmi daş?!
Olsa inamla qədəmin üstüvar,
Daima oddan su, sudan od çıxar.
Başqa olurlar inam əhli tamam,
Bizlər ayaq, oldu baş onlar müdam.

Əməyə və əmək adamına dərin məhəbbət Nizami yaradıcılığını səciyyələndirən əsas keyfiyyətlərdəndir. Şair başqa əsərlərində olduğu kimi "Sirlər xəzinəsi"ndə də bu mövzuya xüsusi diqqət yetirir, əməyi insanın zinəti, yaraşığı, onu hər cür bəlalardan qoruyan bir vasitə sayır. Nizami belə hesab edir ki, hər bir adam işləməli, zəhməti ilə dolanmalıdır. İstər məqalətlərdə, istərsə də ayrı-ayrı hekayələrdə onun insanı işləməyə çağıran hərarətli çağırışlarını eşidirik.

Ey əxi, nəfs itdir, onu çək dara,
Ruzi üçün açma əl alçaqlara.
Dadına paxıl rizqini, ye torpağı,
Torpaq olub, olma rəzil tapdağı.
Qoy əlinə, qəlbinə batsın tikan,
İşlə, çalış durma bekar bircə an.

"Süleyman və əkinçi", "Kərpickəsən qocanın dastanı" hekayələrində Nizami öz fədakar zəhməti ilə ruzi qazanan, zəhmət çəkməyi özünə borc bilən sadə adamların heyranedici surətini yaradır. Nizami əmək adamlarından həmişə dərin məhəbbət, yüksək hörmət hiss ilə danışır, onları hər cəhətdən başqa adamlara, xüsusən əməyə xor baxan tüfeyli hakim təbəqəyə qarşı qoyur. Quru bir çöldə dırnağını bel, alın tərini su edib məhsul becərən əkinçini görən Süleyman peyğəmbər onun zəhmətini mənasız sayır, qocanı toxumu zay etməməyə çağırır. Lakin əkinçi öz ağıllı cavabı, sonsuz inamı, insanın həyatda vəzifəsi haqqında sağlam təsəvvürü ilə müdrik peyğəmbər Süleymanı utandırır. Otdan-ələfdən özünə paltar toxuyub, kərpic kəsməklə əldə elədiyi qazancla dolanan qoca bir kişi qızğın işlədiyi vaxt yanına tüfeyli bir gənc gəlir. Nizaminin təsvirindən görünür ki, bu gənc varlı təbə-

qəyə mənsubdur. O, qocaya məsləhət görür ki, yaşı ötmüşdür, daha işləməsin, heç kəs ondan bir parça çörək əsirgəməz. Qoca ağıllı, mərdanə cavabı ilə həmin avara gənci utandırır, onu öz nadanlığı, tüfeyliliyi üçün göz yaşı tökməyə məcbur edir. Qocanın sözlərində sağlam, ayıq bir həyat fəlsəfəsi gülümsəyir, hər kəsi öz həyatına nəzər salmağa, kim olduğunu anlamağa yönəldir. Nizami əsərlərində əmək və əmək adamlarına belə sağlam münasibət şairin yaradıcılığındakı demokratizmin, humanizmin ən parlaq ifadəsidir.

İsa peyğəmbərlə əlaqədar verdiyi bir hekayədə Nizami müdrik bir insanın surətini yaradır. Bazarın başında bir dəstə adam qarğa-quzğun kimi bir it cəmdəyini dövrəyə alıb, onun üfunət, xəstəlik mənbəyi olmağından danışır, dodaq büzürlər. Növbə İsa peyğəmbərə çatanda, o söyləyir ki, heç inci də bu itin dişləri qədər ağ ola bilməz. Bu sözlər hər kəsi heyran edir, hamı başını aşağı dikib gedir, çünki düşündüklərinə, danışdıqlarına görə xəcalət çəkirlər.

Nizami özü xarakteri etibarilə həmişə, hər yerdə hünər və gözəllik axtarmış, tovuz quşunun əlvan rənginə baxmış, heç kəsdə eyib axtarmamışdır. Dahi şairin misilsiz poeziyası, hekayədə olduğu kimi, orta əsrlər cəmiyyətinin eybəcərliklərini göstərməklə bərabər, onun işıqlı və təqdirəlayiq cəhətlərini də görmüş və əks etdirmişdir.

Nizami yaradıcılığının böyük idraki əhəmiyyəti də məhz bunda, həyatı ziddiyyətli şəkildə göstərməsindədir. Şair "Sirlər xəzinəsi"ndə dövrün geniş bədii mənzərəsini yaratmış, ən müxtəlif məsələlərdən danışmış, müxtəlif təbəqələrin həyatından söhbət açmışdır. Əfsanəvi, tarixi şəxsiyyətlərdən tutmuş müasir dövrün adi adamlarına qədər hamı burada əks olunmuşdur. Peyğəmbərlər, şahlar, xəlifələr, ruhanilər, kəndlilər, kərpickəsənlər, əlsiz-ayaqsız qarılar, avara, tüfeyli şəhər gəncləri, yeniyetmə uşaqlar, darğalar, oğrular, zəvvarlar, saray əyanları, yəhudi, atəşpərəst, müsəlman, xristianlar, saray xidmətçiləri, sufilər, varlı şəhərlilər - Nizami poemasındakı adamların ümumi və qısa siyahısı belədir. Ancaq dahi şair ilk poemasında bununla da kifayətlənmir. Adəmdən başlamış müasirlərinə qədər insanlığı bütün keçmişi, bu günü və sabahı ilə əks etdirməyə çalışan şair insanı yaşadığı təbiətdən, canlı və cansız aləmdən təcrid olunmuş şəkildə deyil, onunla birlikdə təsvir edir. Şair nədən danışırsa danışsın, onu müasir həyat, müasir insanlar düşündürür, haqsızlıq, ədalətsizlik, zülm və özbaşınalıq hökm sürən bu dövrünsə adamları əsasən məhdud görüşlü,

tamah, şöhrət və şəhvət əsiri olan insanlardır. Nizamini daha çox kədərləndirən də odur ki, məhz beləlləri başqalarına ağalıq eləyir, özlərini yüksək tuturlar.

Aləmə bax, başçıları kimdilər,
Adlıların adlıları kimdilər.

"Sirlər xəzinəsi" zəngin və mürəkkəb məzmunlu, yüksək sənətkarlıqla yazılmış bir əsərdir. Azərbaycan İntibahının qiymətli bir abidəsi kimi bu əsərin əhəmiyyəti ondadır ki, insanlığın nurlu sabahına, sadə adamlara məhəbbətlə doludur.

Nizaminin "Sirlər xəzinəsi" əsərinin bir neçə tərcüməsi mövcuddur. Həmin tərcümələrin hər birində uğurlu cəhətlərlə yanaşı nöqsanlar da var. Biz bu nəşr üçün Xəlil Rza Ulutürkün tərcüməsini daha məqsədəuyğun saydıq. Poema Xəlil Rzanın yazdığı şərhlərlə birlikdə oxuculara təqdim olunur.

***Xəlil Yusifli***

## BAŞLANĞIC

Bismillahir-rəhmanir-rəhim.
Hikmət xəzinəsinə budur açar, ey həkim!

Odur fikrin əvvəli, odur kəlamın sonu,
Nə iş görsən, Tanrının adıyla qurtar onu.

Gəlib hamıdan əvvəl, hər bir varlıqdan qabaq,
Yaşayanlar içində əbədi odur ancaq.

Qədim, sonsuz cahanı odur quran, saxlayan,
Qələmlərin boynuna boyunbağı bağlayan.

Səxavət qaynağını o qaynatdı binadan,
5 Bütün var olanları yalnız odur yaradan.

Pərdəli fələklərin pərdəsini açandır,
Pərdəli iş görənin sirrini saxlayandır.

Günəşin kəmərinə ləl ilə zinət verən,
Torpağa həyat donu, suya təravət verən.

Könül sahiblərinə əxlaq, hikmət göndərən,
Ruzu uman kəslərə ruzu, nemət göndərən.

İdrakın hər telinə düzüb inci, mirvari,
Düşüncənin gözünə işıq gətirən Tanrı.

Uca, pak alınlara səcdə nişanı vurar,
10 Cahanın şahlarına qızıldan tac qoydurar.

Tədbirlə bişənləri çiy bilib, verər bada,
Suçluların üzrünü qəbul eylər dünyada.

Məhşər günü qoruyar, hifz eləyər qorxağı,
Alimlərin könlündə olar tədbir qaynağı.

Hər sifəti, vücudu əzəli və əbədi,
Kainatın varlığı, yoxluğu əlindədi.

Heçdir bu iki cahan ülviyyəti önündə,
Bir nəfəsdir ömrümüz əzəməti önündə.

Tapılarmı cahanda onunla bəhs eləyən?
15 Varmı ondan savayı "Bu mülk mənimdir!" deyən?

O vardı, hələ yoxkən yer, göy, ucalıq, alçaq,
Varlıq yoxa çıxsa da, o, daim var olacaq.

Çox gəzdi, çox düşündü peyğəmbərlər, alimlər,
Tanrı vuran düyünü aça bildilər məgər?

Onun elmi əzəldən dəryadır, necə dərya!
Onun əbədiyyəti səhradır, necə səhra!

Əvvəli ibtidasız, axırı intəhasız,
İlki, sonu olmayan onun özüdür yalnız.

Sənin vücudundakı cənnətə huri verdi,
20 O nərgiz gözlərinə mərifət nuru verdi.

Dirilərin, sağların bütün kəşməkəşləri,
Yalnız Tanrıya təslim, Tanrı görür işləri.

Cahanda ondan savay hər şey gəldi-gedəri,
Yalnız odur əbədi, müqəddəsdir cövhəri.

Yerin kəməri dağlar, gültac qoyan torpaqlar,
Yalnız ona minnətdar, yalnız onu soraqlar.

Kərəmi nur dalında gizlənmişkən bir zaman,
Uzaqdı gül tikandan, şəkər isə qamışdan.

Elə ki, səxasıyla kəramət abad oldu,
25 Yoxluğun buxovundan bu varlıq azad oldu.

İki-üç viran kəndin solmuş Ayı, ülkəri,
Necə əngələ salmış əylənən fələkləri.

Düyün açılmayınca qaralırdı hələ də,
Gecənin zülmət saçı gündüzlərin əlində.

Göydə min-min gövhəri sapa düzdü Yaradan,
Sildi yoxluq tozunu gecənin saçlarından.

Tulladı səmalara bu iki-üç çəmbəri,
Yeddi düyün vurmaqla qandalladı yerləri.

Günə, Aya don biçdi öz əlilə Yaradan,
30 Birinə ağ ipəkdən, o birinə qaradan.

Səfra buludlarını dənizlərdən çıxartdı,
Çəmənlərdə Xızr üçün abi-zəmzəm yaratdı.

Gecə rəngli torpağa verdi gündüz badəsi,
Tökdü daşın ağzına neçə şəfəq qətrəsi.

Birləşdirib, yoğurdu, qaynatdı suyla odu,
Necə də xəlq elədi dürrü, bir də yaqutu.

Ləlin ciyərlərinə nəyi verdi, bax, tanı:
Torpağın ürəyindən qızıl-qırmızı qanı!

Səxavət bağçasına təzə bir nəfəs qatdı,
35 Söz quşunun səsini fələyədək ucaltdı!

O, nitqin bağçasına xurma verdi - ətirli,
O, qulaq sədəfinə söz gövhəri gətirdi.

Qovdu şirin yuxunu göz pərdəsi dalına,
Can köynəyi geydirdi bədənin zülalına.

Atdı yerin saçını qucağına aləmin,
Vurdu üsyan damğası yanağına Adəmin.

Yudu zərin üzündən alçaqlığın izini,
Bahar buludlarıyla qanlı gülün heyzini.

Ulduzlarla sildi o, göydən hisi, dumanı,
40 Reyhanlara tapşırdı əsib keçən səbanı.

Bu torpağın qanını göstərdi bir gül ilə,
Əqlin nəbzini tutdu ürəyin öz əlilə.

Qəmi dağıtsın deyə sevincə gülüş qatdı,
Zöhrəni göylər üçün şən çalğıçı yaratdı.

Gecə dönüb onunçün müşk, ənbər satana,
Qulağında halqası, qul olmuş hilal ona.

Sözün əli uzundur, dartındı yaman-yaxşı,
Tanrı dərgahındakı daşla yarıldı başı.

Çox gəzdi, çox dolaşdı ayaqyalın xəyallar,
45 Qapısından əliboş qayıtdı nalan, naçar.

Çox vurnuxdu düşüncə, anlamadı sirrini,
Göz axtarıb tapmadı Tanrının bənzərini.

Ağıl dedi: - Aradım, ədəbsiz addım atdım,
Ədəb onun özüymüş, yenə ona qayıtdım.

Seyr elə pərgarının ucundan düşənləri,
Axtarır bizim kimi, onu gəzir hər biri.

Sidrdə əyləşənlər ona sarı can atar,
Onun darvazasını döyür ərşə çıxanlar.

Zəncirilə bağlanıb fələklərin biləyi,
50 Onun şövqüylə çarpır yerin, göyün ürəyi.

Ürək canın önündə paklığıyla öyünər,
Ancaq onun yanında «adi torpağam» deyər.

Bu dünya nemətləri önündə bircə danə,
Güllərinin yanında İrəm bağı - əfsanə.

Nizaminin torpağı güc-quvvət almış ondan,
Xırdaca bir danədir Tanrının dərgahından.

## TOVHİD VƏ MÜNACAT

(*Tanrının birliyi haqqında və Ona yalvarış duası)*

Ey bütün varlıqlara bu dünyada can verən,
Gücsuz torpağa belə qanad verən, qan verən!

Bayrağının altında əyləşib bütün cahan,
55 Sən özündən doğuldun, biz sənin cəlalından.

Varlığında görünmür nə surət, nə də tərkib,
Heç kimə bənzəməzsən, de kim sənə bənzəyib?

Dönməz, dəyişməz varlıq tapılarsa o, sənsən,
Ölməyib, ölməyəcək qüdrət varsa, o, sənsən.

Sən - yaşarı və sonsuz, bizsə - gəldi-gedəri,
Hökmündədir kainat, yerin, göyün mehvəri.

Kim verib fələklərə bunca qüdrət, iqtidar?
Bu qazana sənintək can duzu atanmı var?

Başlanğıcsız varlığın cahana hayqırmada:
60 "Mən həqqəm!" Səndən savay kimdən qopar bu səda?

Sən olmasaydın ərzin səbri, səbatı, inan,
Eşqin bağrı çatlardı, adın çəkilən zaman.

Elə ki, bəlli oldu comərdliyin, kərəmin,
Dağlar ilə yükləndi kürəyi bu aləmin.

Lütfündən, kərəmindən doğmasaydı kainat,
Bu yerin göbəyində olardımı heç səbat?

Səcdə boyunbağısı səninlə tapmış nizam,
Səndən savay kiməsə tapınmaq bizə haram.

Kim səndən danışmasa, qoy lal olsun dünyada,
65 Kim səni düşünməsə, biryolluq getsin bada.

Ay - gecənin saqisi qədəhindən pay umar,
Adının şərabından dağ quşu - əsrik, xumar.

Tanrım, götür pərdəni, görün öz birliyinlə,
Əsirgəmə, qaldır, at, pərdə mən olsam belə.

Göstər necə qulunmuş bu fələk, bu asiman,
Aç, tulla düyünləri, düyünsüz qalsın cahan.

Əmr elə, qoy dəyişsin əyyamın hər ayəti,
Qoy saralsın qarşında ulduzların surəti.

Bu dillərin sözünü sən özün al qələmə,
70 Sənə borcu qalmasın, qələm çək bu aləmə.

Bütün zülmətbazları kor eylə, ulu Tanrı!
Bütün cövhərpərəstlər, əmr et, rədd olsun barı.

Sındır altı guşəli bu kürsünü, dağıt, qır,
Qopar doqquz pilləli bu minbəri, zamandır!

Qaldır Ayın camını, vur bu Yer kürəsinə,
Çırp Zühəlin daşını Zöhrə piyaləsinə.

Aç, dağıt gecələrin boynundan mirvarini,
Gecə-gündüz quşunun sındır qanadlarını.

Qopar palçıq ləkəni sən bu yerin üzündən,
75 Bir kərpic də qalmasın qəlibinin izindən.

Bu toz-torpaq gecəni sil fələyin alnından,
Açıq bir alın kimi işıqlansın bu cahan.

Nə vaxtacan sürəcək atını tazə rüzgar,
Əmr et, köhnə dəbləri, köhnə pərdəni qaytar.

Vur fələyin boynunu, qopar, bir kənara at,
Durğunluqdan, yürüşdən xilas olsun kainat!

Su səp, sönsün cahanda zülmün odu, ocağı,
Bu havanı, bu yeli endir Yerdən aşağı.

Yandır münəccimlərin dəftərini, kül elə,
80 Harda günəşpərəst var, gözlərini kor elə.

Neçin batır-çıxır Ay? Vur, dağılsın Ay bürcü,
Aç pərdəni, yormasın bizi xəyalın gücü.

Təki Tanrılığına ürəkdən inansınlar,
Bir heç olduqlarını qarşındaca qansınlar.

Çoxumuza qıyırsan. Qırılan çox, batan çox,
Fəqət, səndən gileyə heç bir kəsin üzü yox.

Tök qanını, çək dara! Kim səndən hesab istər?
Kimin haqqı çatar ki, qımıldansın tük qədər?

Nitqə gələn insana könül zövqü verənsən,
85 Hər cana idrak adlı yanar məşəl verən sən!

Hökmün ilə uzanır gecənin mənzilləri,
Gedən günlər əmrinlə bir də qayıdar geri.

Səndən nə öyrəndi çərx? Daim sabit qalmağı!
Dirilik suyu aldı səndən bu dünya bağı.

Qəmzəli nəstərəni yellər açdı, yoxsa sən?
Dönüb oldu tutiya torpağının feyzindən.

Qönçələr kəmər çəkib "Qulunuq!" söyləyirlər,
"Bütün cismimizdəki can səndədir!" deyirlər.

Qul Nizami həmişə sənə duaçı bəndə,
Kandarının tozudur o, hər iki aləmdə.

Sən onun can evini mərifətlə abad et,
Qurtar onu zəncirdən, dərddən, qəmdən azad et!

## İKİNCİ MÜNACAT

Ey hələ biz yox ikən var olan ülvi, uca!
Biz öləndən sonra da ey, əbədi qalacaq!

Dövran sənin əmrinin cilov çəkən nökəri,
Yəhərini daşıyır fələyin çiyinləri.

Biz ki, sənin qapını döyən dilənçi - yazıq...
Qulaqları qapıntək həlqəli qullarınıq.

Səndən savay heç kəsdən mehr ummadı qəlbimiz,
95 Heç bir könül tikənə minnətçi olmadıq biz.

Qorxumuz da səndəndir, ümidimiz də sənsən,
Biz suçluyuq, sən kərim, suçumuzdan keçənsən.

Köməksizik, çarə qıl, sənsən ümid yerimiz,
Sən də qovsan qapından, kimə yalvararıq biz?

Damğalı itlərinik, üstümüzdə damğan var,
Yalnız bu cür itlərlə şahlar şikara çıxar.

Sənin bağındanıq biz, nə deyim artıq-əskik?
Boynubağlı qulunuq, damğalı itlərinik.

Bu nə dildir, ilahi, nələr gəlir başıma:
100 Desəm, peşman oluram, deməsəm, yenə peşman.

De, sən hara, mən hara? Bu gücsüz qollar hara?
Mən kiməm ki, tapınım ulu pərvərdigara?

Necə ürək eləyib o ümmana girər can?
Necə, hansı hünərlə su içər o bulaqdan?

Vəsfində dilim dönməz, sıxar məni eyiblər,
"Tanrını dərk eləyən dilsiz qalar" deyiblər.

Çiy sözlərim göstərir sizdən xəcalətimi,
Əfv elə, əsirgəmə məndən mərhəmətini.

Dərgahına gələndə özümüzü itirdik,
105 Sənin səxavətinə böyük ümid gətirdik.

Ey dərdlilər hamisi, yar ol qəmxar ol bizə,
Çarəsizlər çarəsi, əlac et dərdimizə.

Karvan sovuşur, baxın, bizsə qalmışıq geri,
Kimsəsizlər kimsəsi, atına kimsəsizləri.

Söylə, kimə sığınaq, ey bənzəri olmayan?
Döyək hansı qapını? Yalnız sənsən əltutan.

Bizim ki qibləmiz yox sənin qapından kənar,
Bizə üz göstərməsən, üzümüzə kim baxar?

Bizdən başqa kim sənə bunca yalvara bilər?
110 Kim tökər gözlərindən qan-yaş dolu gilələr.

Əfv et suçlarımızı, ulu Tanrı, bağışla,
Sığınmışıq biz sənə ümidlə, yalvarışla.

Nizaminin adına şərəf gətirən Xuda!
Sənin qulun olmağım ağalıqdır dünyada.

Onun dilinə dua, şükür ərməğanı ver,
Seni dərk etsin deyə mərifət nişanı ver.

## PEYĞƏMBƏRLƏRİN SONUNCUSU HƏZRƏT MƏHƏMMƏDƏ GÖZƏLLƏMƏ

Birinci nəqş edilmiş "Əlif" oxu lövhədə,
Ağ pərdəli qapıda qismət oldu Əhmədə.

Qüdrət, səltənət verdi "Əlif "hey" həlqəsinə,
"Dal"-dan gərdənlik aldı, "Mim"-dən kəmər özünə.

"Əlif', "dal" ilə "mim" də tapdı həyat qüvvəsi,
Bir dövlət dairəsi, bir kamal xəzinəsi.

Firuzədən yapılmış bu əngin mavilikdə,
Cənnət qəsrindən gələn turuncdu tazəlikdə.

Turuncun da dünyada öz adəti, dəbi var:
Öncə meyvə gətirər, sonra çiçək, gülbahar.

Onun oldu birinci peyğəmbərlik bayrağı,
Son peyğəmbər olmağın şərafəti, növrağı.

Möhür kimi verildi Məhəmmədə yeni Ay,
120 Hansı zəbərcəd qaşlı üzük olar ona tay?

Cahanın qulağında onun "mim" həlqəsi var,
Ona təslim həlqəsi iki dünyadır aşkar.

O - sahəölçən ağa, Məsih - ona qulluqçu,
O - Tanrının elçisi, Bu - yalnız muştuluqçu.

Təhsili olmasa da o, çox yüksəkdir, inan,
"Əlif" ilə Adəmdən, "mim" ilə Məsihadan.

Sədaqətdə, vəfada "əlif" gördülər onu,
Peyğəmbərliyin başı, peyğəmbərliyin sonu!

Məhəmməddir aləmin ən işıqlı nöqtəsi,
125 Bütün deyilmişlərə nöqtə qoyub nüktəsi.

Cahana baş əyməyən kamil kişi olsa da,
Öyünməkdən, kibrdən uzaq gəzdi dünyada.

Şan-şöhrət tapdı "ədəb" gələndə onun səsi,
Fələklər, kəhkəşanlar - kəmərinin düyməsi.

Onun hərəm evində pərdəçidir hurilər,
Ürəyindən su içir ismət, ləyaqət, hünər.

Silir günahı gözdən türbəsini ziyarət,
Xərac aldı Məkkədən onun düşdüyü qürbət.

Susması könüllərə işıq salan zəriflik,
130 Qüsurlara od vurar ondakı eşq, ariflik.

Fitnə yaratmağıyla könüldə eşq oyadar,
Ona heyran olmayan məgər bir insanmı var?

İnsanlığın ən böyük başçısı, xeyirxahı,
Ağır başlı, vüqarlı, çevik yürüşlü dahi!

Odur əzəl dərsini əbədəcən oxuyan,
Canını çıraq edib, Tanrı nurunu yayan.

Feyzindən yardım dilər Günəşin nur qaynağı,
Ayı merac gecəsi şaqqaladı barmağı.

135 Darısqal köksləra o asiman doldurub,
Karvanqıran ulduzun köhləninə nal vurub.

Eşidəndə ki, gəlir, dönür meracdan geri,
Yedəklədi Boz atı sənət süvariləri.

Atının yəhərindən yapışmaq səadəti,
Nizaminin qisməti. Gec yetişdi növbəti.

**PEYĞƏMBƏRİN MERACI**

O cənub hökmdarı - peyğəmbər geçə yarı,
Məşəl çəkib, nurlatdı dibsiz qaranlıqları.

Doqquz fələk apardı onuənginliklərə,
Məşəl tutan oldular yolunda Ayla Zöhrə.

Göyün hərəm evindən keçdi onun sürəti,
140 Yeddi iqlimi, altı tərəfi, dörd cəhəti.

Mübarək çöhrəsini görüncə gün qaraldı,
Gecə rəqsə başlayıb, özgə bir ahəng aldı.

Ağır yuxuya getdi yad gözlər, yaman gözlər,
Uyğu üzəngisini çəkdi... çapdı peyğəmbər.

Can qəfəsilə birgə onun könlünün quşu,
Uçdu dünya torundan, nə gözəldi uçuşu.

Dərhal büküb atdılar, görüncə çöhrəsini,
Mələklər qanadını, fələklər xirqəsini.

Onun can qəfəsində uçan qanadlı quşdu,
145 Can qəlibi qəlbindən xeyli yüngül olmuşdu.

Addım-addım can atır sanki yar nəfəsinə,
Allah çəkir onları vüsal məsafəsinə.

Ona dikib bu yolda iki cahan gözünü,
Səcdəsinə qapandı görən kimi üzünü.

Başı hər çur rütbədən çox uca olduğundan,
Bir mənzil əvəzinə yuz mənzil kəsdi, inan.

Hundür axurlu Rəxşi köyu tərlə islatdı,
Yəhəri son mövqedə şax bir çiyinə atdı.

Göylər - dəniz sədəfi, o sədəfin gövhəri,
150 Başına taç qoymağa apardılar irəli.

O ətirli gecədə çərx öküzü nə çaldı?
Bəlkə yer öküzündən min-min gövhəri aldı.

Səmai yolçuluğun muştuluğu gör nədən:
Kəməri - Cövza bürcü, tacı - Xərçəng bürcündən!

Başaq bürcü parladı, nur salxımı yaratdı,
"Sünbülə"ni götürüb Aslan bürcünə atdı.

Tərəzinin düzəldib Zöhrə bir cüt pərini,
Ölçdü qutlu gecənin vəznini, dəyərini.

Siqlətinin önündə səcdə qıldı tərəzi,
155 Daşdan, tərəzidən də ağırdı onun vəzni.

Qalxdı, Əqrəb bürcünün yanaşdı quyruğuna,
Süsənbər nəfəsindən bir məlhəm verdi ona.

Yay bürcü kamanından ov yıxan bir ox atdı,
Çəpiş-Çüdey bürcünü zəhirmardan çıxartdı.

Balıq qarnına girmiş Yunistək Hut bürcündən,
Dolça bürcündən keçdi, Yusif doğdu hüsnündən.

Təxti Sürəyya təki Quzu bürcündə qurdu,
Dərhal çöllərə çıxdı çiçəklər ordu-ordu.

O cənnət bağçasının gülü, laləsi yandı,
Yer üzü başdan-başa yaz rənginə boyandı.

Gecə gündüzə döndü. Günorta günü par-par,
Sərvlər gül açdılar. Möcüzəli bir bahar.

Dönüb bağa baxmalı, görməkçün nərgizləri,
Sürməylə sürməlendi onun nərgiz gözləri.

Yeddi qatlı göylərdən ədəb dərsi öyrənən,
Peyğəmbər üzr istədi bütün peyğəmbərlərdən.

Neçə ulduz pərdəsi qədəmində dərbədər,
Bayrağını daşıyır ağ çiynində mələklər.

Gecənin göbəyində dil-dodağının mişki,
165 Atının ayağında aypara bir nal təki.

Bu qaranlıq gecədə atəşmidir parlayan?
Yoxsa şimşək saçılır Bürağın dırnağından?!

Göyərçin qılıqlı at tərlanmı, kəklikmidir?
Bəlkə qumru quşudur, yoxsa hüma tək gedir!

Firuzə qübbələrdən çıxdı yeddinci qata,
Əl-əl gəzən gül kimi çatdı ilahi taxta.

Qolsuz bir köynəkmidir Sidr ağacı əyninə?
Ərşin yaxası dəyir onun əl-ətəyinə.

Üzgün yoldaşlarını yormuşdu göy yolları,
170 Bükülüb qanadları, qırılmışdı qolları.

O, azmış qərib kimi heyrət içrə yürürdü,
Yalnız ulu Tanrının qapısını döyürdü.

Keşik çəkən mələklər izlədilər yolunu,
Çəkilib, kəcavədə təkcə qoydular onu.

O yolçusu olmayan yolda təkcə açıb iz,
Gedirdi, bir qədəmi o birindən xəbərsiz,

O, əsrar pərdəsinin bayıldı qapısında,
Ondan başqa heç bir kəs çatmamışdı bu qata.

Ayağı kainatın başında bir qızıl tac,
175 Ərşin özü də bu çür ülvi nemətə möhtac!

Üstündən qələm çəkdi hər nə varsa cahanda,
Ərş üstündə ucaltdı bayrağını bir anda.

Can qorxusu içində sayıqlarkən kainat,
Verdi can ölkəsini bədən mülkünə sovqat.

Ərşin son nöqtəsində yolçuluq başa çatdı,
Ürək, can işləri də cana, ürəyə yatdı.

Hansı yerdən gəlibsə, həmən yerə çapdı ruh,
Xəyal tapa bilməyən bir gözəllik tapdı ruh.

Addım-addım yürüdü, mənzilə ilk çatdı o,
180 Göylərin libasını əynindən çıxartdı o.

Gücü gəldikcə getdi. Çıxdı hünər yolları,
Bu sonsuz təbiətin yaxasından dışarı.

Əzəməti, hümməti pak bir aləm yaratdı,
Mənzili bilinməyən ülvi bir qata çatdı.

Qurşağından yapışıb onu ucaltdı qeyrət,
Yüyənindən yapışıb, guşədən çəkdi heyrət.

Yürüsə də, canında bir yorğunluq duymadı,
Aradı həndəvəri, gəzdiyini bulmadı.

Mənliyindən keçincə, tapdı arzu-kamını,
185 Tanrı mərtəbəsində aldılar salamını.

Vüsal əli döşündə, aldı töhfə gülünü,
Cah-cəlal sarayının qaldırdı ağ tülünü.

Ayaq gedib-gəlməyi həvalə etdi başa,
Qəlbin gözü nə gördü? İlahi bir tamaşa!

Seyr etdiyi o nurun harda tayı, misli var?
Nə zaval dəyə bilər, nə xəyal onu qavrar.

Aşiqliyi elə bil gözünə işıq verdi,
Görünməyən Tanrını aşiq gözüylə gördü.

Lakin, onu görməyin məkanı, zamanı yox,
190 Zamandan və məkandan çünki çox ucadır, çox!

O idrakın gözündən gizlənə bilməz heç vaxt,
"Onu görə bilmərik!" deyənlər kordu ancaq.

Tapmdığını görmək bir səadətdir, bəli,
Mütləq görülməlidir O, mütləq görülməli!

O pərdəni görməyə məkan varmı? Məkan yox.
Yürüməyə, çatmağa zaman varmı? Zaman yox.

O pərdənin ardını görməyi bacaranlar,
Məkanı tapmasa da, laməkana yol tapar.

Tanrı sifətlərini inkar küfrdür saqın,
195 Cahil olma, nə yönü, nə yeri var Allahın.

Tanrı var, fəqət onun mənzili, məqamı yox,
Məkana möhtac olan Tanrı sayılarmı? Yox!

Həzrət Məhəmməd onu başqa ölçüylə gördü:
Ürək, idrak gözüylə, zəka gücüylə gördü.

Haqqın hazırladığı meydən içdi Peyğəmbər,
Bizim də qəlbimizə damızdırdı bir qədər.

O, Tanrının lütfünü nəfəsində sanırdı,
Tanrı çəkir nazını, o, isə nazlanırdı.

Şəkər təbəssüm ilə süslənib dodaqları,
200 Dua etdi Tanrıya: - Bizə nicat ver barı!

Xəzinədən zəngindir onun hümməti qat-qat,
Qəlbindəki hər murad açdı o gün qol-qanad.

Elə ki, qüvvət aldı Tanrının qəbulundan,
Yenə emal evinə üz qoydu müdrik insan.

Eşqin çazibəsilə qət etdiyi səfəri,
Bircə nəfəs içində bitirib, döndü geri.

Ey sözü dilimizin duzu, qəndi Peyğəmbər!
Canımıza dərmandır saçdığın ətir, ənbər.

Səxavətin nurlatsın bu dünyanın gözünü,
205 Nizamiyə yardım et, tamamlasın sözünü.

## PEYĞƏMBƏRİMİZİ ÖYƏN İKİNCİ GÖZƏLLƏMƏ

Yeddi ulduzun nuru, doqquz fələyə gültac,
Tanrı elçilərinin ən ucası, son yalvac.

Əhmədin ayağında əql özünü toz sanıb,
Yəhərinin tərkinə iki cahan bağlanıb.

Odur naz səhrasının yeni açmış sünbülü,
Gizlinlər dənizində ən saf gövhərdi könlü.

Saçları gündüz belə şölə verər sünbülə,
Dişləri qərq eləyər Günəşi dürrə, lələ.

Şəkər dodaqlarını daim açsaydı əgər,
210 Ondan utanmazdımı sədəf bağrında gövhər?

Bir daşın da könlünü qırmayan həssas kişi!
Daşlar necə qıydı bəs, sındırdı inci dişi?

Əlindən hər şey gələr, kim olarsa bağrı daş,
Qara-qura sövdaya meydan açar o kütbaş.

Məhəmmədin dürrünü sındırmasaydı əgər,
Öyünə bilərdimi o daş məgər bu qədər?!

Dar ağız qutusuna daş dəydi, düşdü gövhər,
Gövhər daşdan doğulur, əbəsmi söyləyiblər?

Qan bahası verməyə məgər daşın pulu var?
215 Peyğəmbərin ağzını neçin yaraladılar?

Daşın ağzından çıxan yüz-yüz mirvari məgər,
O bircə sınıq dişin əvəzini ödəyər?

Qara mədəndən çıxan min-min işıqlı inci,
Məgər ola bilərmi bircə dişin ödənci?

Zəfər onun dişinin qan bahasıydı yəqin,
Bütün canı-cövhəri zəfərindi, zəfərin.

Ağzını qanla yudu, qoruyub muradını,
Başı üstə ucaltdı mərhəmətin adını.

Sınıq dişi kökündən yerli-dibli çıxartdı,
220 Böyük zəfər naminə şükr edib, onu atdı.

Vaz keçdi könlündəki bütün arzularından,
Bir arpa dəyərində gözündə iki cahan.

Onun döyüş ordusu döyüş meydanında ər,
Əli bayraq əvəzi, dili sıyrılmış xəncər.

Haqq xəncəri dilinin nə ehtiyacı dişə?
Məgər dişli xəncərlə gedərlərmi döyüşə?

Qoy ondan zövq alanlar diş bəhsini unutsun,
Hamı atsın tikanı, gülündən dəstə tutsun.

Bağlar güllə doluykən kim tikandan bəhs açar?
225 Sapa inci düzərkən ilana lüzummu var?!

Onun gülü üstündə bülbülləşib Nizami,
Feyzindən açılıbdır təbi qızılgül kimi.

## SON PEYĞƏMBƏR HƏZRƏT MƏHƏMMƏDƏ ÜÇÜNCÜ GÖZƏLLƏMƏ

Ey varlığı ən təmiz ruhlardan daha təmiz!
Ruhuna canım fəda! Ulu peyğəmbərimiz!

Sənsən rəhmət yurdunun tən ortası, mərkəzi,
Qələminlə silindi hər zəhmətin nöqtəsi.

Sən Əcəm şahlarının həmişəlik şahısan,
Ərəb yolçularının Ayısan, pənahısan.

Yolu göstərməsən də, yol tapırlar sayəndə,
230 Baş kətxuda özünsən, kəndə heç dönməsən də.

El baxır, heyran qalır kəraminin sirrinə,
Təkcə tamaşa etmək olmaz təklik pirinə.

Şirin xurma yediyin qonaqlıq süfrəsindən,
Xırda-xuruş hansı pay gətirmisən, söylə sən?

Dil aç ki, insanlığa bal kimi sözlər gərək,
Ağız suyunla bitən həqq xurmasından dərək.

Ey gecə saçlarıyla gündüzlərə səpən nur.
Sənə eşq atəşimiz dirilik suyumuzdur!

Ağıl sənin üzünün məftunudur, ey qoca!
235 Məftunların nə qədər? Saçlarının sanıyca.

Çərx - sənin kəmərinin ügəyində bir kölə,
Səhər - gülər üzünün günəşindən bir şölə.

Bu günahkar aləmi günahdan qurtardın sən,
Ətirləndi müşkünlə yerin göbəyi, əhsən.

Türbənin təsirindən Ərəbistan - gülüstan,
Ölkənin hüdudları müşk ətirli bağ-bostan.

Bağ demirəm, torpağın cənnətdən də yaxşıdır,
Süleymanın mehindən, o təxtdən də yaxşıdır.

Sənə ibadət qılan Kəbəni od qarsımış,
240 Mübarək dodağının gül suyuna susamış.

Sənin təxtü-tacını daşıyır cahan, bəşər,
Təxtln - bu Yer kürrəsi, tacın - səma könüllər.

Kölgən yoxdur, çünki sən böyük əql işığısan,
Yaxud Tanrı nurunun sayəsindən bir nişan.

Dörd bayrağın – təkbirin müsəlmanlıq mehvəri,
Beş duan - beş namazın sultanlıq növbətləri.

Düşkünlərin torpağı bağa döndü feyzindən.
Qüdrət sahiblərinin gözü nur aldı səndən.

Merac gecəsində sən - aləmə dost, aşina,
245 Ayaqların toxundu fələklərin başına.

Sən gəldin, göy ətəyi doldu daş-qaşla, zərlə,
Göy çevrəsi süsləndi altunla, al rənglərlə.

Sübhün sədəfindəki, ah, bu hansı ətirdi?
Səba müşk ətri verən nəfəsini gətirdi.

Nəfəsinin saçdığı o ətri, ənbəri sən,
İki dünyaya versən, necə ucuz verərsən!

Qocaman Sidr ağacı - təxtinin bir ayağı,
250 Ərş sənin qəsrindəki kürsüdən də aşağı.

Ruhunun pəncərəsi - açıq, aydın bir səhər,
O günəşin yanında ərş zərrəyə bənzər.

Əzəl sübhü hüsnünü əks eləyən bir ayna...
Onsuz yayılardımı sənin nurun dünyaya?

İki cahan başçısı, neçin yer altındasan?
Məgər xəzinəmisən, gözdən, könüldən nihan?!

Ey müqəddəs xəzinə, sən ki, yerdəsən artıq,
Bütün xəzinələri yerə tapşırmalıyıq.

Yoxsulluğun - viranə, vücudun xəzinədir,
255 Hamıya yetən kölgən şamına pərvanədir.

Fələyin əyri çərxi - ahının hədəf yeri,
Dolçasının çənbəri - quyunun yaş kəndiri.

Bu ağ, qara dünyanın soltanları - Ayla Gün,
Peykin olub yolunda, xəbərçidir səninçün.

Ağıl şəfa arayır - onun Loğmanı sənsən,
Ay yol tədarükündə - canı, cananı sənsən.

Qalx, vüsal umanların gecəsini gündüz et,
Nizaminin təbini işıqlandır, ulduz et.

## PEYĞƏMBƏRİMİZƏ DÖRDÜNCÜ GÖZƏLLƏMƏ

Ey Mədinə köynəkli, Məkkə pərdəli gözəl!
260 Günəş nə vaxta kimi kölgədə qalacaq, gəl!

Aysan əgər, nurundan bir şölə göndər bizə,
Gülsən əgər, bağından ətrin gəlsin təptəzə,

Canlarını dişinə tutub yol gözləyənlər,
İmdad istər, ey dada yetişən sevgili ər!

Durma Ərəb çölündə, Əcəm yurduna atlan,
Gecə o qara, gündüz ağ köhlənlə qanadlan!

Elə tazələndir ki, sən bu köhnə dünyanı,
Tutsun səsin, nəfəsin qoy hər iki cahanı.

Sultanlıq et, əmirlər səni sultan biliblər,
265 Özün oxu xütbəni, sükut etsin xətiblər.

Torpağın xilafətə bir gül çələngi atdı,
Heyhat, fitnə küləyi gül ətrini dağıtdı.

Çək ipini, təxtindən endir asudələri,
Bulaşıq abidlərdən təmizlə bu minbəri.

Gəlib evə soxulan bu cinləri qovla, qır!
At ölüm quyusuna alçaqları, amandır!

Qoyma basıb yesinlər, onlar qarınquludur,
Ləğv et iqtalarını, qudurmasın hər quldur.

Cansız cisimlərik biz, sən buyur, can ol bizə,
270 Hamımız qarışqayıq, gəl, Süleyman ol bizə.

Başçı sənsən, bəs neçin başsız qalıbdı karvan?
Mərkəz sənsən, bəs neçin bayraq qalxır kənardan?

Bir yanda rəxnə salır, bir yanda tor qururlar,
Dinimizi gözündən, urəyindən vururlar.

Sən şeytanın üstünə Öməri göndər, ya da,
Əmr et, Əli vuruşsun bu vuruş meydanında.

Saçını ay üzünə Yəmən tülü kimi sər,
At bu Yəmən cübbəni, ay camalını göstər!

Kəməri bərk çəkib, vur qapı bağlayanları,
275 Bu bir neçə alçağı bir az da alçalt barı.

Beş yüz əlli doqquz il uyudun, yatdın yetər!
Oyanıb məclisə gəl... yaxmdır ulu günlər.

Qalx ayağa, əmr elə, oyat sən İsrafili,
Qoy üfürüb keçirsin bu bir neçə qəndili.

Gizlən sirr pərdəsində, xəlvət yaşa, sayıq ol!
Biz hamımız uyğuda, barı bir sən ayıq ol!

Dünya - ölüm, qan yurdu. Son qoy bu afətə sən,
Mərd əlini uzat, tut hamımızın əlindən.

Könlündə haqdan savay məgər bir dilək varmı?
280 Sənə qovuşan kəslər başqa bir şey umarmı?

Qayğı gözüylə bir yol qoca dünyaya baxsan,
Hər müşkülü açacaq, zülmü yandıracaqsan.

Barmağının ucuyla işarə qıl fələyə,
Bütün varlıq verilər sənə sovqat, hədiyyə.

Əfv eləsən bir ovuc toza, gülə dönəni,
Qiyamətdə, məhşərdə axı kim qınar səni!

Aç pərdəni, aşiqlər görsün hüsnünü bir dəm,
Sevincdən xirqəsini atsın qoy iki aləm.

Nizami ruhu səndən xoş xəbər gözləməkdə,
285 Sənin baharın onun könlünü süsləməkdə.

Vəfa qoxusu göndər mənə gül nəfəsindən,
Bəxş et bir dilənçiyə Suleyman mülkünü sən.

## PEYĞƏMBƏRİMİZƏ BEŞİNCİ GÖZƏLLƏMƏ

Ey yalvaclar tacının ən qiymətli gövhəri,
Sultanlara taç verən ağ günlər peyğəmbəri!

Yad da sənə möhtacdır, ümmətindən olan da,
Çörəyini yeyənlər nə qədərdir cahanda.

Adın ilə başlanır beytimin başlanğıcı,
O həm də qafiyətək söz sonunda baş tacı!

Bizim bu viran kəndə gəlincə bir işarət,
290 Sənin ruhun, Adəmin cismi qurdu imarət.

Əllərinlə bəzənmiş bu tazə mülkə əhsən,
İlk kərpici Adəmdir, son kərpici özünsən.

Həm Adəmsən, həm də Nuh, yox, onlardan ucasan,
Onların vurduqları düyünləri açansan.
Adəm bir buğda daddı, ağır günaha batdı,
Tövbəsi - bir gülşəkər, tövbə dadına çatdı.

Sənin ətrin Adəmə tövbə yolu göstərdi,
Kandarının torpağı onunçün gülşəkərdi.

Sözünü şəkər bilib, tövbə edərkən Adəm,
295 Gülşəkər də əl çəkdi, inan, şəkərliyindən.

Tanrı qəbul topumı yaratmışdı əzəldən,
Könüllər meydanına atdı onu qəfildən.

Adəm öz çovkanıyla topun önündə durdu,
Hamıdan tez, birinci zərbəni özü vurdu.

Ancaq atı şığıdı saman dalınca sağa,
Yazıq top aciz qalıb, qısıldı bir bucağa.

Nuh təşnəydi, bu dünya süfrəsinə yanaşdı,
Çeşmə çıxdı yadından, tufan başından aşdı.

Növbə çatdı, İbrahim köhlən səyirtdi... heyhat,
300 Çatdırmadı mənzilə, üç dəfə büdrədi at.

Könlü darıxan Davud zilə qaldırdı bəmi,
Amma, səsi çatmadı, dağılmadı dərd-qəmi.

Ədəb-ərkan gözlədi, alqışlar Süleymana!
Peyğəmbərlik tacını umub, axtarmayana.

Atıldığı quyuda Yusif nə tapdı? Dolça,
Bir də dolçaya bağlı uzun ip gördü ancaq.

Bezdi quru aləmin yolçuluğundan Xızr,
Bir də gördü ətəyi çeşmədə islanıbdır.

Musa çatdımı kama, camdakı şadlığına?
305 Əlindəki şüşəni çırpdı Ərni dağına.
Məsiha bu qidaya tamah salmadı... Bəli.
Çünki xalqın önündə ləkəliydi, ləkəli!

Təkcə özün bacardın bu işi, bu hünəri,
Heyran qoydu qeyrətin, iradən fələkləri.

Möhürləndi bu namə sənin öz ünvanınla,
Tamamlandı bu xütbə dövrünlə, dövranınla.

Qalx! Bu fələkdən qat-qat gözəl bir dairə qur,
Fələk bunu bacarmaz, Sən bəşərə arxa dur.

Xütbənin meydanıdır fələyin səhifəsi.
310 Çövkənin ucunda bir topdur Yer kürrəsi.

O yoxluq aləmindən bir toz da ucalmayıb,
At çap, meydan sənindir, heç bir kimsə qalmayıb.

Fanilik nəçidir ki, dağıtsın piyaləni?
Alçaq yoxluq kimdir ki, silsin dünyadan səni?

Yoxluğun ayağını yoxluq içində bağla!
Faniliyin əlini fanilіklə ayaqla!

Nəfəsi dilsizlərə dil verən ey hünərvər!
Yaralı ciyərlərə məlhəm qoyan peyğəmbər!

Sənin yolunu tutan ağıl qan dəryasından
315 Dartıb can gəmisini, sahilə çıxmış müdam.

Yurdunun qapıları - doqquz çərxin qibləsi,
Altı günə yaranmış ərz - saçının həlqəsi.

Bircə tük əskik olsa sənin məğrur başından,
Mübarək saçların tək pərişan olar cahan.

İdrakınla oxudun hətta yazılmayanı,
Əqlinlə işıqlatdın beyin adlı cahanı.

Hər sözə, hər cümləyə həssas yanaşdın daim,
Ta ki, sənin sözünə barmaq qoymasın heç kim.

Özgələrin sözünə barmaq qoyuruq bir az,
320 Ancaq sənin sözünə heç kəs irad tutamaz.

Sənin qapının tozu - qovut, şəkər əvəzi,
Cövhərini yoğurmuş püstə, xurma çərəzi.

Bir ovuc qovudunla qırx gün dolanmaq mümkün,
Məhəbbət səhrasını gəzib seyr etmək üçün.

Nicat sübhü ver mənə, ey dağım, ey dayağım!
Sən dirilik suyumsan, mən də sənin torpağın.

Canımın behiştidir daşın, torpağın sənin,
Cahanımdır, canımdır türbən, gül bağın sənin.

Rüzgar olum, dolanım o türbənin başına,
325 Toza dönüm, qarışım torpağına, daşına.

Torpağından gözünə sürmə çəkər Nizami,
Yəhərini daşıyar sənin qulamın kimi.

Torpağını isladıb təbərrik bilir bəşər,
Mənim də torpağımı saçlarına çəksinlər.

## İSLAM PADŞAHI MƏLİK FƏXRƏDDİN BƏHRAM ŞAH İBN DAVUDA ÖYGÜ

Bu mavi dairə ki, kainatı çevrələr,
Burda bir nöqtə kimi düyünləndim bir səhər.

Yox əlimdən tutanım, ayağımı açanım,
Kölgənəm, üstümdə bəs hüma qanadın hanı?

Ayağım bu torpağa batıb dərindən dərin,
330 Qollarımsa bağlanıb kəməndilə göylərin.

Mərdin ayaq tozuna başımı qurban dedim,
Bəzən ayağımla yox, dizlərimlə yeridim.

O qədər nurlandım ki, şöləm düşdü hər yana,
Dizim üstü çevrildi qəlbimin aynasına.

O qədər zövq aldım ki, o mənəvi güzgüdən,
Gözümün güzgüsünü yönəltdim hər yana mən.

Ta görüm hansı güzgü işıq salır gözümə,
Görüm hansı ocaqdan şölə düşür üzümə.

Zəka nəzəri daldı cahan dairəsinə,
335 Baxdım bu mavi qövsə, baxdım yan-yörəsinə.

Dada yetdi hümmətim, sezdim, anladım bunu:
Nemət, səxavət əhli hökmdar olduğunu.

Ey uca taleli şah, tacımızsan, ulusan!
Bu firuzə bağcanın sən qızılgül kolusan.

Sən - ümid qaynağı Xızr, sən - İskəndər güclü şah!
"Məcəsti"ni şərh edən bilginlərə qibləgah!

Xilqətin mehvəridir sultanımın qüdrəti,
Onun vəsfində enmiş göydən Məqsud ayəti.

Tək odur fələk taclı, Süleyman üzüklü şah,
340 Üfüqlərin güvənci - Məlik Fəxrəddin ancaq.

Davudluq iddiası eyləyərsə, haqqı var,
Onda müğənni səsi, Süleyman sorağı var.

Hümmətilə yüksəldi İshaq bayrağı aşkar,
Ona zidd çıxdı yalnız İsmaili zındıqlar.

Altı qütbə addımlar, yeddi qatda təxti var,
Doqquz göyə hökmdar, Bəhram - ulu tacidar!

O öz bəhramlığını açıb göstərsə bir an,
Bəhram Gurun nəsibi yalnız gor olar, inan.

Əzmilə, cürətilə şahların sərvəridir,
345 Bilik xəzinəsilə alimlər rəhbəridir.

Xəlqə cahan mülkünü bəxş eləyən bahadır,
Həm Ərmən hökmdarı, həm Rum padşahıdır.

Səltənətin şərəfi, xilafətin qəlbidir,
Rum elinin fatehi, Əbxazın qalibidir.

O, bütün kişilərdən aqil, ədalət əhli,
Hər bir çomərddən üstün, kərəm, səxavət əhli.

Dövlətinin ulduzu nur saçır fələklərə,
Sədəf kimi qapısı can verib neçə dürrə.

Balıqla, incilərlə dopdolu bir dənizdir,
350 Dərya kimi dalğalı, bulaq kimi təmizdir.

Eşsiz, nadir bir yaqut nur saçır kəmərində,
Ləl mərcan kəmərli Günəşin qənşərində.

Görün, mavi pəncərə nə söylər ucalıqdan,
Pəncəsiz qalacaqdır ona pəncə qaldıran.

Karvan zəngi fələyin qulağını partladar,
Qızğın nəfəsi Ayın şüşəsini parçalar.

Məsuddu, bəxtiyardı dünyaya göz açanda,
Daha gözəl olacaq aqibəti cahanda.

Səxavət qədəhinin saqisi, lütfkarı,
355 Onu sonsuz yaşatsın sonu olmayan Tanrı!

## HÜZURUNDA YER ÖPƏRKƏN SÖYLƏNİB

İnsanlıq mayasının şanı-şərəfi, ey şah!
Sənin əzəmətinlə işıqlanır bu dərgah.

Qələbələr gətirir fələk sənə... seyr elə,
Doqquz fələyin qarnı bir sirrinlə hamilə.

Yerin, göyün qulağı ağ sədəf olmuş sənə,
O kəskin qılıncının zəfər incilərinə.

Gecə qılınc çalan Ay daim önündə naçar,
Qılıncının ucunda qalxanı parçalanar.

Qılıncına düşən su Fərat çayı tək coşğun,
360 Qırıb sürahisini o, dirilik suyunun.

Qopardığın tufanda yuxuya gedən insan,
Nuh olsa da, boğular, sağ qala bilməz, inan.

Keyxosrovu Cəmşidlə bir göstərər piyalən,
Günəş pərvanəsini yandırar nurlu çöhrən.

Mənim aslan ürəklim, sən igidlər yıxmısan,
Aslan söylədim, xeyr! Sən min aslan boğmusan.

Orman aslanlarından fələk bəlkə də qorxmaz,
Ancaq səni görəndə zağ-zağ əsər o qorxmaz.

Vuruş vaxtı bu ciyər, bu mərd ürək kimdə var?
365 Hünərləri hardadır hünərdən dəm vuralar!

Bu göy qübbə altında həmdəmisən bəşərin,
Çoxunun çiynindədir murad verən əllərin.

Kəramətli, tədbirli bunca vəzirlərin var,
Fəqət, yalnız mələklər sənin əlindən tutar.

Zamanın üzüyünü sənə bəxş eləyib bəxt,
Verdi Süleyman təxti, qızıl ayaqlı bir təxt.

O Tanrı ki, bəxş etdi sənə gənclik, məmləkət,
Özü köməyin olsun, əskilməsin bu qüdrət!

Ayaq basdığın torpaq qızıla, zərə dönür,
370 Səni yada salanda zəhər şəkərə dönür.

Mey içməsə səninlə Firidun məqamlılar,
Zöhhakın zülm ilanı çiyinlərindən çıxar.

Mey iç ki, mütriblərin, saqilərin var sənin,
Qəm yemə ki, ağ günün, simü zərin var sənin.

Ölkənin bel sütunu, sultanlar sığnağısan,
Qılıncınla, tacınla güc-qüdrət qaynağısan!

Ey tac alan, təxt alan çırpışmalar rəhbəri,
İldırımdan betərdir qılıncının kəsəri.

Xəzinələr saçırsan xəlifələr sayağı,
375 Birinə tac verirsən, birinə təxt ayağı.

Neçə tac üstündədir sənin zəfər qılıncın,
Şahlar xəzinəsindən axıb gəlir xəracın.

Ayağına baş qoyan fələklərə yüksələr,
Səni sevən könüllər bəxtəvərdən bəxtəvər!

Sayəndə bayquş belə xoşbəxtdir hüma qədər,
Zirvənə ucalan baş qədəmin olmaq istər.

Haqqı inkar edənlər qayıdıb həqiqətə
Səndən şikayətçidən gedirlər şikayətə.

Düşmənlərin nal kimi dara çəkilib batır,
380 Rəxşinin yer dağıdan dırnağı altındadır.

Yeddi fələk, yeddi göy - kəmərinin toqqası,
Səkkiz cənnət də sənin bayrağının şaqqası.

Kimin ki başı sənin hökmün altında deyil,
Onun tacı başına bir ilgək olacaq, bil.

Hər elmin tacidarı, fənnin memarı sənsən,
İki aləmin canı, can birliyi özünsən.

Bir qulaqburması ver, ədəb alsın səxavət,
Yandır sözün şamını, nəşə saçsın qoy sənət.

Sən öz quluna geydir cahanın cübbəsini,
385 Nizamiyə bəxş elə qəbul rayihəsini.

Ətli-canlı olsa da sözüm, kəlamım...Yenə
Arıqlayır, yetincə sənin ürfan süfrənə.

İncisiz, ləlsiz qalıb bu dənizlə bu mədən,
Ona əlinlə mərcan, ağzınla inci ver sən.

Fəqət pisə, dargözə vermə zərrəcə imkan,
Oxlarından yaqut saç, qılıncından da mərcan.

Taleyin fələk kimi məsud, bəxtiyar olsun,
Hər işində, gücündə bəxtin sənə yar olsun.

Uğrunda can qoyanlar, ox tutanlar nə qədər...
390 Ağbəxt mənəm, qarabəxt səni istəməyənlər.

Zəfərlərin başımız üstündə bayraq olsun,
Düşmən başı qələmin ucu kimi vurulsun!

**KİTABIN YAZILMASI SƏBƏBİ**

Mən ki tazə bir gülə şərqi bəstələyirəm,
Mən ki sənin bağında bülbüləm, bilir aləm.

Dedim: sənin kəndində bir zəng çalsın əllərim,
Sənin eşq ocağına mən də bir nəfəs verim.

Heç kəsin yalan sözü əsir etməmiş məni,
Dilim, qələmim demiş yalnız qəlbim deyəni.

Tazə söz caduları, oyunlar göstərən mən,
395 Yeni heykəl yaratdım yeni qəlibli sözdən.

Ona səhər kimi pak ədəb öyrətdim ancaq,
Sehr pərdəsi tikdim, dan yeritək üzü ağ.

Ədəbdədir şahlığın, dərvişliyin nüvəsi,
Ondadır ilahinin neçə sirr xəzinəsi.

Nə şəkərim üstünə gəlib yad arı qonar,
Nə də mənim bal arım yadlardan şəkər umar.

Bu cür dənizdə Nuhun əlindən düşər sipər,
Xızr isə dolçasını bu suda qırıb gedər.

Yaratdım bu gözəli, püşk atdım şahlar üçün,
400 Adın çıxdı falımda, necə xoşbəxtəm bu gün.

Bir cüt namə yazıldı qeyrət, qüdrət adından,
Hər ikisi hər iki Bəhram şaha ərməğan.

Onun yazdığı əski mədəndən doğulan zər,
Bu "Sirlər xəzinəsi" - tazə dənizdən gövhər!

Bayrağım qaldırdı o mərd Qəznədən göyə,
Sənsə vurdun damğanı Rum elində sikkəyə.

Baxma ki, o damğada söz qızılla yazılıb,
Ondan qat-qat üstündür mənim damğam, qızılım.

Mənim yüküm, xəracım onunkundan olsa da,
405 Matahıma müştəri qat-qat çoxdur dünyada.

Şivəm qərib görünsə rədd etmə, ey şəhriyar,
Azca nəvaziş görsə, qəriblikdən qurtular.

Mənim təzə sözlərim bar gətirdi bağ kimi,
Özgəsinin neftilə yanmadı çıraq kimi.

Bu nemət ki, süfrənə qoyuram - ərzə bəlli;
Hələ bircə kimsənin ona dəyməmiş əli.

Bax dadına, duzuna dadlıdırsa, nuş olsun,
Dadsızsa, yaddan çıxart, unut, fəramuş olsun.

Axşam əl uzadırkən fələklə bir təama,
410 Sən mənim də qarşıma bir tikə qoy, unutma.

Sənə məhəbbətimi vəsf etdim dönə-dönə.
Qoy sənə qul xidmətim iftixar olsun mənə!

Vəfasını gördüyüm hər sultandan daha çox,
Sənə bağlanmağı mən üstün tutdum, şübhə yox.

Vəfa ilə bitəcək sənə xidmətim daim,
Qalmayacaq gözümdə bir mətləbim, bir əhdim.

Əbədilər qəsrinə, şahlıq adlı büsata,
Mədh yazan şairlər xeyli yığışıbsa da.

Nizaminin yanında ədəb gözlərlər yəqin.
415 Nizami - Nizamidir, bəs onlar kimdir, deyin?

Şairlik zirvəsinə mən ki çoxdan çatmışam,
Dalda qoyub tay-tuşu, köhlənimi çapmışam.

Mən ki söz almazından odlu qılınc yaratdım,
Arxadan gələnlərin boynunu vurub atdım.

Elə yüksək zirvəyə qalxmışam ki, baxın bir:
Ayaqlarım ən uca başların üstündədir.

Elə yüksəkdəyəm ki, yalnız orda uçaram.
Öz hümmətimə layiq yer istər, yol açaram!

Sənin fikir nurunda təki qalxım, yüksəlim,
420 Ayağın dəyən yerə təki baş qoya bilim.

Ayaq tozun olum ki, baş çəkim kəhkəşana,
Əl verməsən çatmaram, inan, şöhrətə, şana.

Dedim: bir-iki aya şahın hüzurunda mən,
Yeröpmə adətini təzələrəm ürəkdən.

Heyhat, çıxış yolum yox... dəmir həlqəyə düşdüm,
Bağlı qapı dalında çox qaldım, çox döyüşdüm.

Qabıq qoydum yolunda. Dedim: qaya, daş yarım,
Təki sənin yanında yüksəlsin etibarım.

Gördüm arxam, önüm də aslanlarla doludur,
425 Qılınclarla kəsilmiş yolum - ölüm yoludur.

Qılınclarla qapanmış bu ölkədə, qoy dedim,
Ən uca, güclü səslə sənə bir xitab edim.

Çəkdim sənin qapına qaynayan söz çeşməmi,
Özüm yerimdə qaldım bir qum danəsi kimi.

Mən sənin qabağında bir zərrəyəm, ey Günəş!
Səhər dualarımı qəbul eylə, fikirləş.

İnci dolu dənizin atdı, tutdu təbimi,
Kəmərindən asıldı ürəyim daş-qaş kimi.

Nə qədər ki həyat var, hər keçən gündüz olsun,
430 Gecə şahlıq gövhərin qoy min-min ulduz olsun.

Gör nə qədər parlaqdır sarayda bəxt ulduzun.
O qəsrin bu qəsrdən bir az da üstün olsun!

## SÖZ QOŞMAĞIN FƏZİLƏTİ HAQQINDA

İlk dəfə tərpənəndə sözdən güc aldı qələm,
Sözdən doğuldu ilk hərf... şahiddir bütün aləm.

Xəlvət pərdəsini ki qaldırdılar, atdılar,
Öncə söz cüvələndi. Sözdən can yaratdılar.

Sözdən bir səs, bir nəfəs gəlməmiş... inan mənə:
Can girmədi palçıqdan xəlq olunmuş bədənə.

O gündən ki, qələmlə kağız çatdı şərəfə,
435 Cahan açdı gözünü, sözü gördü ilk dəfə.

Söz olmasa... yerində dünya donardı, sözsüz,
Nə qədər söz dedilər, yenə əskilmədi söz.

Söz - canımızdır. Eşqin lüğətinə baxsana!
Biz sözük, gövdəmizsə yalnız xarabaxana!

Yalnız qələm gücünə düşüncələr saxlanır,
Misra söz quşlarının qanadına bağlanır.

Bu sonsuz aləmdə ki, həm təzədir, həm köhnə,
Tükü qırx yerdən bölən sözdən kəskin nə var, nə?

Düşüncənin əvvəli, rəqəmin, sayın sonu,
440 Təkcə sözdür, təkcə söz, yadında saxla bunu.

Tacidarlar özu də tac söyləmişlər sözə,
Vasiflər vəsf eyləmiş, durub sözlə göz-gözə.

Gah sözün bayrağını çəkərlər eldən-elə,
Gah qələmin yazdığı saçar dünyaya şölə.

Bayrağını ən uzaq ellərə sancan da söz,
Qələmilə ən yeni iqlimlər acan da söz.

Bomboş fikrə, xəyala təslim olan kəslərə,
İlham üz göstəribmi məgər barı bir kərə?

Biz ki gözlərimizi sözə dikmişik artıq,
445 Ölsək, sözlə ölərik, qalsaq, sözlə qalarıq.

Damarları donanlar sözdə tapar atəş, köz,
Bağrı yananlar üçün dirilik suyudur söz.

Sözdür bərbad aləmin abad qalan guşəsi,
Bu fələk sürfəsinin ən dadlı azuqəsi!

Hər boyadan an söz, ömür - günsən, ömür - gün,
Dillə vəsfini vermək bəlkə də qeyri-mümkün.

Söz bayraq taxan yerdə hərf ilə dil müzəffər,
Dilin, nitqin qüdrəti olur sözlə müyəssər.

Söz tapa bilməsəydi candakı şah damarı,
450 Can kələfin ucunu - aləmi tapardımı?

Sözlə kəşf eləyiblər hər qaydanı, hər yönü,
Həm təbiət mülkünü, həm şəriət möhrünü.

Mədən söz və qızılı təklif edib sərrafa,
Sərraf tərəzisində söz qızıldan çox baha!

Təzə söz, köhnə altun... hansı hakim kəsilir?
Söz hara, qızıl hara? Bunu sözdoğan bilir!

Öz qüvvəsilə gedər söz qasidi... tövşüməz,
Söz qaldıran dağları qaldıra bilməz heç kəs.

Söz gümüşü yanında qara torpaqdı dirhəm,
455 Qızıl hansı itdir ki, onu sözə tay biləm?

Heç kəs əyləşə bilməz sözdən yuxarı qatda,
Dövlətimiz, mülkümüz yalnız sözdür həyatda.

Sözdən xəbərsiz qalır könüldən xəbərsizlər,
Sözün yozumu sözdən daha şux, daha dilbər.

Nə qədər ki cahan var, sözün coşsun qoy səsi,
Qoy sözlə tazələnsin Nizaminin nəfəsi.

## ÖLÇÜLÜ SÖZÜN ÖLÇÜSÜZ SÖZDƏN ÜSTÜNLÜYÜ

Ölçülüb biçilməmiş dağınıq sözlər belə
Sözsə... zərgər yanında bənzər gövhərə, lələ.

Ölçülüb-biçilərsə incə fikir, incə söz,
460 Nə qədər gözəlləşər, olar ürəyincə söz.

Kim ki sozə söz qoşub tapar haqqın səsini,
Sözlə iki aləmin açar xəzinəsini.

Bu xəzinəni yalnız açar tapanlar açar,
Yalnız söz ərlərinin dilləridir bu açar.

Sözün tərəzisini quran ulu hökmdar,
Sözün aşiqlərini sözlə etdi bəxtiyar.

Ərşin bülbülləridir cahanda söz qoşanlar,
Məgər özgələrinə tay tutularmı onlar?

Düşüncə atəşilə pərişan olan zaman,
465 Mələklərlə gəzərlər, mənzilləri asiman.

Sözdoğanlar - nur sacan peyğəmbərin kolgəsi,
Ərzin işıq pərdəsi, haqqın yanar nəfəsi.

Mətanət meydanında kimlər tutdu gör səfi,
Əvvəlcə peyğəmbərlər, sonra şairlər səfi!

Şair ilə peyğəmbər - bir nigarın məhrəmi,
Peyğəmbərlə şair haqq, qalanlar haq görkəmi.

Şairin süfrəsində şirin xurmalar ki var,
Xurma deyil, bəlkə də ürək parçasıdırlar.

Ürəyin dişlərilə qoparılmış söz, fikir
470 Torpağın dimdiyilə cilalanmış incidir.

Hikmət qaynağı şeri hər gün alçaldıb bir az,
Sudan da ucuz etdi beş-on nəfər şeirbaz.

Kimin söz pərdəsində ahəngi var, sehri var,
Özü yerdə olsa da, ruhu göylərdə yaşar.

Dizi üstə söz yazıb, ölkələri tutan kəs
Dünyada heç bir kəsin qapısında baş əyməz!

Dizinə dirsəklənib fikrə dalan sənətkar,
Sözlə iki cahanın dövlətini qazanar.

Əyilən məğrur başı ayağını salamlar,
475 Dirsəklənər dizinə, kamanlaşar sənətkar.

Öz kaman halqasını qırmaq istəyən şair,
Bükülüb açılınca, təb üstündə dikəlir!

Bükülmüş qamətilə sanki həlqə olanlar,
Fələyin qulağına bəzən min həlqə taxar.

Bu hoqqabaz fələyin qarşısına sənətkar,
Bircə hoqqa yerinə neçə daş-qaş çıxardar.

Söz köhləni qızarkən... sənətkarın ürəyi,
Dodağını öpməkçün yırtar köksü, köynəyi.

Şairin ləl dodağı o zaman ki, açılar,
480 Yeddi göyün, Günəşin yaxasını parçalar.

Şairin ilham adlı cəsur bir atası var,
Dünyaya oğul kimi ər misralar bağışlar.

Şair qozbel fələyi qul eyləyər özünə,
Qulluqdan azad olar, özü köçsə sözünə.

Şairin xoş nəfəsi cana məhrəm, qəlbə yar,
Dilsizlərə dil verər, susmazları susdurar.

Hər gözələ can verən incə söz memarıdır,
Sən şairə vurul ki, o söz bəstəkarıdır.

Müştəri ulduzumu söz ovsununda şair?
485 Ya harutun sehrini qırıb pozan Zöhrədir?

Yəğmaladı bu kəndi qaçaq-quldur atlılar,
Şer adlanan bu dağı alçaqlar alçaltdılar.

Ağıl başımdan çıxır. Görün, sözbaz nə qədər...
Sözü abırdan salır şer, söz çeynəyənlər.

Mən qanım bahasına yetirdim can meyvəsi,
Neçin su qiymətinə satılsın könül səsi?

Dad əlindən, ey fələk, söylə, haçaq, bəs haçaq,
Beli kəmərli mərdlər zülmündən qurtulacaq?

Başda gəzdirilməli sənət düşdü ayağa,
490 Aç ayaqdan qandalı, döndər sözü bayrağa!

Qızıl üçün, zər üçün sinov gedən həriflər
Sənətin sikkəsini, görün nəyə veriblər?!

Qızıl sözü qızıla dəyişənlər alçalır,
Zülmətə işıq salan ləli verir, daş alır.

Sənətini bilənlər ən uca dağdan uca...
Bu işıqlı zirvəni kimlər alçaltdı bunca?

Sultanın qızılından zərli əba geyənlər,
Bir gün çörək yerinə dəmir çeynər, daş yeyər.

Fəqət, saf civə kimi zər qəmi çəkməyən kəs,
495 Diri qalar, sultanın qılıncım gəmirməz.

Madam ki, baldır sözün, ucuz satına onu sən,
Rəvamı söz şəhdini çibinlərə verəsən?

Sənə vəfalı yoxsa, umma hətta vəfanı,
Sormasalar, söyləmə hətta xoş bir duanı.

Şəriət elmi səni adlı-sanlı bilməsə,
Girişmə şairliyə, uyma yırtıcı nəfsə.

Şəriət elmindədir şairin şair gücü,
Söz de ki, kəmərindən nur alsın Cövza bürcü.

Şerin qaldırar səni, Sidrdə əyləşdirər,
500 Sənə ən uca qatda şahlıq, sultanlıq verər.

Hökmdarlıq şərəfi qazandırar söz sana,
Söz hakimi demişlər söz yaradan ozana.

Fələklərə ucalan bir söz yaratmayınca,
Fələk kimi süst olub oturma bikar, bica.

İsmətli ol əriyib baş əyən şamlar sayaq,
Gündüz təvazö əhli, gecələr ayıq-sayıq.

O zaman ki, ilhamın aşıb-daşar, qızışar,
Çərxin köhlən atını ram edərsən... yumşalar.

Hər şeri bəyənmə sən, yarat elə bir əfsun,
505 Dünyanın şah əsəri sənin qismətin olsun.

Lovğalanma, görsən də gövhəri əllərində,
Ondan da əlasını ara öz içərində.

Qızışma, sözü bir az ehtiyatla bəyən sən,
Sən ki, uca rütbəli söz yarada bilənsən.

Söz yolunun başına bayrağını dikənlər,
At çapar, Günəşi - top, Ayı - çövkən eləyər.

Sənətkar duymasa da nəfəsində od, şölə,
Azaltmaz sürətini hətta bir nəfəs belə.

Təfəkkür meydanında oddur şair ürəyi.
510 Yazığı gəlsə belə, dalda qoyar fələyi.

Cəbrail qanadını at edib çapar şair,
İsrafilin telindən yelpazə yapar şair.

Yol vermə ki, tarlanı tapdalasın hər yetən,
İnci düzdüyün sapın ucunu göstərmə sən.

Əncirin qol-budağı bomboş qalardı yayda,
Əncirye yən olsaydı bütün quşlar dünyada.

Bu şivənin, bu dilin mahir ovçusuyam mən,
Dəyər məni görməyə, şairlər xasıyam mən.

Hər hücrəyə köçürdüm şeri, şeriyyəti mən,
515 Çıxartdım meyxanədən, ucaltdım sənəti mən.

Birdəfəlik tullayıb zünnar ilə xirqəni,
Zahidlər, rahiblər də gəlib tapdılar məni.

İndi mən al-qırmızı bir qönçəyə bənzərəm,
Quzey rüzgarlarını durub burda gözlərəm.

Aşkarlasam, car çəksəm bakirə sözlərimi,
Səs salaram cahana qiyamət suru kimi.

Mən söz cadugəriyəm, tazə, köhnə hər nə var,
Mənim məftunum olar, mənim heyranım olar!

Bütün sehrbazları mat qoyur sehrim mənim!
520 Mələkləri aldadan əfsundu şerim mənim.

Gəncəm - Babilim mənim Harutu yandırmada,
Ən uzaq ulduzu da Zöhrəm nurlandırmada.

Zöhrəm söz dəyərini Mizan bürcündə ölçür,
Dilim - ruh aləminin lisanıdır, gözüdür.

Duz-çörəyim bilirəm öz cadugər şerimi,
Halal sehrim sındırır harutun hər sehrini.

Ürəyinin şəklidir Nizaminin sözləri,
Mənim halal sehrimlə daim canlı, dipdiri!

## GECƏNİN VƏSFİ VƏ KÖNÜLƏ DALMA

"Qalxanını at suya!" - dedi Günəş torpağa,
525 Özü də qalxanını atdı, qoydu qırağa.

Gördü can verir Günəş, cahan bir az daraldı,
Onun saralıb-solan süpərindən rəng aldı.

Qonşuları - ulduzlar yaraqsız görüb onu,
Dərhal qılınc çəkdilər vurmaq üçün boynunu.

Öküz bürcü - boynunda neçə muncuq, sədəf, zər
Yıxıldımı, üstünə xəncər çəkər Ay-Ülkər.

Əl qaldırıb, incitdi Ay öz süd nənəsini,
Gündüz zınqırovuyla gəzdi göy qübbəsini.

Qaranlıqdan qorxaraq nənə dayə əl atdı,
530 Torpaqdan fərəh dolu neçə məcun yaratdı.

Məsiha nəfəsindən şəfa saçdı Yer Aya,
Qara sevda oduna su səpdi duya-duya.

Sərin şərbət verdilər sanki təşnə xəstəyə,
Atdı qara sövdanı, Ay qalxdı yerdən göyə.

Xəstələnmiş qəmərdən boşaltdı bir ləyən qan,
Qara mürəkkəb kimi qaraldı bütün cahan.

Üzə çıxdı gecənin içindəki rəngləri,
Qəza söydü, faş etdi üzüqara kafəri.

Hər ləhzəsində cilvə, hər nəfəsində bir naz,
535 Neçə hoqqadan çıxdı gecə - köhnə hoqqabaz.

Ayın ağ rəndi üstə qızılgüllər tulladı,
Zöhrə öz qavalından gümüş pullar tulladı.

Mən belə bir gecədə yalqızam, çırağım yox,
Nalə çəkən bülbüləm, gülüstanım, bağım yox.

Ciyərimin qanını qatdım ürək sözümə,
Ürəyimin suyundan od çilədim üzümə.

Bir az götür-qoy etdim, öz qəlbimlə qonuşdum,
Bir öyüd kitabını andım, ardınca qoşdum.

Gizli bir hatif mənə dedi: - Möhtac olanda,
540 Borcu o qədər al ki, verməyə gücün çata.

Nə üçün su səpirsən pak, təmiz atəşinə?
Yel kimi yedək atı axı nə lazım sənə?

Dərd gətirən torpağı burax, girsin tabuta,
Şölə verən atəşi bəxş et parlaq yaquta.

Ox atma ki, hədəfin öz düşüncəndir sənin,
Atın öz ayağındır, qamçını az vur, çəkin!

Yaramaz bundan artıq qəflətdə əyləşəsən,
Canında su qalıbsa, könül qapısına səp.

Bir qəlb hekayəsi de, bu göy qübbə içində,
545 Xoş bir nəğmədi dünya təmiz, mavi biçimdə.

Qaçaq-quldura bənzər beş duyğudan uzaqlaş,
Səninki qəlb yoludur. Qəlbi dərk etməyə qoş.

Uçur Ərş aləminə bədəndən qurtulanlar,
Cəbrail qanadını taxır ruhuna onlar.

İki dünyanı atan tutur qəlb dünyasını,
Ruh aləmində tapır nemətlərin xasını.

Gərəksizdir bəlkə də, təbiətdə göz, qulaq,
Üzəvarı pərdəyə dustaq olmuşuq, dustaq.

Qönçə qulaqlarına pambıq tıxamısan ki...
550 Aldadar gözün səni, get, işə sal idrakı.

Bağda gülə, nərgizə neçin səcdə qılırsan?
Onlar sənin əlindən lələdağdılar, inan!

Hər cür eybəcərliyin aynasıdır gözlərin,
Od üstünə su tök ki, heç nə görə bilməsin.

İnsan təbiətində dəllallıq şakəri var,
Bəri başdan ən azı qırx yaşını nəqd umar.

Ancaq qırx yaşa çatmaq ən böyük məsuliyyət!
Səfər xərci gərəkdir, bir də zəhmət, məşəqqət.

Qırx illik dərslərini təkrar etməkdən əl çək.
555 Yetər, əfsun oxuma! İndi sənə dost gərək.

Ürək dostun az isə... bircəsini barı tap,
Qəmlərini silməyə bir könül qəmxarı tap.

Qəm yemə, qəmlərinə ortaq olanın varsa,
Dərdin boynunu sındır, bir həmdərd tapılarsa,

Ey dərdə ilişənlər, qəmə əsir düşənlər!
Sizə dost dəyanəti dayaq deyilmi məgər?

İki nəfəs tutuşsa, tapsalar bir-birini,
Bir anda min kədərin qırarlar dizlərini.

İlkin xoruz banında sübhün ətri saçılar,
560 İkincidə ulduzlar zanbaq-zanbaq açılar.

İkinci xoruz banı imdadına çatmasa,
Birinci rüsvay olar, batar qara bir yasa.

Bir iş görə bilməzsən təklikdə sən, ey naçar!
Ara, axtar, yarı tap, yaranı yar sağaldar.

İnan, nemət sayılmaz cahan səltənətləri,
Min qızılın bir dostdan üstün deyil dəyəri.

Yer üzündə hər kəsin dosta ehtiyacı var,
İllah, elə dosta ki, dar gündə dada çatar.

Mey dostları zay edər ayı, günü, həftəni,
565 Beləsindən ustün bil qapındakı cəftəni.

Salxım ürəyinin sıx şirəsini, şəhdini,
Torpağa dönməklə al bu dünyadan əhdini.

Bil ki, ərşin sultanı xəlq edərkən cahanı,
Çəkdi, qoşa yaratdı həm surəti, həm canı.

Nəhayətsiz, sonsuzdur Tanrının kəraməti,
Kərəm saçıb, can ilə birləşdirdi surəti.

Surət, can birliyindən qəlb aləmi doğuldu,
Xilafət mövqeyinə çatan xəlifə oldu.

Üstə sultan xütbəsi olan bu könül ki var,
570 Ruh və cisim aləmindən yaranıb açıq-aşkar.

Parlaqlığın könlünün Süheylindəndir əlbət,
Könül cocuqlarındır bu can ilə bu surət.

Dimağıma yetincə qəlbin səsi, sorağı,
Çırağıma töküldü sanki beynimin yağı.

Qulağımı dil sayıb, sükut etdim bu dəfə,
Canım hədəf kəsildi içimdəki hatifə.

Bu feyz ilə, qüdrətlə gücləndi nitqim, dilim,
Təbim qurtuldu qəmdən, şadlıqla doldu qəlbim.

Odlu göz bulağımdan buz suları qovanda,
575 Qəlbimin atəşilə qazan qaynadı canda.

Beş hissə - beş quldura qəzəb silləmi sıxdım,
Onlar aciz qaldılar, mən bir az güclü çıxdım.

Bir mənzil, iki mənzil at çapdım dincəlmədən,
İlk sıçrayışla çatdım könül qapısına mən.

Getdim canım dişimdə mən öz könlümə sarı,
Elə bil gecə yarı ömrüm də oldu yarı.

Ruh adlı mehrabımın önündəyəm mən yetim,
Bükülüb topa döndü mənim çövkən qamətim.

Qəddim ikiqat oldu, haram qatdım yuxuma,
580 Çövkənim topa döndü, ətəklərim yaxama.

Ayağım başım oldu, başım ayaqmı oldu?
Boyum topa bənzədi, çövkən sayaqmı oldu?

Əldən getdi iradəm, gözümdə gün qaraldı,
Yüzluk təkliyə döndü, təklik yüz şəkil aldı.

Səfərdaşlarım cahil, mən səfərdə xamtəhər,
Kimsəsizlik yamandır, qəriblik ondan betər.

Nə cür keçim qapıdan? Cığır hanı, yol hanı?
Bəlkə geri qayıdım, tərk edim bu məkanı?

Qorxudan nitqim batıb. Yolum dar bir keçiddi,
585 Fəqət cilovdan tutan eşqim dadıma yetdi.

Döydüm qapını. "Kimdir vaxtsız gələn?" sordular.
"Bir Adəm oğlu!" - dedim, -"Yer versəniz şad olar".

Cəld içəri çəkdilər: "Buyur, Tanrı bəndəsi!"
Qaldırdılar, yox oldu vücudumun pərdəsi.

Sarayın ürəyindən bir səs qopdu: - Nizami!
İçəri keç, bura gəl! - Bu səs necə səmimi.

O saray hərəminin dərhal məhrəmi oldum,
"Gəl lap içəri". - Getdim. Nurlu bir hücrə buldum.

Elə parlaq hücrə ki, çılçıraqban, müqəddəs,
590 Yaman gözlər onu heç görməsin, görə bilməz!

Bir əfsanə içində yeddi hekayət kimi,
Yeddi xəlifə burda əyləşiblər səmimi.

Ora fələk mülkündən daha böyük məmləkət,
Torpağına can verən küləkləri nə xoşbəxt!

Orda günorta şahı gəlib başda əyləşib,
Nəfəsabad diyarı bir azca istiləşib.

Qarşımızda qırmızı, qızıl donlu süvari,
Zəfər rəmzi bir gəncin ləl rəngində paltarı.

Şikar kəşfiyyatçısı, sərt, acıqlı bir cavan,
Yanında qara bir qul - bir az qəmgin, pərişan.

Pusquda ayıq-sayıq, mahir bir kəməndatan,
595 Gümüşdən zireh geyən mis bədənli pəhləvan.

Sanki onlar pərvanə, mənim könlüm şəm idi,
Onlar pərişan... bircə mənim könlüm cəm idi.

Mən öz qənaətimlə könül mehmanı oldum,
Yalnız könül şahının nemətinə vuruldum.

Mən könül ordusunun görüncə bayrağını,
Üz çevirdim aləmdən, atdım hər novrağını.

Öz dililə söylədi könül mənə: "Ey dilsiz!
600 Uçur dilək quşunu bu yuvadan, uçur tez!

Bu cür tüstü içində tutuşar odum məgər?
Mən duzam, xoşlayarmı hər duzu sütül ciyər?

Mənim kölgəm bu dəhrin sərvindən əzəmətli,
Addımlarım, ayağım onunkundan qüdrətli!

Xəzinəyəm, amma ki, harun kisəsində yox,
Səninlə olmasam da, uzaqda deyiləm çox,

Ona çox qulaq asdı mənim nitq bülbülüm,
Nəfəsini duyunca utandı, susdu könlüm.

Sıxılaraq baş əydim, bir müddət yerə baxdım,
605 Qulağıma ədəblə qulluq həlqəsi taxdım.

Ustad - könül xacəsi təzələdi əhdimi,
Fələklərə ucaldı sayəsində Nizami.

Qalmadı riyazətdən, pəhrizdən başqa yolum,
Dedim: mən də o pirdən riyazət dərsi alım.

**BİRİNCİ XƏLVƏT - QƏLBİN TƏRBİYƏSİ**

Ədəb dərsinə keçdi o riyazət öyrədən,
Məni doqquz fələyin çıxartdı çevrəsindən.

Yolumuz həlqə-həlqə, əyri-dolay, çən-duman,
Fəqət, mənim ustadım sapmadı öz yolundan.

Elə bir yerə çatdı yolumuzun axırı,
610 Tamam arxada qaldı onun dolambacları.

Sözü daşdan keçən pir bizimçin qürur idi,
Tanrımız olmasa da Tanrıdan bir nur idi.

O pir iki cahanda mənə gözətçi, hami!
Yoxsa çəkib dərdimi, qayğıma qalardımı?

İşlərimi yoluna qoymasa da bu dəm o,
Bilirəm, şəfqətini əsirgəməz məndən o.

Mənim tək ədəbsizə ədəb öyrədən o pir,
Az qala qulum oldu, mənalıdır bu tədbir.

Mənim kimi qulundan bezib üz döndərmədi,
615 Qənimət bildi bəlkə bir yoxsulla ülfəti.

Züleyxanın vətəni Misirdənmi o, gəldi?
Yusifini quyudan çıxarmaqla yüksəldi!

Uyğudan qapanarkən gecənin qara gözü,
Yandı sübhün çırağı, işıqlandı Yer üzü.

Doğdu Günəş, Fələyin nəhənk çırağı yandı,
Gecənin qaranlığı danənginə boyandı.

Mənim əlimdən tutdu əli çıraqlı ustad,
Gəlib çatdıq bir bağın ətəyinə xeyli şad.

Ətəyimi arıtdı kədər tikanlarından,
620 Gülə qərq etdi məni gül nəfəsli o insan.

Güldüm yaşıl çöldəki lalə kimi, zər kimi,
Yüz yerdən parçalandı paltarım güllər kimi.

Canını təslim etdi canıma al lalələr,
Yaz yanaşdı, bağladı belimə güldən kəmər.

Gah qan rənginə düşdüm al qırmızı mey kimi,
Gah da yırtdım gül kimi köynəyimi - qönçəmi.

Tez budaqdan budağa, güldən gülə can atdım,
Bir qaynağa qovuşub, su içməkdi muradım.

Mənim eşq bayrağım bənd olunca bir yerə,
625 Vəfa qoxusu gəldi başqa bir yandan yenə.

Açıq deyim: bir yarın rayihəsi, nəsimi,
Mənə ürək, can verdi İsa nəfəsi kimi.

Fırlatdı bir tərəfə mindiyim kəcavəni,
Səhər rüzgarlarına yar-yoldaş etdi məni.

"En aşağı! - Söylədi, - Özündən çox vurma dəm,
Enməsən, endirərəm səni mənlik təxtindən!»

O xəyal dənizində mən ki, bir gəmi oldum,
O cənnət havasında cənnət sakini oldum.

Orda axır sərin su, burda od düşüb cana,
630 İrmağın qıyısına at sürdüm yana-yana.

Qarşımdakı saf bulaq Günəşdən daha parlaq,
Xızr yuxusunda da görməmiş bu cür bulaq.

Nərgizlər - oyaq gözlü, yasəmənlər yatağı
Baxsan, uyudar səni günün günortaçağı.

Qaliyə iyli behişt bu bağın qulu oldu,
Fələklər dairəsi onun həddi-hüdudu!

Güllər qərar tutublar yarpaqlar yaxasında,
Ətəkləri sürünür tikanlar arasında.

635 Tulkü vermiş tikana dərisinin rəngini,
Çeyranlar çiçəklərə göbəyinin mişkini.

Şəkər gülüşü güldən xəcalət çəkən tutu,
Məst olub, yaşıllığı qanadlarıyla tutub.

Şehlər dadlı süd kimi damır təzə otlardan,
O südün şəkərilə məst olub ahu, ceyran.

Gəlin otağı kimi süslü gül yuvasında,
Ceyranlar gül ovlayır, böcəklər salır səda.

Necə quçaqlaşıblar, görün, xeyri gülləri,
Gül rəngli ənbər üçün yelpik olub hər biri.

Nərgizlər baxanların gözlərinin sürməsi,
640 İlanları kor edər otun zümrüd şöləsi.

Qafiyələr bəstələr orda qumruyla bülbül,
Ağlı başdan çıxarar yasəmənlə qızılgül.

İsa dilli, nisgilli, ömrü birgünlük süsən,
Sübhə müjdə verməkdə Musanın pak əlindən.

O qədər fəryad qıldı göyərçin dönə-dönə,
Axır saldı göyü də öz göyərçin rənginə.

Sultan söyüdlərinin müşk ətirli hüsnünə,
Rüzgar ümid əlilə misralar qoşur yenə.

Gah bahar gəlirdi ki, salamlasın hər yanı,
645 Gah gül təşəkkür ilə dindirirdi tikanı.

Türkə bənzər yasəmən çöldə qurub ağ çadır,
Çadırın ayparası Sürəyyaya nur saçır.

Lalə namaz qılmağa gəlib atəşkədəyə,
Məcus hindlilər kimi əlləri qalxıb göyə.

Lalənin bağrı qara - ərəb yavrusu kimi,
Türk yasəmən Yəməndə Süheyl ulduzu kimi!

Sular yumşaqlığıyla Qaqum xəzinə bənzər.
Yaşıl otla - Sincabla, qəribədir, cüt gəzər.

Bağın darvazasında çut bayraq: qızıl, sarı,
650 Qapılar pəncərətək açılmış göyə san.

Aya, ulduza çatan uca budaqlar ki var,
İşıqlıqdan kölgəyə qızıl pullar tullayar.

Günəşin qulağına kölgə nəsə pıçıldar,
Təsbeh çəkən suların əlində qum canlanar.

Sünbülün busəsindən yaralanmış nəstərən,
Gül dodağı incimiş qönçənin kirpiyindən.

Xeyrinin ox qabında daha qalnamış tikan,
İstər qalxana dönsün, istər diləsin aman.

Titrəyir salxım söyüd oxla vurulmuş kimi,
Lalənin manqalından qalxan dumanmı, çənmi?

Sanki dalğalı çəmən qanadlanıb qalxacaq,
Yasəmən təzəlikdən damla damla axacaq.

Burda şəkər qamışı təbəssüm saçdı yenə,
Sarı güllər boyandı qırmızı ləl rənginə.

Hələ sərxoş çiçəklər, sərsəri çöl gülləri...
Gül ətrilə açılıb yellərin şən dilləri.

Turuncun yarpağından yaşıl görünən səma,
Əlində qızıl narınc birdən çıxdı qarşıma.

Fələklər bayrağını qızıl şəfəqlə süslər,
660 Yaşıl bahar güləşib, onu yıxmaqmı istər?

Bu göyərən aləmin hər gülü, hər çiçəyi,
Sanki yerin canıdır, göylərin də ürəyi.

Yaşılbaş dan ulduzu doğar hər gün dan üzü,
"Daim yaşıl qalasan, ey bağ!" - Söylər bu sözü.

Gəlib burdan keçəndə yaşıllığını lək-lək,
Girov qoymuşdu sanki yaqutu çalan fələk.

Günəşin qaynağından işıq almış hər bulaq,
Cənnət hurilərinin gözlərindən də parlaq.

Otlar namaz qılarkən seldən əl suyu almış,
665 Qüslə görə şükr edib, qalxıb bir boy ucalmış.

Süleymanın ətrini alınca neçə güldən,
Quşlar Davud səsilə nəğmə söylər könüldən.

Vurulmuş qırqovulun almaq üçün qanını,
Çil kəklik cırmaqlayır sərvin ağ dabanını.

Bağ bülbülə əmr etdi qarğayaraq qarğanı:
- Gedin, alın canını, halaldır onun qanı!

Atıb getdiyi gündən bayquş bu gözəl yeri,
Onun alnına yazdı fələk viranələri.

Əsdi Süheyl rüzgarı Yəmən yellərilə bir,
670 Bomboz, yanıq çöllərə gətirdilər rəng, ətir.

Sürətlə qaçdığından yandı lalənin bağrı,
Sinəsinə dağ çəkdi ürək çırpıntıları.

Surətpərəst şümşadın kölgəsi əl-qol atdı,
Az qala tər lalənin ciyərini çıxatdı.

Gümüş dırnaqlarıyla səhər üzlü yasəmən
Titələri silmişdi gecənin gözlərindən.

Qızıl kəndirli Yusif quyu qazdı mübarək,
Quyusu - yasəmənin çənəsindəki çökək.

Yəhudi çalmasıtək saraldı yerin üzü,
675 Su göstərdi Musa tək işıqlı əl möcüzü.

O çeşmənin suyundan məlhəm düzəltdi torpaq.
Nuş etdiyi nə varsa, geri qaytardı ancaq.

Səhərin aydınlığı sığmadı göylə yerə,
Kölgəni gəzdirməyi tapşırdılar yellərə.

Gunəşin dodağını sancdı kölgə, axdı qan,
Yel daradı, şeh düşdü söyüd yarpaqlarından.

Orman qımıldanarkən işıq kölgəni qucdu,
İrmağın yaxasında rənglər qol-qanad açdı.

Mən tikan arayarkən nə tapdım: ud ağacı,
680 Udla dolu manqaldı gül şaxəsi, gül tacı.

Çiçək ovçu, gül boynu - bülbüllərin minbəri,
Bənövşənin telləri - qızılgülün kəməri.

Quşların cəh-cəhləri Davud səsindən də xoş.
Güllər Nizamidən çox şəkər, qənd səpən olmuş.

## BİRİNCİ XƏLVƏTİN SƏMƏRƏSİ

Külək öz niqabını atınca bir kənara,
Qəlbim, ustadım mənim könül verdi bir yara.

Gördüm bir nigarı ki, nəfəsi gül qoxulu,
Özü qəndə qarışmış, gülüşü şəkər dolu.

685 O fitnəli, ay üzlü, ipək yaşmaqlı rəna,
Gözəlliyilə Ayın od vurdu xırmanına.

Zülfunün qıvrımları enmiş kəmərinədək,
Başdan-ayağa göyçək, nazlı, duzlu, mübarək.

Görüb onu, duz kimi yalamaq istər hamı,
Duzlu göz yaşı tökər anıb duzlu dad-tamı.

Qarışınca şəkərə gül dodaqların duzu,
Dodaqların şəkəri suya düşdü, doğrusu.

Şəkər bağında ondan tutuquşu utanar,
Tutuquşu başından gözəl, ağ çənəsi var.

Çənəsinin yumrusu tazə narınmca bənzər,
690 Turunc dadlı buxağı bəlkə gümüş, bəlkə zər.

Sərxoşları ayıldan bağ gülütək sehri var,
Dostun verdiyi meytək tövbələri sındırar.

Təbərxuntək, innabtək qan tökən gül dodaqlar,
Cana qıyar, şəkərin ağ başını bıçaqlar.

Qızılgüldür, yaşıldır, fəqət, qənd qamışından,
Noğulmu, nabatmıdır? Yox, şərbət sanar dadan.

Ud ağacına oxşar xalı ciyər yandırar,
Gündüzün sədəfində qaliyə əzən nigar!

Xalının həsrətilə yandı aşkar, gizlincə,
695 Ay özü göy üzündə xala döndü bir gecə.

Onun ləli gecəni Ay təkin nurlandırar,
Ala gözləri bizi Günəşdən çox yandırar.

Ürəklərin karvanı neçə fərsəng uzanar,
Fəqət, bu şüa yollar onun ağzı kimi dar.

Məgər o daşürəkli mənə zərrəcə yandı?
Ciyərimin üstündə ürəyim parçalandı!

Bal dodaqları sözmü, ya gülüş səpir onun?
Hüsnü şüalar saçır, hər qəmzəsi bir əfsun.

İnci qutusu kimi qapanmışdı dar ağzı,
700 Aralansa dodaqlar, qənd, şəkər satar ağzı.

O hoqqanı, o dürrü elə ki, gördü eşqim,
Elə sehrləndi ki, bu sehri yapmaz heç kim.

Ağır tay kimi atdım parıltıya uymağı,
Ruhum boynumdan açdı hər cür xaltanı, bağı.

O qənirsiz gözələ baxmağa taqət hanı?
Başımdan aşan gördüm dirilik bulağını,

Ağılmı getdi əldən, divmi göründü gözə?
Dəmir qandal vuruldu sanki biləyimizə.

Məgər mey nəşəsilə kədəri silmək olar?
705 Günəşin nur qaynağı məgər gillə suvanar?

Dərdlilərin yoldaşı, könüldaşı - dərd, açı,
Şərab düşkünlərinin şərabdadır əlacı.

Ey sinəmə çəkdiyin dağdan xəbərsiz nigar,
Sənindir ruhumdakı bu tazə bağ, bu bahar.

Mənim gözlərim çıraq, sən üstümdə çıraqban,
Sözüm - bağdı, göz yaşım - bağı suvaran bağban.

Pərdə dalında qalan bir gözəlin siması,
Bu gün mənimçün "İxlas" surəsinin aynası.

Bu dolaşıq kələfin ucu tapılanacan,
710 Başım dizim üstündə - çox əyləşdim nigaran.

Yəqinlik yolu seçdim yara yetməkdən ötrü,
Sən də mənim getdiyim yolla get, ey dost, yürü!

Yox, bu pərdəyə yadsan, dayan, şair yürüsün,
Nizaminin işini elə Nizami görsün.

## İKİNCİ XƏLVƏT - GECƏ GÖRÜŞÜ

Könlüm - ustadım mənim qədəh vurmaq istədi,
Bir neçə tay-tuşuna "Gəlin, dərdləşək!" dedi.

Səhər kimi işıqlı gecənin masasında,
Vardı arzu edilən hər cürə nemət, qida.

İlk baharı andıran məclis, asudə işrət,
715 Nə rüzgardan çəkinmə, nə də bir ayrı möhnət.

Pəncərədən girən meh buxar qoxusu saçır,
Darda qalan Yusifin köynəyindən bəhs açır.

Gecə şahı öldürmüş gecə bəkçilərini,
Eşqin şəkəri üstə çırpınan böcəklərmi?

Sazçalanlar pərdədə rəng arar, ahəng arar,
Keçir vəfa bəhsinə pərdə dalındakılar.

Yerə dəymək eşqilə Süheylin qədəmləri
Dürr üstünə ləl səpir, şeh üstünə mirvari.

Yanır ciyərin şamı - yanır şamın ciyəri,
720 Atəşin ürəyitək ürəyin atəşləri.

Manqalda ud ağacı məclisi nurlandırır,
Şəkər saçır... şəkər də udu alovlandırır.

Gül suyu şüşəsindən saçır ətri, şəkəri,
Ağ süfrəyə zər tökür şamın al şölələri.

Şərab noğuldan öpüş almaq üçün biqərar
Noğul ağzından badam, gözündən şəkər saçar.

Şəkər dodaq, badam göz bir-birinin məhrəmi
Eşq oyunu qızışır Mərrix ilə Zöhrənin.

Qulaq qapılarına çatır şirin vədələr,
725 Gülüş gül dodaqlardan dirilik suyu istər.

Tülkünün göbək xəzi altındadır qaplanın,
Aslan kəmər eyləmiş göbəyini ceyranın.

Aşiqin yaxasında məşuqənin əlləri,
Rəqs edənlər məclisə saçır dürrü, gövhəri.

Şamlar əli qədəhli saqilərmi, dayanmış,
Taslar mey aludəsi, pərvanələr bayılmış.

Uyğu nəyə bənzəyir? Qanadsız pərvanəyə,
Təşəkkürlə baş əyən şamlar dönüb şöləyə.

Əlindəki sazıyla Zöhrə məclisə zivər,
730 Dürüst bir ahəng ilə mizrab sındıran əllər.

Məclis qızıb, qeyb olub uyğusuzluq xumarı,
Bir-birindən nur alır məhəbbət çıraqları.

O şeyi ki, təklikdə heç bir kəs tapa bilməz,
Bircə nəfəsdə tapır onu iki həmnəfəs.

Bir-birinə verirlər sevgililər mükafat,
Bədən bədənə peşkəş, könül könülə sovqat.

O bəzənmiş hüçrədən yoxluq yükünü guya,
Atmışlar ölüm adlı tamam başqa dünyaya.

Şadlıq quşu naməni qanadına bağladı,
735 Sürəyyanın qırıldı yeddi qolu, qanadı.

Dan quşunun - xoruzun səsi atəş dolusu,
Məhəbbət quşlarının ciyərinə səpdi su.

Quşcuğazlar mürgülü... xoşdur uyğunun dadı,
Ayın əli, göylərin ayaqları bağlıdı.

Yabancılar qapıdan girə bilməz içəri,
Pərilərin telləri - divanələr zənciri.

Müştərinin ürəyi qəm həlqəsində çarpar,
O, üzük həlqəsindən bir az da xırdaca, dar.

Cinlər büdrəyən kəsə hücum etdikləri tək,
740 Hər aşiqin ağlını başdan alır bir mələk.

Tikanları götürür kirpik ucunda onlar,
Könül qapılarında yasəmənlik salanlar...

Xəttü xalı neyşəkər, hüsnü - könül meyvəsi,
Cismi bəlkə də güldan, özü - bir gül dəstəsi.

Fındıq ağzı şəkər, qənd, badam gözləri xumar,
İnnabı püstəsinin üstə incə xətmi var?

Saçlarının gecəsi "halal sehri"nə bənddi,
Babil sehri, hind xalı ovsunlamış bu xətti.

Camalları, xalları, incə qəmzələrilə,
745 Döndərdilər aləmi Hindistana, Babilə.

Gözüm baxdı gözünə... bir təbəssüm qazandı,
Ürəyim bir cüt gözün başına çox dolandı.

İti dilli qəmzəsi, gör, tikanmı, ya neştər?
Saçlarının düyünü bizim işlərə bənzər.

Hər kamana qoymamış qəmzəsinin oxunu,
Bir baxışla öldürür aşiqlərin çoxunu.

Qanad verir ürəyə sanki İsa nəfəsi,
Ürəyin torpağında abi-həyat çeşməsi.

Ətri yasəmən kimi bədənində, əynində,
750 Yaşmağını Ay kimi, daşıyır öz çiynində.

Gül üzü, al dodağı şəkər, badam səpmədə,
Bəlkə pənah aparır güllər şəkərə, qəndə.

Həyat verdi, can verdi hər baxışı cahana,
Hər kirpiyi can üçün dönüb oldu bütxana.

Gümüş tək ağ üzündə ətir saçır qara tel,
Müşkün özü ətrini ondan alır elə bil.

Gümüş buxaq, ağ buxaq kəmər bağladı tərdən,
Göy qurşağı yarandı Günəş yanında birdən.

Zülf - İbrahim, yanaqlar - İbrahim atəşləri,
755 Göz - İsmail, kirpiklər - onun qətl xəncəri.

Yanağının atəşi bir dəstə reyhan oldu,
Nərgizinin üstündə xəncər də xəndan oldu.

Mey tək yandırar səni bir busə versə əgər,
Dodağı ölgünləri İsa kimi dirildər.

Onun tərli yanağı şehi ağappaq nəsrin,
Ay camalı nur saçır göydə Sürəyya təkin.

Necə qəşəng açılıb hurinin ağ yaxası,
Səhər naməsidirmi nur möhürü - tuğrası?

Tanrı ərənlərinin hümməti, xalqın canı,
760 O nurun divanəsi, o işığın qurbanı.

Ağız susur... qaşlarsa doymur incə söhbətdən,
Gözlər qonuşur... çünki dil tutulub heyrətdən.

Ağ süfrəni, gör, necə gül rəngli mey bəzəyir.
Qızıl, gümüş qədəhlər nərgizlərə bənzəyir.

Əqlin başı aylanır bu dairə içində,
Əldən gedir ürəyin dözümü də, gücü də.

Gülməkdən vaxt tapmayan gül ağızlar qiyamət
-Bircə ah da çəkməyə qalmayıb daha taqət.

Məğlub olub... başını səbr aşağı saldı,
765 Fitnə iki ahəngin arasındamı qaldı?

Sədəfli saz ucaltdı Davudi nəğməsini,
Nəql etdi Mahmud ilə Ayaz hekayəsini.

Nizaminin şeri də bu dəm qənd, şəkər saçdı,
Qəzəlxan ceyranların dillərində dolaşdı.

## İKİNCİ XƏLVƏTİN SƏMƏRƏSİ

Əzəlin toxuduğu bir xəlçənin üstündə,
Ömürdən ötən çağlar yenə də öz hökmündə.

Könül mənim şerimlə salam verir qulağa,
Gözlər alır salamı, canla dodaq-dodağa.

Türk gözəli gülərkən qəndin qəlbi daralır,
770 Ceyranların gözündən gözlər sürməni alır.

Kətan geyinib gəlir ay camallı türk yarım,
Sökülmüş kətan kimi çatlayır dodaqlarım.

Gecənin sifətinə işıq silləsi çırpan,
Ay səmada sübhədək aydınlığa pasiban.

Bir az xəfif dəysəydi qəmzəsinin oxları,
Can düşüb qədəminə, öpərdi torpaqları.

İşığından islandı şamın ağ kirpikləri,
Qısqanclıqdan ağardı çırağın bəbəkləri.

Sitəmlər ki, etmişdi cövr ilə, cəfa ilə,
775 Təbərrik bildi könül, götürdü vəfa ilə.

Mən - su arxı, o - çəmən, mən - yaşıllıq,o - Günəş.
Mən yuduğum paltarı qurudurdu o atəş.

Bəhrəsindən daddığım o gecə, bostanında,
Nəyi var, bilmişəmsə, günahkaram yanında.

O yeni doğmuş Ayın şəfəqdəndi kəməri,
Bütün məftunlarından gizlətmişdi bəhəri.

Sən demə, məftununun məftunu olubmuş o,
Mənim eşqim - qığılcım, onunku - məşəl, alov!

Deyirdik sübh açılsın bir az gec, bir az yavaş,
780 Bu gecə pərdəmizə gündüz od vurmasın kaş.

Sağ çıxa bilsəydik, ah, bu gecədən gündüzə,
Bəlkə qiyamətəcən yaşayardıq göz-gözə.

O gündüzdən işıqlı gecə - bütöv bir həyat,
Yatsam, yuxumda belə bir də görmərəm, heyhat.

Mənim o gecədən xoş gecəm olmayıb hələ,
Elə gözəl bir gecə bir də düşərmi ələ?

O gecəni bir daha görə bilmək üçün, ah,
Əl qaldırıb göylərə deyirəm: Allah, Allah!

Yox, qaranlıq deyildi, aydın gündü o gecə,
785 Təkcə merac gecəsi tay olar ona, məncə.

Fələyin ləli üçün "Günəş!" deyə mələr Ay,
O gecənin dərdindən dirilər Ay, ölər Ay.

Neçin gecə gündüzə özünü düşmən sayır?
Bəlkə min gün içində o gecəni arayır!

Mən hər şeydən asudə. Bir də nə gördüm öndə:
Qılınc vurur başına, səhər al qan içində!

Yandırdı kirpiyimi qaynar Günəş, inanın,
Göz yaşlarım bürüdü könlümün eyvanını.

Yağış Günün qırmızı köynəyini yudu ki,
790 Pak olsun əl qaldırıb salamlarkən göyləri.

Günəşin yaratdığı hövzə sanma lal durub,
Sənin və mənim kimi min-min sənək sındırıb.

Çərx gümüşlə bəzəmiş ulduzların dəstini,
Açmış altun Günəşin qızıl səhifəsini.

Bir az yüngül oyandı ağır yatan dan yeri,
Qaranlığın qanını tökdü qızıl xəncəri.

Mən dözmədim şəfəqin yürüşü qarşısında,
Qalxan etdim canımı bu qılınca, bu oda.

Çaydan sıçradı səhər - o təşnələr düşməni,
795 Gecənin körpüsünü sökdü, öldürdü məni.

Bir səs gəldi könlümün təzə xərabəsindən:
"Mükafatım, ey səhər, söylə, budurmu səndən?

Bundan bir azca əvvəl yarım mənə yar idi,
Qaranlığa nur saçan qızıl şamım var idi.

Hanı o şam, o gecə? Hara qol-qanad açdı?
Uzaqlaşdı, dağ aşdı, guya heç olmamışdı.

Yemiş sənin balını, sanc onu neştərinlə,
Pambığına od vur, od, yol tükünü, ver yelə!

Ağıllandır xamların, qorxma, olsan da qatil,
800 Yanmışları yandırmaq əlində çətin deyil".

Göz yaşımı görüncə gün məni qucaqladı,
Şəfəq və şəfqət saçdı, qan-yaş töküb ağladı.

Mənim ahımla yandı o dan yeri, o xırman,
Günəşin od qaynağı dondu göz yaşlarımdan.

Fələk zəhər də verdi, ümid də verdi mənə,
Gecə ilanı muncuq, Günəş gətirdi mənə.

Səhərin gözlərindən işıq aldım, nur aldım,
Çox şeydən xəbər tutdum, yenə bixəbər qaldım.

Hər kim ayaqlaşırsa, bu yürüyən fələklə,
805 Deməк, qucur aləmi səhər boyda ürəklə.

Aylı gecələrindən sən ey xəcil qaldığım,
Günduzünün yanında üzü qara olduğum!

O gecəni vəsf edib mən ki qələm çalmışam,
Ondan ədəb, mərifət, ondan ibrət almışam.

Yalqızlıq pərdəsinin qara rəngidir gecə,
O zülmətdə bircə nur idrak nurudu, məncə.

Manqalda ud ağacı gül suyuyla yanaşı,
Biri xəstə naləsi, o biri də göz yaşı.

Süfrədəki nemətlər, bəxtimdəki məlakə,
810 O Qədr gecəsinin xəyal nurudu bəlkə.

Bu göy qübbə altında, de, kimlərdir ucalan?
O qaranlıq pərdəyə, o sirrə vaqif olan?

Bizə pərvanəliyi öyrədən gündən bəri,
Həmən şamdan yaxşı şam yandırıbmı dan yeri?

Çalış sən də o şamdan bir azca nur alasan,
Sən də Nizami kimi dönüb çıraq olasan.

**Birinci söhbət**

**ADƏMİN YARADILMASINA DAİR**

O zamanlar ki, eşqə səcdə qılan yox idi,
Yoxluq içində varlıq səssiz bir çocuq idi.

Lakin gəldi o xoşbəxt yoxluqdan bu varlığa,
815 Bəşər darvazasını açdı bəxtiyarlığa.

Pərilərin sonuncu çocuğuydu bu bəndə,
İnsan oğullarının ilkiydi Yer üzündə!

Tanrıya bayraq dikib ilk xəlifəsi oldu,
Bayraq kimi ensə də, bir də qalxıb doğruldu.

"Adəmə ad öyrətdim, torpağını qırx günə,
Yoğurdum!" - ayə gəldi təkcə Adəm şəninə.

Gözləri gah bulaşıq, gah tərtəmiz bir aləm,
Həm qızıldı, həm sərraf, həm məhək daşı Adəm.

Göydə yaşayanların ən gözəli, ən xası,
820 Təptəzə yer əhlinin o idi tək aynası.

Canının şəkli bildi insanlıq o igidi,
Yeddi səma qolunun qızıl bilərziyidi.

Çıxdı iki beşikdən - qovuşdu cism ilə can,
İki cövhər məğzini mənimsədi ilk İnsan.

Odur zindan əhlinin mükafatı, xələti,
Ruh əhlinin saqisi, sədri, ilham qüvvəti.

Bu xilqətin siniri, səddi - onun bazarı,
Varlığında Allahın saflıq, qüdrət axarı.

O hələ süd qoxulu qırx günlük bir çocuqkən,
825 Dil açdı, dərs öyrəndi qırx yaşlı müdriklərdən.

Eşqin gözəl yazısı alnında şölələndi,
Cənnətin qucağında bir gülüstandır indi.

Uzaq görən ən parlaq gözdən çıraq aldı o,
Ən uca bir ağaca qondu, yuva saldı o.

Ondan dən alsın deyə cənnət quşların gəldi,
Şərəfi qarşısında bütün başlar əyildi.

Tamah saldı kərəmin bəxş etdiyi danəyə,
Atdı ev-eşiyini, cənnətə vida deyə.

Şükür sənə, ey Tanrı, tələdə saralır dən,
830 Dəyərdimi bu şükrə? Dən qoyulmuşdu qəsdən.

Tanrıya dualardan, diləklərdən yaranmış,
Səcdəsinə az qala cümlə cahan qapanmış.

Adəmin darvazası kimə qiblə olmadı?
Yalnız bircə divanə - İblis səcdə qılmadı.

Səkkiz cənnət bağından üstünə gül səpildi,
Bütün güllərə ləçək, iblisə dağ çəkildi.

Lakin, ey insan oğlu! Adəm gülmədi sənsiz,
Cənnətdə bir rahatlıq, inan, bilmədi sənsiz.

Cənnətdə hökm etməyə tükənmişdi dözümü,
835 Dərd çəkirdi ki, sən də görəsən Yer üzünü.

Qəlbində övlad eşqi, övlad - onun sabahı.
Bir arpaya dəyməzdi buğda yemək günahı.

Ciyərini dağladı buğdadan gələn ağrı,
Buğda dənəsi kimi iki böləndü bağrı.

Buğda kimi lüt-üryan, gözü-könlü qubardı,
Nə torpağı, nə daşı, nə də ruzusu vardı.

Bildi: şuma düşməsə çatar əhdinə haçaq?
Dəyirmana girməsə, üzü ağ olmayacaq.

Buğda yeyincə, üzü buğda rəngini aldı,
840 Bərk utandı, ay kimi, saman kimi saraldı.

Buğda qara torpağı yarıb çıxırsa necə,
Adəm sənin uğrunda cəbrə dözdü eləcə.

Deyərsiz bir buğdaya elə ki, tamah saldı,
Özü də buğda kimi çıplaq, lüt-üryan qaldı.

İblisin ucbatından uğradığı həqarət,
Buğdanın da bağrını ikiyə böldü, əlbət.

Quru torpaqda bitən sarı buğda, o gövhər,
Ağılsızlıq, sıxıntı rəmzi deyilmi məgər?

İnsan buğda yeməklə bir az bəlkə saz oldu,
845 Heyhat, buğda əslində nəhəng bir ağız oldu.

Can ipinin ucunu itirmiş, ey zavallı,
Bircə buğda dənəsi səni tələyə saldı.

Öz arpa çörəyini qənaətlə ye ki, sən,
Adəm düşən buğdanın toruna düşməyəsən.

Yaraşarmı sənə heç iblis felinə düşmək?
Sən bir sultan şirisən, hürmə qapıda it tək!

Əgər tövbə etməsən Adəm kimi ürəkdən,
Alnındakı ləkəni silə bilməyəcəksən.

Suçun varsa, üzr istə. Paka çıx Adəm kimi,
850 Adəm üzr istəməklə, de, təmizlənmədimi?

O gündən ki, meylini bir danəyə saldı o,
Bu həyat tarlasının əkinçisi oldu o.

Adəm, gör, hara gəldi bir buğda həvəsilə,
Cənnətdən hara düşdü? Bu dünya tələsinə!

Solmuş gülə bəxş etdi yağışlı yaz buludu,
Sərəndibə köç edib, ismət çadırı qurdu.

Günahı ucbatından qaçdı xeyli uzağa,
O, üz qaralığını tökdü qara torpağa.

Nilçi oldu, gözündə nil rəngində asiman,
855 Hindistanda çəmənlər bitdi göz yaşlarından.

Fələk vuran ləkəni ovcundan silənədək,
Qarşısmda göyərdi nil rəngində ot, çiçək.

Ay kimi şölə saldı, Xəta türkünə döndü,
Papağının altında Xəta zülfü göründü.

Bir yüngüllük gətirdi tövbə dağ cüssəsinə,
Yer üzündə Tanrının döndü xəlifəsinə.

Vəfa toxumu əkdi ağıl tarlasında o,
Bəhrəsini vəqf etdi, bizə verdi sonda o.

Cənnət xəzinəçisi nə vermişdisə, ona,
860 Altıqapılı evdə qoydu doqquz xurcuna.

Buyur, nuş et, bəyənsən hansı gözəl neməti,
Biçmək sənin qismətin, əkmək onun qisməti.

Ud inlər ki, yayılsın manqalın rayihəsi,
Eşşək cəfa çəkər ki, səfa görsün yiyəsi.

Bəli, sənin işini səndən öncə gördülər,
Tanrının lütfüylə sən yüksəldin, ey bixəbər.

Dön bahar rüzgarına, çiçək gəmisi ol ki,
Bostandan qovmasınlar səni tikanlar təki.

Qafil olma ki, ömrün yetincə son baharı,
865 Qəlbə soyuqluq gəlir, cana atəş azarı.

Aslan ürəyin yoxsa, yoldan çəkilməlisən,
Demək, aslan deyilsən, bir aslan heykəlisən.

Saray qapılarında seyr elə heykəl şiri,
Yüz zopa vursan belə, qımıldanmaz heç biri.

Fələk xələti geymək sənə yaraşır məgər?
Ey torpaq oğlu, yalnız torpaq eybini örtər.

Sənin tale ulduzun çoxdan sönüb, ey bədbəxt!
Özün yumaq olmusan, dərdin, qəmin yekə dağ.

Dustaq deyilsən məgər? Bəs nədən ulu göylər,
870 Min şəhəri tutanı bir şəhərə bənd edər?

Sən də bu göylər kimi beli bağlı ol müdam,
Fələklərlə ayaqlaş, irəli qaçma ondan!

Od kimi iti getmək, yanıb kül olmaq asan,
Bəxtəvərlik odur ki, yolda yorulmayasan.

Sakit axan su kimi yaşamağı seç peşə,
Yüngül suyun qiyməti ağır olur həmişə.

Bədən gözəllik tapır yalnız çevikliyilə,
Ruhun yüngüllüyündən can dönür qızılgülə.

Yungül əsən rüzgarlar dolaşır hər iqlimi,
875 Ağırlar öz yerində qalır Qaf dağı kimi.

Tikan olma, aldanma qızılgülün hüsnünə,
Önə bax, bənövşə tək baş əymə öz köksünə.

Divarları aynalı bu otağın içində
Tək özünü görürsən, hər şeyin gözü səndə.

Tək özünü görürsən sən bu ayna dünyada,
Varlıqda yox kimisən, ömrü vermisən bada.

Nə qədər hüdudlara, hədlərə çatsan da sən,
Varlıqda yox kimisən, lüt-üryansan əzəldən.

Əgər kədər duzundan azacıq dadmış olsan,
880 Bu duzsuz işlərindən sən əl çəkərsən, inan!

Əl çək zülümdən. Uğraş vəfa yurduna birbaş,
Yanaş ulu Tanrıya, alçaqlardan uzaqlaş!

Tanrı gözəlliyini görüb, çirkinliyi at,
Uzaqlaşıb özündən, Tanrı məqamına çat.

Üzr istəsən, suçundan birdəfəlik əl çəksən,
Dada yetən Tanrıdan lütflər görəcəksən.

## ÜMİDSİZ PADŞAHIN BAĞIŞLANMASI DASTANI

Adil şah yuxusunda zalim bir soltan gördü,
Soruşdu: - Sənə Tanrı hansı cəzanı verdi?

Gündüzlər qan tökmüsən, ev yıxıb, zülm etmisən,
885 Gecə hansı əzabı çəkdin əvəzində sən?

Zalim cavab verdi ki: - Ömrüm çatarkən sona,
Göz gəzdirdim cahana, pənah gətirdim ona.

Görüm düşkün çağımda yol göstərən kimim var?
Tanrı mərhəmətinə kim məni ulaşdırar?

Baxıb gördüm heç kəsin mənə bir şəfqəti yox,
Hiddəti, nifrəti çox, lütfü, mərhəməti yox.

Söyüd kimi titrədim, dözmədim bu rüzgara,
Ürək yara, üz qara, indi gedim mən hara?

Axar suya tulladım dörd ucunu kilimin,
890 Təkcə Tanrı lütfünə bağladım öz könlümü.

Dedim: ey ulu Tanrım, biz acizik, sən qadir,
Bu miskin, aciz qulun səndən xəcalətlidir.

Suçlarından peşiman zavallıya rəhm elə,
Nifrinlər qazanmışam yolundan çıxmaq ilə.

Ya tulla cəhənnəmə - ən sərt cəza ver mənə,
Ya da pisliklərimin əksini göstər mənə.

Gördü üzümdə tər var - xəcalət nişanəsi,
Üz döndərmədi məndən, kimsəsizlər kimsəsi.

Feyzilə qəbul etdi mənim yalvarışımı,
895 Çiynimdən dağ götürdü, sığalladı başımı.

Peşmanlıq, tövbə dolu bir nəfəs getməz hədər,
Qiyamətdə Tanrının qəzəbini söndürər.

Ey boşboğaz, aldığın hər boş nəfəs, fikir ver:
Bir əzab tərəzisi, bir ziyan ölçüsüdür.

Boş keçmiş hər gününü bir ziyan meyarı say,
Neçə il öldürmüsən, neçə fəsil, neçə ay.

Ömrünün tərəzisi incisizdir, ey sərxoş!
Həyat qədəhin dolur, həyat sandıqçansa boş.

Tərəziyə yerdəki daşları doldurma sən,
900 Bu fani muncuqları qolbağına vurma sən.

Nə qədər yığmısansa, bircə dirhəmə dəyməz,
Ömrü verdiyin sövda bir nəfəsmiş, boş nəfəs.

Hər nə almısansa, ver, cəm etməyə can atma!
Əlindən gələn qədər payla, bölüş, uzatma!

Belin məzlum əlindən, boynun kölə haqqından,
Qurtulsa, qiyamətdə bəlkə taparsan aman.

Onda sənin ətəyin yetimlərə tor olmaz,
Dullar tutub yaxandan, səndən tələbkar olmaz.

Köhnə, cındır döşəkli bu dünyadan sən əl çək,
905 Kirli ətəyini yu, nəfsin gözünə mil çək.

Ya sən qəriblər kimi ruzu yığ yol getməyə,
Ya çəkil Nizamitək dünyadan bir guşəyə.

## İkinci söhbət

## ƏDALƏTLİ VƏ İNSAFLI OLMAĞA DAİR

Ey kamalı, tədbiri xilqətlərə hökm edən!
Ayağı baş tacına dürr olan, gövhər verən!

Şahsan, şah qəsri istə, qoy görsün dünya səni,
İncisənsə, ara, bul Tanrı xəzinəsini.

Dünyanın o üzündən kimin var ki, xəbəri?
Səninlə məndən savay kimdi bilən bu sirri?

910 Tanrının xəlq etdiyi ilkin əzəli nurdan,
Hamıdan çox pay alan sənsən, özünsən, inan.

Cahan - sənin öz evin, sən - bu evin açarı,
Səninkidir bu bağın hər barı, hər nubarı.

Əzmin, böyüklüyünlə tutmusan yer üzünü,
Qürur yaraşır sənə, ver irəli köksünü.

Sənin dövrən bu dünya çevrəsinin dışında,
Qiymətin iki cahan üzüyünün qaşında.

Səhər göylər Günəşə gör neçin tutur ayna?
Kimliyini tanıtsın kainata, cahana!

Sənin beşiyin olan sonsuz mavilik ki, var,
915 Rahat yatmağın üçün gör necə yırğalanar.

Can quşu da, ölüyə can verən İsa da sən,
Sənin tək uca xilqət varsa, ancaq özünsən.

Günəşin ki sinəsi qızıl odla doludur,
Üzünü gördüyündən onu sarmış bu qürur.

Soruş, bircə telinə dəyərmi o incə Ay?
Səndən alıb nurunu, gülümsəyər gecə Ay.

Sən cahanın qulu yox, gövhərisən, dürrüsən,
Xoşbəxt yaşa, qəm yemə, ön cərgədə yurü sən.

Yer üzünə bənzə ki, uca tutmur özünü,
920 Rüzgar tək xəfif ol ki, fəth edir yer üzünü:

Hava çəkən, boş yerdən məhsul verən yer üstün,
Havalılar yel əssə, qalxıb toz olur bir gün.

Ver qəlbini Tanrıya - xoşbəxt olmaq istəsən,
Eşqin özü şahlıqdır, elə bil təxt üstəsən.

Soruş: harda qaldı din, təriqət qaldı harda?
Dəyanət getdi əldən, əmanət qaldı harda?

Hansı könüllərdə ki, dindən od var, əsər var,
İkinci dünyadan da xəbər tutmuşlar onlar.

Əlində, ovcundadır hər nə varsa dünyada,
925 Dinin dərdini çək ki, sərvətin olsun o da.

At aləmi, tut dini... var ikən bu cür imkan,
Bu alverdə nə üçün aldatsın səni şeytan?

Din adlı kəhrəbanın arpa boyda zərrəsi,
Bir batmanlıq iksirin bərabəri, əvəzi.

Tök ətəyindən daşı, cəvahiri satın al,
Dəyiş qara torpağı saf qızıla, qalx, ucal!

Bu alverdə, bu yolda ruzuya çatmaq asan,
930 Bir alıb, on verirsən, düz on qat qazanırsan.

Bu qazancdan faydalı daha nə var cahanda?
Bu ziyansız alverdən xeyir götür bir anda.

Dini sevib qorumaq sənin borcundu hər gün,
Bu yolda can qoyublar haqsevərlər haqq üçün.

Xeyirxahlığı güdmək - adillik nişanəsi,
Xalqa xidmət - kişinin ən böyük xəzinəsi!

Ordu üçün, yurd üçün xoş diləklər bəsləsən,
Bir gün yüksələcəksən yurdun nəzərində sən.

Ev yıxdı, mülk uçurtdu, zülmkarlar nə qədər,
Tapdı dövləti yalnız xalqı incitməyənlər.

Atdığın hər addımınm düşün gələcəyini,
935 Öncə gördüklərini, sonra görəcəyini.

Çalış xəlq üçün qazan asudəlik, səadət,
Xəlqi döyən, incidən nə qazanıb? Xəcalət!

Təkcə öz dincliyini güdməklə məst olmusan,
Batır tədbir gəmisi, ayıl, ey sərxoş insan!

Haydı, zəbt et, mənimsə gücsüzlər tifaqını,
Tısqırınca basıb ye yetimlərin haqqını.

Qiyamət, məhşər günü bəs nə üzlə, söylə, sən,
Gözə görünəcəksən, haqq-hesab verəcəksən?

Arxalan ancaq dinə, o qüdrətə, əzmə sən,
940 Məgər sən zərdüştçüsən, günəşbaz, acgözmüsən?

Bu sarışın, yuvarlaq Günəş zərnixə oxşar,
Aybaşı günlərində tapar onu qadınlar.

Doqquz mıxlı çadırda, hər nə varsa, yaxşı bax,
Zərnixbaz gəlinciyin oyunlarıdır ancaq.

Məsih kimi mənim də bircə budur marağım:
Ömrümün çırağında qoy tez tükənsin yağım.

Nə vaxtacan sürəcək pərvanə kimi yanmaq,
Çıraqlar qarşısında zəbun düşmək, odlanmaq?!

Sən İsaya qəsd edən bu pərdəni qır, at ki,
945 Ayaqları qandallı olasan İsa təki.

Hər kəs ki, İsa kimi duyub, sevib insanı,
İnsafı sayəsində tutub cümlə-cahanı.

Zülm ilə tutmaq olmaz bu cahanı, bu mülkü,
Mülkü ələ gətirmək yalnız insafla mümkün!

Adil olmayanların sənə nə faydası var?
İnsafsız səni yalnız tufanlara tullayar.

Ədalət müjdəsilə cahanı şad eylə sən,
İşlər gör ki, iş olsun, yurdu abad eylə sən!

Ədalət təşnəsidir, inan bu gözəl diyar,
950 Ədl ilə iş görənlər əbədi özül tapar.

## ADİL NUŞİRƏVAN İLƏ VƏZİRİN HEKAYƏTİ

Ayrılıb rəiyyətdən, səltənətdən, saraydan,
Bir gün ov həvəsilə atlandı Nuşirəvan.

Bu səfərdə munisi, dostu yalnız vəzirdi,
Özgəsini xoşlamır, tək onunla gəzirdi.

Ovlaq həndəvərində baxdı, birdən nə gördü:
Düşmənin qəlbi kimi boş bir viranə gördü.

Gördü ki, bir cüt bayquş civildəşir, uçurlar,
Şahın hövsələsi tək araları xeyli dar.

955 Vəzirdən soruşdu şah: - Nə qonuşur bu quşlar?
Nədir bu həyəcanlı qışqırışlar, təlaşlar?

Vəzir cavab verdi ki: - Ey dövrün tacidarı!
Öyüd xoşlamış olsan, anladaram əsrarı.

Bir toyun sövdasıdır bu dartışma, bu söhbət,
Bir kəbin üstündədir bu bazarlıq, məşvərət.

Bu quş verib qızını, başlıq umur o quşdan,
Gəlin başlığı istər bir az öncə, bu başdan.

Deyir: bu viran kəndi cehiz verirsən mənə,
Bir neçə xərabə də qoymalısan üstünə.

O biri quş deyir ki, əbəs alver etməyək,
960 Şahın zülmlərini görüb, qüssədən əl çək.

Şah bu şahsa, gərdiş də bu cür gedərsə yenə,
Yüz min belə xərabə cehiz verərəm sənə.

Yatmışdı, silkələdi bu cavab padşahı,
Ciyərini yandırdı onun fəryadı, ahı.

Baş-gözünə döydü şah, axıtdı göz yaşları,
Göz yaşlarından savay nə olar zülmün barı?

Barmağını dişlədi heyrət ilə, mükəddər:
"Zülmün gücünə bax ki, quşlar da tutmuş xəbər.

Zülmü hansı zirvəyə çatdırıb ki, gör, bəşər,
965 Toyuqların bağrını çalağanlar didirlər.

Ey dünyanın düşgünü; qafil mən, bixəbər mən!
Başıma döyməliyəm hələ, gör, nə qədər mən!

Nə vaxtacan soydurub soyacağam elləri?
Yaddanmı çıxarmışam qiyaməti, məhşəri?

Nə vaxtacan edim mən bunca əliuzunluq?
Öz başıma açdığım oyun qorxuludur çox!

Bu mülkü verib mənə, bəxş eləyib ki, Tanrı,
Qovum yaramazlığı, qoruyum yadigarı.

Üstüm bəzək, içimsə təzək kimidir, heyhat,
970 Üstüm qızıl, içim mis. Misəm, ey dadi-bidad!

Gərək sənin könlündə kərəm olaydı, inan,
Utanaydm özündən, ya da ulu Tanrıdan!

Bu dünyada zülm oldu zövqüm, əyləncəm mənim,
O dunyada başıma kül tökməzmi qəm mənim?

Barsız, miskin ömrümün mükafatı - cəhənnəm,
Mənim sümüyümü də yandıracaq bu sitəm.

Nə vaxtacan töküm mən - yoxsa ömrün uzunu,
975 Həm xalqımın qanını, həm üzümün suyunu?!

Qiyamət - məhşər günü yapışaraq yaxandan,
Cavab istəyəcəklər, ey soyğunçu, bunu qan!

Peşimanlıq həyası boğsun məni, yanmasam,
Qoy bağrım daşa dönsün, bu qüssəni qanmasam.

Bu peşmanlıq, bu həya, bu iztirab, bu kədər,
Yol yoldaşım olacaq məhşər gününə qədər!

Çiynimdəki yük qədər deyin kimin yükü var?
Dünyada kim mənim tək bunca zavallı olar?

Bu qədər cəvahirdən, bü qədər cah-cəlaldan,
980 Nə apara bildi Cam, nə götürdü Nəriman?

Sonsuz vilayətimdə hər şey itaətimdə,
Nə istəyirəm daha mən öz aqibətimdən?"

O qədər dəyişdi ki, şahın halı, əhvalı,
Naləsindən yumşaldı atının polad nalı.

Ordugaha dönüncə təzələdi işləri,
Vilayəti bürüdü həssas nəvazişləri.

Əli qələmli, adil bir şah gördülər onu,
Fərman verib ürəklə, kəsdi zülmün yolunu.

Boğdu cövrü, cəfanı, car çəkdi ədaləti,
985 Axır nəfəsinədək qorudu səadəti.

Zəmanədə nə qədər devrim - inqilab oldu,
Nuşirəvan ölsə də, onun haqq səsi qaldı.

Onun adı yazılmış sikkənin üzərində,
"Adil" sözü gördülər xoş günlərin birində.

Bəli, ondan dünyada parlaq xatirə qaldı,
Ədalətin zəngini kim ki, çaldı, uçaldı.

Könül yıxma, könül tik, can qoy xalqın uğrunda,
Səndən mehrini onda əsirgəməz Tanrı da.

Tap, sənə yar olsunlar Günəşə at çapanlar,
990 Dostun səfası üçün cəfa çəkən - bəxtiyar.

Sən ucalmaq istəsən, dərdi al, dərmanı ver,
Onda hamı deyəcək: - Qulunam, fərmanı ver!

Məhəbbətində qızğın, nifrətində soyuq ol,
Günəş kimi, Ay kimi payla nurunu bol-bol.

Hər kəs yaxşılıq etsə, yatmış bəxti ayıldar,
Bir gün həmən yaxşılıq öz üstünə qayıdar.

Sən çərxin gərdişinə qiyas gözüylə baxsan,
Yaxşı-yaman gündə də haqşünas olacaqsan!

Bu hərlənən günbəzin dal seyrinə bir müddət,
995 Hər şeydən üstün nədir? Tanrımıza itaət!

Üz döndər suçlarından, yaxşılıq et, haqqı tap,
Təki peşman oluban çəkməyəsən dərd, əzab.

Üzrə, hiyləgərliyə əl atma, bəyənilməz,
Gözəl işlər gözləyir dünyada səndən hər kəs.

Sözlə başa gəlsəydi bu dünyanın nizamı,
Fələklərin çiynində yer tutardı Nizami.

**Üçüncü söhbət**

## DÜNYA HADİSƏLƏRİNƏ DAİR

Ey bu qoca dünyanı ətəyilə süpürən!
Əl yelləyib aləmdən haçan əl çəkəcəksən?

Dərdə salma elləri. Dada çat, imdada çat,
1000 Barı bircə saatlıq dəbdəbə şövqünü at.

Öz sonunu düşünən üzü ağdır, üzüağ,
Səltənətlə dəbdəbə dərvişlikdədir ancaq.

Süleyman mülkü umma. Nəfs, tamah xətadır,
Mülkü durur... mülkədar özü yer altındadır.

Əzra üçün bəzənmiş gəlin otağı odur,
Vamiqin əyləşdiyi məclis viran olubdur.

Hanı o toy, o məclis? Gəlin otağı bomboş,
Vamiq uçmuş... Əzra da qara torpağı quçmuş.

İlləri yola salmış bu ağ saçlı kainat,
1005 Bir tel ucu dəyişməmiş o, heyhat.

Torpaq - qurban gözləyən boynuyoğun, imansız,
Fələk - boyunlar vuran bir cəllad ki, amansız.

Bu dünyanı dördəlli tutanlara fikir ver,
Kimə vəfa qıldı ki, vəfa qılsın bizə yer?

Torpaqda yaşayanlar dönüb torpaq oldular,
Min canı qucduğunu hardan bilsin bir məzar?

Hər gül - solan bir könul, şehi - gözdən axan su,
Hər qədəmin altında bir mələyin yavrusu.

Biz ki, gəncliyimizi bəxş elədik cahana,
1010 Bəs niyə bənzəmədik bu əbədi cavana?

Çocuğunu Simürğə bəxş edən Sam gənc ikən
Çocuğunun saçları ağappaqdır bəs nədən?

Bu vəfasız qübbə ki, daim dönər, dolanar,
Sənin istəklərinin tam əksinə fırlanar.

Bu gün şah eylər səni, aləm keçər əlinə,
Sabah döndərər səni bir çömləkçi gilinə.

Bu gecəli, gundüzlü, ikiüzlu dünyaya,
Gələn gəlir ki, dözsün min-min cövrə, cəfaya,

O kəslər ki, dolanır yalnız çöldə, səhrada,
1015 İmrənir o şəxsə ki, üzə bilir dəryada.

Dənizin əzabını dərisilə dadanlar,
Quruya çıxsın deyə su içində odlanar.

Hər şeydən əsərlənər, qəmlənər daim insan,
Nə quruda, nə suda qurtuluşa yox imkan.

Bu vücud karvanını tərpət artıq, yoruldu,
Atıb həyat yükünü, köç eyləmək fərz oldu.

Ah, bu mavi qübbənin qəfəsində qalanlar!
Şəhərindən sürülən, kəndindən qovulanlar...

Bu yolu sağ-salamat gedə bilər hansı ər?
1020 Ölümünü uzaqdan öncə duyub sezənlər.

Mülk həvəsindən əl çək, sənə qürur gətirər,
Dəbdəbələr kölgəsi heç məgər nur gətirər?

Əylənirsən həyatda, itirmisən ölçünü,
Oyuncaqmı sanırsan vahid, bircə ömrünü?

Min bir oyundan çıxır hoqqabaz fələk aşkar,
Gördüklərin göy boyda, amma, fikrin cılız, dar.

Hələ kamal çağından, zəka dövründən öncə,
Keçən qəflət dəmləri bəxtiyarlıqdı səncə.

Elə ki, bədirləndi təfəkkürün qüdrəti,
1025 Sona yetdi, tükəndi qayğısızlıq sərvəti.

Qəflətdə ömr eləmək məgər kişilikmidir?
Qafillər Yer uzündə divanələr kimidir.

Nə çarə, bacarmırsan oxumağı, yazmağı,
Barı qələm ucu yon, barı bacar pozmağı.

Könüllərə xidməti bir şərəf bil özünə,
Bəxtəvərin, xoşbəxtin kəmərindən əl üzmə!

Tikan qızılgül ilə yoldaşlıq etdiyindən,
Sünbül çiçəyinə də ətir göndərir bəzən.

O qiyamət günü ki, hamı dönər barata,
1030 Bu cəhənnəm səhranı çəkərlər ərasata.

Deyərlər: "Ey qəlblərə dağ çəkib həddi aşmış,
Zəlillərin, şillərin al qanına bulaşmış.

Sənin od qumun hara, dirilik suyu hara?
Fəratın feyzi hara, alovun payı hara?"

Qum çölü fəğan qılar: "Sovurmayın külumü!
Qanı mən içməmişəm. Mən etmədim o zülmü!

Bir çimdik duz götürdüm bu dünya süfrəsindən,
Ciyərimə səpdim ki, bir azca dad bilim mən.

Bəlkə bir gül bitirim qeyrətlilər yolunda,
1035 Bəlkə bilərzik olum hurilərin qolunda".

Yanar çöllər dinlədi hökmü boynubükülü,
Behiştin xalxalına mütrib etdilər çölü.

Cahanda yaxşılarla yaxşı bağlasan ülfət,
Bir cüt qanad taparsan, hər uçuşu səadət!

Heyhat, dünyadan köçdü ağzından dürr saçanlar,
Bal süfrəsi yerində eşşək arıları var.

Ruzigara bax ki, sən nə üns qalıb, nə insaf,
Namərdlik ucbatından insandan qaçır insan.

Hanı ülfət, mərifət? İtib, tələf olubdur,
1040 İnsanlar qalırsa da, insanlıq məhv olubdur.

Dünya uzaq düşübdür Süleyman dünyasından,
Sanki qeybə çəkilmiş gerçək insan, ər insan.

İstədim ki, qaynayım, qarışım bir nəfəsə,
Könlüm öyüd verdi ki, qoşulma hər nakəsə!

Məgər hüma kölgəli bircə nəfər qalıbmı?
Nitqi vəfa qoxulu bir can-ciyər qalıbmı?

Ədəb toxumu səpmək - vəfadan nişanədir,
Dost haqqını gözləmək - vəfadan başqa nədir?

Əkinçi arat şuma ovuc-ovuc dən səpər,
1045 İnanar ki, bir zaman götürəcək bar, bəhər.

## SÜLEYMAN PEYĞƏMBƏRLƏ QOCA ƏKİNÇİNİN HEKAYƏTİ

Günlərin bir günündə qanad açdı diləyi,
Bir çırağa yetişdi Süleymanın küləyi.

Təntənəylə, cəlalla yön aldı çöl səmtinə,
Qaldırdı öz təxtini göyün mina təxtinə.

Çöldə bir cütçü gördü, təzələndi nəfəsi,
Onda sevinc oyatdı əkinçinin həvəsi.

Evindən gətirdiyi ovuc-ovuc məhsulu,
Səxavət mədəninə saçmışdı zəhmət oğlu.

Dən səpilən guşələr göyərmiş xırda-xırda,
1050 Əgər danədən bir neçə sünbül boy atmış orda.

Danələrin sirrini əkinçi bir-bir açdı,
Süleyman dilə gəldi, sanki quşlar danışdı:

- Bir az mərdanə davran, gözü tox ol, ey qoca!
Əkdiyini biçib ye, bəsdir, tər tökmə bunca.

Quş deyilsən ki... dəni boş yerə çölə saçma,
Gəl, mənimlə bu yerdə quş dililə danışma.

Hanı əlində belin? Az cırmaqla səhranı,
Nə suyun var, nə arxın. Zay eləmə arpanı.

Düşün: sulu torpağa biz səpdik nə qədər dən,
1055 Zəhmətindən savayı nə gördük bu əkindən?

Dəni külə döndərən bu təşnə çöllərdə sən,
Yandırsan da canını, nə qazana bilərsən?

Cavab verdi ixtiyar: - Gəl, incimə sözümdən,
Heç nə gözləmirəm mən yerin, suyun feyzindən.

Mən bilmirəm heç suyu varmı, yoxmu tarlanın?
Əkmək mənim işimdir, yetişdirmək Tanrının.

Bax, budur suyum mənim - alnımdan süzülən tər,
Lingim, belim, külüngüm - bu dırnaqlar, bu əllər.

Sənin təki səltənət, mülk dərdi çəkmirəm ki,
1060 Bütün ömrüm boyunca yetər mənə bu əkin.

Məni muştuluqlayıb, xoş müjdələr verənim:
Yeddi yüz dən olacaq bu torpaqda hər dənim.

Bu taxılı şeytanla şərik əkməmişəm mən,
Yəqin birə yeddi yüz verəcək bu halal dən.

Mənə hər şeydən öncə sağlam bir toxum gərək,
Sünbüllərin düyünü qoy açılsın qönçə tək.

Götür-qoy etsələr də bu dünyada nə qədər,
Hər bədənə yaraşan münasib don biçərlər.

Hər eşşək çəkə bilməz İsa yükünü, qardaş!
1065 Dövlətin işlərini qavraya bilməz hər baş.

Kərgədan fil boynunu parçalar, düşsə eşqə,
Ölü bir çəyirtkəni zorla çəkər qarışqa.

Yüz nəhri nuş etsə də, səs çıxarmaz ümmanlar,
Arx isə bircə seldən coşar, hay-haray salar.

Heç kəs gizlənə bilməz, bu göy qübbə altında,
Hər kəs öz mərdliyilə çatır şöhrətə, ada.

Dövlətliyə yaraşır qeyrət, zəhmət, məşəqqət,
Mərdanələr hər dərddən qılar məgər şikayət?

Hər kəs Tanrı sirrini saxlamağa qadirmi?
1070 Ya naz çəkə bilirmi çınlayan bir saz kimi?

Naz etməkdən söz açma, yalnız xublar nazlanar,
Nizaminin işidir naz çəkmək, ey tacidar!

**Dördüncü söhbət**

## RƏİYYƏTİN HAQQINI PADŞAHIN QORUMASI

Mərdliyin qalxanını alıb getmiş, ey qorxaq!
Divanəlik guşəsi yaraşır sənə ancaq.

Bir mülkə uydun ki, sən heç zaman bəqası yox,
Bir ömrə uydun ki, sən əzəldən vəfası yox.

Mey-məzə düşkünləri aldatdı, aldı səni,
Bu hoqqabaz fələklər məsxərə qıldı səni.

Sən Quranı, qılıncı bir kənara atmısan,
1075 Şərəfini bir xılta, bir qədəhə satmısan.

Heç qoymursan əlindən güzgü ilə darağı,
Zülfünün dərdindəsən yosma dilbər sayağı,

Saçlarıyla quyudan su çıxardan Rabiə,
Nicat verdi köpəyə - yeddi mərddən birinə,

Sən, ey kişi adlanan, üzü qara, küt azğın!
Bir gör arvadlığıyla neylədi bir dul qadın.

Yenəmi kişilikdən dəm vuracaqsan, utan!
Az çərənlə, sən qat-qat aşağısan qadından.

Ağlın boynunda daim bahadırlıq yükü var,
1080 Fəqət hansı bahadır ədalətə kəc baxar?!

Su təzələndi, fəqət sənin irmağında yox,
Xal şölə saçdı, fəqət sənin yanağında yox.

Göy deyilsən ki, xəlqi tufanla qorxudasan,
Qozbel çarxa bənzəmə, düşün, çəkin qayadan.

Təmiz cövhərdən özgə nəylə fəxr eyləyək biz?
Hanı saflıqdan savay mayəmiz, sərmayəmiz?

Zülmkarlıq dəhşətdir. Əbəs tökmə, ey cani,
Öz üzünün suyunu, özgəsinin qanını.

Ədl, hümmət sevənlər yığışdılar bir səhər,
1085 Yüz müşküldən birini həll edə bilmədilər.

Tanrı ərənlərinin ədlindən qorx, adil ol,
Gecə fəryad oxları yağar başına bol-bol.

Kimdədir qeyrət, hümmət? Tanrı ərənlərində,
Sıxışdırma mərdləri, qüdrət var əllərində!

Bir neçə hind kahinin duası, lənətilə,
Sultan Mahmud düşdü, gör necə böyük əngələ.

Mərdlərin nəfəsində paklıq, saflıq gücü var,
Qəzəbləndirsən, qeyzi sənin başında çatlar.

Mələklərdən daha saf əqidə yolçuları,
1090 Gözündə bağa qədər olmadılarmı barı?

O mərdlərin yolunu qılıncınla kəsmə sən,
Ürəyin parçalanar nalə xəncərlərindən!

Cahanın qəddarlığı onsuz da bəsdir bizə,
Yalnız haqqı qoruyan şahlar nəfəsdir bizə.

Bu dünyada kim tapar ən böyük səadəti?
O kəslər ki, qoruyar, gözləyər ədaləti!

## QARI İLƏ SULTAN SƏNCƏRİN HEKAYƏTİ

Bəla çəkmiş bir qadın bağrı qan, gözü yaşlı,
Bir gün Sultan Səncərin ətəyindən yapışdı.

Dedi: - Ey Sultan, səndən görməmişəm yaxşılıq,
1095 Fəqət neçə zülümə şahid olmuşam artıq.

Kefli bir darğa gəlib alt-üst etdi yerimi,
Şillə çəkdi üzümə, yoldu birçəklərimi.

Suçum varmı ki, məni öz evimdən çıxartdı?
Saçlarımdan yapışdı, sürüyüb çölə atdı.

Onun zülümlərindən nəfəs çəkə bilmirəm,
Dağlar basıb köksümə bu vəhşilik, bu sitəm.

Yaxamdan yapışır ki, de qatilin adını?
Filan gecə kim vurdu kənddə filan adamı?

Qapımı sındırır ki, söylə, hardadır cani?
1100 Belə də zülm olarmı, ey bu yurdun sultanı?

Sərxoş, qatil özüykən, qırır qol-qanadımı,
Neçin döyüb, incidir ağbirçək bir qadını?

O yanda təbil çalıb, xərac yığırlar onlar,
Bir yanda bir qadının üstünə şər atanlar.

Əl uzadır bu darğa, bir fikirləş, gör, kimə,
Sənin ədalətinə, mənim də ismətimə.

Mənim yaralı köksüm yanır dağdan, düyündən,
Bezmişəm, əl çəkmişəm, inan, ömürdən, gündən.

Şəhriyar! Yerdə qoysan bu zülmü, bu əzabı,
1105 Səndən sorulacaqdır qiyamətdə hesabı.

Adillik eşqindəsən, bəs hanı ədalətin?
Haçan sona yetəcək sitəmin, qəbahətin?

Qaydadır ki, sultandan xalqa güc, qüvvət gələr,
Bəs niyə səndən bizə daim həqarət gələr?

Yetim malını yemək ədalətmidir məgər?
Hələ də lənətlənir Abxazda qarətçilər.

Dulların əmlakını soyma, çapma, talama!
Utan ağ saçlarımdan, dəymə olub-qalana.

Sən qul olduğun halda şahlıq sövdasındasan,
1110 Canidən şah olarmı, ey haqqı dardan asan?

Şah ölkədə hər işi sahmana salsın gərək,
Xalqın səadətinə keşikçi olsun gərək.

Adil olsa şah əgər, hamı ona baş əyər,
Bəslər məhəbbətini bütün canlar, könüllər.

Nə hünər göstərmisən taxt başına gələli?
Alt-üst etdin, taladın, viran qoydun bu eli.

Dağ kimi ucalmışdı bir zaman Türk dövləti,
Sarmışdı məmləkəti ədaləti, şəfqəti.

Sən yıxdın o şöhrəti, batıb getdi o ad-san,
1115 Demək, sən türk deyilsən, yağmaçı bir hindusan.

Əllərinlə dağıldı şəhərlərin əsası,
Biçinçinin xırmanı, əkinçinin tarlası.

Yığ başına ağlını əcəl gəlib yetməmiş,
Bir ədalət qəsri tik, əlindən gəlirsə iş.

Ədlin çilçıraq kimi işıqlatsın gecəni,
Bu gün, sabah, həmişə bəxtiyar etsin səni.

Yadda saxla, nə söylər sənə ağbirçək qarı:
Qanadlandır, şadlandır yetimləri, dulları.

Qapazını geri çək yoxsulların başından,
1120 Yoxsa oxlanacaqsan məzlumlar qarğışından.

Sən ki ox yağdırırsan hər guşəyə bu qədər,
Girəcəyin guşədən bixəbərsən, bixəbər.

Cahan qalalarını açan bir açardı şah,
Qapılar bağlamağa gəlməmisən, ol agah!

Səni şah dikdilər ki, azaldasan cəfanı,
Bir könül yaralansa, sən olasan dərmanı.

Zəiflərin adəti - nazla sığınmaq sənə,
Sənin borcun - onların sığal çəkmək telinə.

Qulağını geniş aç, bu möhtac, bu yalavac,
1125 Bu ac zavallıların komasına işıq saç.

Xorasan ölkəsinin hökmdarı Səncərə,
Kar etmədi bu sözlər, düşdü başı cəncələ.

Bu dövrdə ədalət ərşə çəkilmiş, inan,
Asılmışdır o yalnız Simurğun qanadından.

Daha bu torpaq üstə nəşədən bir əsər yox,
Bu göy qübbə altında həyadan bir xəbər yox.

Qalx, ey dərdli Nizami, bu dünyanı qucaqla,
Ürəklər qana döndü, elə sən də qan ağla.

**Beşinci söhbət**

## QOCALIĞIN SİFƏTLƏRİ

Ömrün gözəl günləri ötüşdü, gecə düşdü,
1130 Torpaq yellə öpüşdü, atəş suyla görüşdü.

Günəş divardan aşdı, uyğudasan hələ sən,
Sübhün bal yuxusunda hələ nəşələnirsən.

Cahangirlik, mənəmlik qasırğasından əl çək!
Qocasan, cavanlığın gur dalğasından əl çək!

Yaralanmış ürəyin dərddən, qəmdən dağ almış,
Sözlərinin duzu da, şəkəri də azalmış.

Ağıl bir az pərişan, fikirlər də dağınıq,
Ayaq yürüşdən, əl də işdən soyumuş artıq.

Ayağını uzat ki, torpaq ülfət istəyir,
1135 Daha baş da, ayaq da istirahət istəyir.

Bu kirli, kəsafətli, bu pak, ülvi dünyada,
Asudəlikdən savay varmı bir özgə fayda?!

Üzün, gözün soyudu Ayın ağ çeşməsi tək,
Göyçək, al yanaqların soldu dağ laləsi tək.

Saçın ağ, saçın qara... Başında səngərmi var?
Türk ordusu elə bil zəncilərlə çarpışar.

Bu qara, ağ saçların nəyi öyrədir sənə?
Gecədən yol gedirsən təfəkkür gündüzünə.

Çox gəlib bu aləmə sənin kimi cavanlar,
1140 Heç qocalmayacaqlar - elə sanıblar onlar.

Heyhat, çalır qocalıq cavanlıq baharını,
Bükür xəzan yelləri gülün qanadlarını.

Gənclik hər növ çör-çöpü bulaq kimi ötürər,
Qocalıqsa, deyirlər, min bir eyib götürər.

Ağ tel Cəmşid dövləti - dövlət tükü olsa da,
Sənə qırx yaşdan sonra çətin gətirə fayda.

Axı, kimin gəncliyi döndü dədə mülkünə?
Mənə vəfa qılmadı, vəfa qılarmı sənə?

Gənclik sovuşdu getdi, heyhat, qəflət içində,
1145 Təəssüflər yandırar məni heyrət içində.

Sənin qəmin, kədərin çətin kiriyib susa,
Yusif gözəlliyini zəmanə soldurubsa.

Gənclik səadətini anlaya bilmədin sən,
Qocalıq gəlməyibsə, bunu dərk edərmisən?

Bağın süsü, bəzəyi tazə qönçə, tər fidan,
Qocaldımı, görərsən, odun yaparlar ondan.

Gənclik - yaxıcı atəş, hər dəmi od parçası,
Gənclik - həyatın dadı, qocalıqsa - acısı.

Yazda tazə budaqdan tazə güllər fışqırar,
1150 Odundansa ocaqda yalnız ağ küllər qalar.

Başın ən gözəl tacı həmişə qara saçdır,
Qızılın əyarını verən də qara daşdır.

Yatma! Gənclik çağları sona yetdi, oyan, dur,
Səhər gündüzə döndü, qafil olma, amandır.

Xilqətinin atəşi kafur kimi söndümü?
Müşkə bənzər saçların ağ kafura döndümü?

Bəli, elə ki, hava bir-iki ay soyuyar,
Qapqara buludlardan yağar ağappaq ilk qar.

Boyamaq və ağartmaq az qala eyni tədbir,
1155 İsa ilə Günəşin qızıl daxması birdir.

Üzağartma adəti selin, suyun sənəti,
Gümüşdən boya vurmaq göydə Ayın sənəti.

Udur bütün rəngləri göyün mavi çanağı,
Səmalardan öyrəndi İsa boya vurmağı.

Bircə arpa qədər də çəkisi yox havanın,
Sən də havalısansa, azca fikirləş, saqın!

Qəlbin zənciyə oxşar, üzünsə ağ rumluya.
Çəkmə gecə-gündüzlü, ikiüzlü dünyaya.

Nə qədər ki, zəncilik, rumluluq var qanında,
1160 Zalim, cahil damğası alışacaq alnında.

Zolaq-zolaq qaplanın iki rəng olub suçu,
Hədəfi aydın seçib, arxadan vurur ovçu.

Fidan gəlinsən məgər, dondan dona girirsən,
Gah ağappaq tac qoyur, gah zərxara geyirsən?!

Neçin, ey ikiüzlü, yazda bərbəzəklisən,
Qocalığın qışında çılpaq qalan acgödən?!

Aslan kimi elə ye, elə sadə don geyin
Ki, ram etsin rəqibi aslanlaşan ürəyin.

Suyun, çörəyin varsa, ora-bura can atına,
1165 Əlini kəfkir kimi hər qazana uzatma!

Halal duz-çörəyindən doymursansa əgər sən,
Otu, suyu, samanı kimdir alan əlindən?

Onun-bunun payına göz dikməkdənsə hər gün,
İsanın eşşəyi tək otla dolanmaq üstün.

Torpaq, od olsan belə yaddan çıxarma bunu,
Heç nə verməz bu rüzgar, tökməsə üz suyunu.

Göy gümbəz altındadır bu dustaqlar daxması,
Ey kaş, boğa zülməti göyün işıq dalğası.

Canavar dişlisənsə, Yusif görkəmi alma!
1170 Aslan ürəklisənsə, süfrə pişiyi olma!

Saçma can toxumunu arpa təki boş yerə,
Arpanı buğda kimi satan nadürüstlərə.

İç öz ciyər qanını, suya bənzə, ey oğul!
Yalnız öz ürəyini kabab edən atəş ol.

Daş ye, fəqət dargözün çörəyini kəsmə sən,
Eşşəkmisən, namərdin kötəyini yeyəsən?

Tikan deyilsən ki, sən hər zərbəyə dözəsən,
Öz işinə baş əy ki, başı uca gəzəsən.

Öz işinə bənd olan düşməz heç zaman bəndə,
1175 Əlli tərpən, əl açma hər yetənin önündə.

## KƏRPİCKƏSƏN QOCANIN HEKAYƏTİ

Şam şəhəri tərəfdə qoca bir kişi vardı,
Uzaqlaşıb bəşərdən, mələk kimi yaşardı.

Toxuyardı özünə otdan, əncərdən köynək,
Dolanardı minnətsiz, hər gün kərpic kəsərək.

İşdi, əldən düşsəydi əmirlərin sipəri,
Deyərdi: - Sipər edin qəbrimə kərpicləri.

Onun kərpiclərindən tikdirsəydi kim məzar,
Sanardı rahat yatar, olsa belə günahkar.

Bir gün yenə o qoca tərini silə-silə,
1180 Əlləşərkən palçıqda, saman ilə, su ilə.

Çıxdı böyürdən qəfil gözəl bir dəliqanlı,
Xitab etdi qocaya, dili ahlı, amanlı:

"Bu nə işdir, görürsən?.. Bu nə düşkünlük, qoca,
Yalnız qullar, kölələr dözər zillətə bunca!

Qalx ayağa, torpağa qılınc vurma bu qədər,
Bir qarınlıq çörəyi səndən kim əsirgəyər?!

Bu qəlibi at oda, yandır, qoy külə dönsün,
Bambaşqa bir qəliblə gün ağla sən özünçün.

Axirət dünyasını qazanmağa çalış sən,
1185 Salma özünü həkdən, əl çək bu daş-kəsəkdən.

Qocasan, qocalarla sən oturub-dur ancaq,
Cavanların işini cavanlar görsün, burax!"

Qoca dedi: "Ay oğul, dəliqanlılıq etmə!
Öz işinlə şuğullan, mənə ağıl öyrətmə!

Hər sənətin sahibi sənətilə yaşayar,
Qocalar kərpic kəsər, kölələr yük daşıyar.

Əziyyətli olsa da, öyrəndim bu sənəti
Ki, boynumda qalmasın bir kimsənin minnəti.

Xəzinə yığmıram ki, məsxərəyə qoyulum,
1190 Əlimin zəhmətilə dolanıram, ay oğlum!

Çörək qazanıram mən, götürmə babalımı,
Min harama dəyişməm birgünlük halalımı".

Alovlandı gözəl gənc qocanın sözlərindən,
Gedəndə... gildir-gildir yaş axdı gözlərindən.

Yetər, dünya qapısın çox döydün, ey Nizami!
İndi din qapısın döy, çatıb daha məqamı.

### Altıncı söhbət

## VARLIĞIN ETİBARI HAQQINDA

Pərdənin dalındadır bu oyunbaz sənətkar,
Yoxsa hardan çıxardı bu oyunlar, hoqqalar!

Sən qəlbinin gözünü alışdır bu pərdəyə,
1195 Pərdədən sızanları sezib biləsən deyə.

Bu göy rəngli pərdənin arxasında min əsrar,
Çox-çox, həddindən artıq müvəqqəti vücud var.

Kimin ki, gözlərində ədəb şöləsi parlar,
İnan, sənin uğrunda ömür qoyar, can qoyar.

Bu pərgar nöqtəsində, aləmin mərkəzində,
Tapa bilməzsən, inan, borcu olmayan bəndə.

Neçə yəhərli atın bizik süvariləri,
Səyyar ulduzlar hazır yalnız bizdən ötəri.

Eşqi bizdən öyrənib, bu göy pərgardan öncə,
1200 Öncə xəlq olunanlar, sonrakılar da, məncə.

Qoyan biz deyilikmi eşqin bünövrəsini?
Yalnız biz yemədikmi sevginin silləsini?

Bu iki aləmdəcə yaxşı, yaman hər nə var –
Sənin köhlən atının tərkinə bağladılar...

Cahan evləri üçün sən ən gözəl həmxanə,
Dünya quşu görübmü səndən yaxşı bir danə?

Təbiəti hey didən quşdan, quzğundan əl çək,
Hökm et dünya quşunun başı üstə Simurğtək.

Qanadları - Məsihan, can qəfəsindəki quş,
1205 Xeyli ülvidi səndən, baxma əsirin olmuş.

Ya quşun caynağını qopar can qəfəsindən,
Ya da öz qəfəsini onun hökmünə ver sən.

O dünyaya uçuban qaldıranda kisəni,
Aparsın qanadınınm himayəsində səni.

Sən bu torpaq dəhlizi, bu gədiyə aşınca,
Mənliyindən qurtulub olacaqsan pak, uca.

Sən gecəsiz, gündüzsüz bir aləmə uçarsan,
İlahi sirlər dolu xəzinəni açarsan.

Ulu peyğəmbərlərin ayaq tozu olarsan,
1210 Müqəddəs ailənin doğma üzvü olarsan.

İki aləmin yolu bəlli iki aləmə,
Bir nəfəslik yol imiş könül üçün, sən demə.

O Tanrı ki, ömrünün qoydu bünövrəsini,
Gəldi, sənin evində qurdu can Kəbəsini.

Sən Tanrını ən təmiz, nurlu könüldə ara,
Qara kilimli bədən çəkər səni kənara.

Nərgizin gözlərinə sünnə çəkər dan yeli,
Misə qızıl rəngini verən kimya deyilmi?

Bədən dediyin nədir? Bir ovuc sulu torpaq,
1215 Əsas könüldür ki, söz könüldən qopur ancaq,

Qəlbinin qulu ol ki, qalxıb sultan olasan,
Həm idraka, həm cana bir hökmran olasan.

Samur kürkünə bənzər yumşaq könül diləsən,
Ceyran göbəyi kimi sərtliyə dözməlisən.

Sərtlik - riyazət donu yaraşır yalnız sənə,
Zər-zibanı, ipəyi əbəs taxma əyninə.

Dərisinin sərtliyi mişk vermiş ceyrana,
Eşq məktubu yazırlar bu dəridə canana.

Mişki sərt dəri saxlar, pilə içində qalmaz,
1220 İpəyə büksən onu, uçar, zərrə də qalmaz.

Şəkərsənsə, nəfəs qıs, çəkil dar məkanına,
İncisənsə, tab elə öz sədəf zindanına.

Ey gecə rəngli şəbdiz, səhər ağ nalın olsun,
Dön səhərə, ah-nalən göylə vüsalın olsun.

Gecə zülmətdə belə daşı zəhmət yükünü,
Yalnız zəhmətkeş bilir vacib işin zövqünü.

Hansı vəfa əhli ki, yetmiş əhdə, murada,
Yalnız cəfa çəkməklə qalxa bilmiş o qata.

Qəmə, dərdə tab etmək - peyğəmbərlik pilləsi,
1225 Sən axtaran dinckliklə - yalnız ölüm kölgəsi.

Acı yeyib, xilas ol xudbinlik mərəzindən,
Acı şərab deyilmi damaqlara dad verən?!

Sərvtək düz yaşa ki, düyünlərdən azad ol,
Öz bağrını yeməklə sən şamlar kimi şad ol.

Xəzinə xazinidir, seyr elə əjdahanı,
Dərdə dözüm yaradır hər cür zövqü, səfanı.

Kimlər ki çəkir zəhmət, məgər taparmı illət?
Məşəqqətin sonundan başlanır istirahət.

Fələk sənin bəxtindən açmasa bir düyünü,
1230 Salmaz sənin boynuna başqa zəncir düyünü.

Əcəl yoluna çıx ki, sənə haqqı tanıdır,
Bu şadlıq karvanını çəkən qəm karvanıdır.

**OVÇU İLƏ İTİN VƏ TÜLKÜNÜN HEKAYƏTİ**

Tez görən, uzaq görən, usta bir ovçu vardı,
Gəzib biyabanları, ov yerini tapardı.

Bəd bir iti vardı ki, çeviklikdə şir, aslan,
Günəş şüalarını ceyran belində tutan.

Kərgədan tük salardı boynunun qüvvəsindən,
Çöl eşşəyi dişindən, dağ kəli zərbəsindən.

Yolçuluqda ovçunun dostu, arxadaşıydı,
1235 Çox işinə yaramış vəfalı yoldaşıydı.

Gecə keşik çəkən it gündüz əmrə müntəzir,
Görərdin ki, onunçün qida gəzir, yem gəzir.

Bir gün aslan ovçunun yox oldu aslan iti,
Ovçunun göz yaşları ciyərlərini diddi.

Dedi: - Gör miyançısı qəza olan ovlağı!
Şir başından üstündür burda itin ayağı.

Bildi ki, dərd əlindən qanə dönsə də ürək,
Ciyərini dişində tutub tab etmək gərək!

Ovçu dözdü, səbrinin misqal boyda arpası,
1240 Bəlkə bir dirhəm qədər xeyir gətirdi azı.

Ovçunun qarşısına bir tülkü çıxdı lapdan,
Dedi: - Səbr etmək olmaz, sən ey səbrli İnsan!

Eşitdim ki, o eşsiz qüdrət, hünər yolçusu,
Dünyadan köçüb gedib... Nə qəm, başın sağ olsun!

Bir anda yaxalardı yüz cüyürü, ceyranı,
Oldu zirəkliyinin, cəldliyinin qurbanı.

Bilirəm, sənin üçün bu dərd hər şeydən betər,
Ovladığın qəm-kədər sənə iki ay yetər.

Qalx, bu ovdan kabab çək, ver könül ziyafəti,
1245 Dərisi dərvişlərin, əti ovçu qisməti.

Bilirəm, çox yemisən dadlı, ləzzətli xörək,
Bir də yağlı tülkülər əlinə keçməyəcək.

Yağlıyıq, yavanıqmı? Düşündürmür heç səni,
Süfrəmizdən çəkmisən iştahının əlini.

Nə yaxşı ki, uzağam daha sənin torundan,
Nə yaxşı ki, azadam şikarından, darından.

Sirdaşından ayrısan, bəs bu nə cür vəfadır?
Qəm yemirsən... bəs nədən ciyərlərin yaradır?

Ovçu dedi: - Doğacaq... hamilədir bu gecə,
1250 Qəmim bircə günlükdür, keçib gedər indicə.

Bircə bundan şadam ki, bu ölümlü dünyada,
Sevinc, kədər həmişə bir-birini qovmada.

Bu boş, fani dünyada, bu dəyişən qəlibdə,
Xidmət, sərvət, səltənət elə gedib-gəlib də.

Hər şey keçib gedəcək: həm Ay, ulduz, həm fələk,
Rahatlıq da, möhnət də bir gün sona yetəcək.

Bir azca şadlanıram dərdim, qəmim olanda,
Çünki sevinc müjdəsi gətirir qəm cahanda.

Bu qəmdən Yusif kimi mən bəlaya uğradım,
1255 Fəqət qurd deyiləm ki, dərddən dərimi yırtım.

Ey tülkü, şad olma ki, mənə dağ çəkdi fələk,
Hələ sənintək şikar əlimə çox düşəcək.

Ovçu bunu deyərkən yollar toza büründü,
Toz pərdəsi dalından cəsur köpək göründü.

Gəldi, öncə dolandı arxasını, önünü,
Lapdan dişinə çəkdi qasığını tülkünün:

Bir az geçikdim deyə sən məni pislədinmi?
Geciksəm də, yetirdim özümü aslan kimi!

Mənim ləkəsiz xaltam sənin dinintək təmiz...
1260 Tülkünün peysərini yəqin yeyəcəksiniz.

O kimsə ki, bəsləyir yəqinliyə sədaqət,
Onun işinin sonu səadətdir, səadət.

Yəqinlik yolunu tut daim bu kainatda,
Yəqinlikdən mübarək mənzil yoxdur həyatda.

Yəqin inam gücünə saf qızıla dönür daş,
Ayaqda əyləşənlər başa keçirlər, qardaş.

Yəqin bir inam ilə addım atsan qorxusuz,
Oddan su çıxararsan, dəniz dalğasından toz.

Yəqini təvəkkülə qarışdırıb yoğuran,
1265 Yazar kərəm əlilə: "Ruzu yalnız Tanrıdan!"

Yəqin əhli nuş edər daşdan yumşaq hər nə var,
Nə quyruqda sülənər, nə çibintək qan sorar.

Tanrı yoluyla getsən, nə qəm ye, nə qüssə çək,
Evindən yavanlığın heç vaxt əskilməyəcək.

Tanrı qapısında ol, o hər kəsdən uludur,
Ruzunu ondan istə, ruzu verən də odur.

Kim içəri girdisə Tanrının qapısından,
Əliboş qayıtmadı səbəbsiz yerə, inan!

Yəqin əhli misilsiz, kamil - onlar, naşı - biz,
1270 Biz onların ayağı, onlar bizim başımız!

Səccadənin ucunu təmiz suya salarlar,
Al qırmızı şəraba bal dadı verər onlar.

Sənə bircə günlük də möhlət vermirkən ömür,
On illik azuqəni israf nədən ötrüdür?

O gün ki, xəlq olundu bizim surətlərimiz,
Dərhal ayırd edildi dürlü qismətlərimiz.

O Tanrı süfrəsindən pay göndərilmiş sənə,
Onda veriləndi ki, indi çatır süfrənə.

Gecə-gündüz çabalar dolanmaq üçün hər kəs,
1275 Öz qismətindən artıq, inan, heç nə yeyəməz!

Əzəldə söz verdiyin din uğrunda, get, çalış,
İşləməklə nə dövlət, nə də ruzu çoxalmış.

İstəsən ki, olasan hamıdan əziz insan,
Çalışmaq səndən gərək, başarmaqsa Tanrıdan!

Çox əlləşdi Nizami, nə qazandı? Soyuq ah,
Neylədisə, yol açdı isti nəfəsli Allah!

**Yeddinci söhbət**

## İNSANLIQ MƏRTƏBƏSİNİN BÜTÜN XİLQƏTLƏRDƏN ÜSTÜNLÜYÜ

Sən, ey fələklər qədər uca, dəyərli İnsan!
Nazını çəkməkdədir bu yer, bu göy, kəhkaşan.

Heç xəbərin varmı ki, səsin yetişir hara?
1280 Sənin zənn etdiyindən xeyli ucalıqlara!

Səni öncə bəsləmiş dayəni yad eylə, an,
Qənd, şəkər dadmayınca süd əmmədin sən ondan.

De, sənə bundan böyük yaxşılıq olardımı?
Sən də artırmalısan yaxşılığı, yardımı.

Bilsən qüdrət qələmi nə qəşəng çəkib səni,
Bir nigar təsviritək şux, gözəl surətini.

Tanrı ən parlaq dürrü kəmərinə bağlayıb,
Can ipinin ucunu ciyərinə bağlayıb.

Sən dünya çəmənində bir az zəif, kəmnəfəs,
1285 Fəqət ən çevik ceyran sənlə yarışa bilməz.

Bütün canlı xilqətlər öz qulun, nökərindir,
Düşüb sənin toruna, dən istəyənlərindir.

Min-min xilqət üstə sən hüma quşu kimisən,
Yerində əyləş, az ye, az incit onları sən.

Ağlı, qaralı hər şey bu cahan yarışında,
Tər töküb, can yandırır bir vəzifə başında.

Bəduğur sayılsa da bayquşlar əfsanədə,
Tanrı xəzinəsinə bülbüldür viranədə.

Bu varlıq pərdəsinə bürünmüş hər xilqətin,
1290 Öz cisminə yaraşan bir canı vardır yəqin.

Sənin dənizindəki gövhərdən kəmdir onlar,
Fəqət dünya dürrünə sahib, məhrəmdir onlar.

Səndən kəm olanları vur hesaba yerbəyer,
Bu cəfa çəkənlərin muzdunu insafla ver.

Yaxşı-pis nə gəlibsə bu varlıq aləminə,
Yaxşılıqda, pislikdə ayna tutublar sənə.

Sənə papaq verənə başmaq verəsən gərək,
Pərdəli gəz, pərdəni yırtarlar yoxsa Aytək.

Oyan! Fəqət sübhtək pərdə cıran olma sən,
1295 Qaranlıq gecə kimi pərdə saxla, əzizlən.

Pərdəli qalmalıydın, neçin həddini aşdın?
Çıxdın pərdə dalından, yasaq yeri dolaşdın.

Sən hörümçək torunun ağzında nə vaxtacan,
Acgöz milçəklər kimi elə çırpınacaqsan?

Duy pərdə ardındakı Tanrı ərənlərini,
Pərdəli saxladılar sənin hər cür sirrini.

Pərdəlidir arılar, sanki gül pərdəsi var,
Sənin pətəyin isə bu göylər, bu səmalar.

Pərdəsiz könülləri kənardan seç, uzaqlaş!
1300 Sirri olmayan sözü dinləmə heç, uzaqlaş!

Barmağına dolayıb dünyanı çərx - utanmaz,
Səni oyuncaq bilir bəlkə kaftar oyunbaz!

Pərdəlisən, əlini uzatma başqa yerə,
Bu pərdənin dalında uyma yad ahənglərə.

Sən əsrar pərdəsinin xəlvətində get, əyləş,
Dinlə məhrəm pərdəni, azca düşün, fikirləş.

Get, cismini qırxca gün dustaq et barı, ey ər,
Cismini könlün kimi saf bir aləmə döndər!

Zindanda yatmaq ilə şərəf qazanır ərlər,
1305 Yusif zindana düşdü, əbəsmi yatdı məgər?

Könlün qədrini bilmək, o zirvəyə ucalmaq,
Riyazətlədir yalnız, igidliklədir ancaq!

Könlünün mədənində yatan saf qızıl ki, var,
Gümüş tək görünməsin, riyazətlə qıl aşkar,

Riyazətlə yetərsən elə bir zirvəyə ki,
Ayağın altda qalar nakəslər bir gül təki.

Təslim olsa əzminə harın, kür təbiətin,
Adınla möhürlənər sikkəsi sədaqətin.

Təbiətlə ağılın yar olsa, inan sənə,
1310 İş yetir dəmirçiylə əttar hekayəsinə.

Dəmirçiyə gedərsən, çınqı düşər üstünə,
Əttara baş çəkərsən, rayihə dəyər sənə.

Xilqətin işlərindən çətin taparsan nicat,
Dünya qəfəsində də xeyli qısadır həyat.

Adət buxovlarını qırıb atan əzmkar,
Səadət karvanına qafiləsalar olar.

Boş sevdadan əl üzmək - böyüklük əlaməti,
Nəfsi ram edə bilmək - peyğəmbərlik qüdrəti.

Təslim eyləyə bilsən nəfsini iradənə,
1315 Öz mülkün bil cənnəti, halaldır cənnət sənə.

Nəfsin zınqırovundan fəryad səsidir gələn,
Şeytana muzdur olma, dinin bəndəsi ol sən!

Dinə sığın, cəbrə döz, elə zirvəyə qalx ki,
Yaxın düşə bilməsin sənə məhşər atəşi.

Cəhənnəm atəşindən Əbu-Talibi bir vaxt,
Peyğəmbərin sevgisi qoruyacaqdır ancaq.

Həqq əhlinin gözündə həqq nuru var, göz yetir,
- Həqqin nuru hər kəsə nicat verən zirehdir.

## FİRİDUN ŞAHIN CEYRAN OVU HEKAYƏTİ

Bir neçə həmdəmilə Firidun səhər-səhər,
1320 Saraydan çıxdılar ki, bir az seyr eləsinlər.

Bir çəmənə gətirdi onu ovçu duyğusu,
Burda bir yavru gördü - gözəl ceyran yavrusu.

Qulaqları, gərdəni o qədər zərif, hamar...
Gözləri, qılçaları səndən mərhəmət umar.

Şah baxdı heyran-heyran, lapdan sıçradı ceyran,
Bircə göz qırpımında uzaqlaşdı ovçudan.

Ovçunu ovladı ov. Şahın ürəyi uçdu,
Bütün marağı, eşqi ovun ardınca qoşdu.

Yanan ciyəri kimi Rəxşi od-alov aldı,
1325 Ahunun göbəyitək kaman neçin yumşaldı?

Nə at çatır tozuna, nə ox tutur ceyranı,
Şimşək sürətli Rəxşin ox sürəti bəs hanı?

Oxdan sorur: - Hanı bəs o kin dolu uçuşun?
Atdan sorur: - Hanı bəs o ildırım qaçışın?

Heç biri kara gəlmir, hər ikisi yorulmuş,
Otyeyən bir heyvanın önündə məğlub olmuş.

- Məgər elə indicə, ey şah, - dil açdı kaman,
- Qarşında deyildimi dilsiz-ağızsız heyvan?

Gəzirdi zirehinin himayəsində yazıq,
1330 Kimin həddi var ki, de, zirehinə sanca ox?

Böyüklərə xoş gəlməz, bəlkə dəyər kefinə,
Gəlib özgə əl vursa çalğıçının dəfinə.

Ucalan, dağları ara, ey şahim, müdam,
Ta ki yüksək durarsan ucaların dağından.

İnsanlıq sifətidir hər yaxşılıq, duysanız,
Xidmətidir kişiyə şərəf gətirən yalnız.

İlkin yaranışdakı əhdə sadiq olmaqdan,
Ülvi nə var? Qoy desin hünərli, məğrur insan!

Əhdin kəmərinə qoy vəfa əlini hər an,
1335 Ta ki verdiyin sözü, heç vədə pozmayasan.

Keşik çəkən ilanın xəzinədə gözü yox,
Çünki başdan-ayağa xidmət kəməridir o.

Kainatın tacıdır xidmət edən kəhkəşan,
Hər şey xidmət kəməri bağlamışdır binadan.

Hünər riştəsi tutan dilavərlər, qoçaqlar,
Belinə öz əlilə xidmət kəməri bağlar.

İşıq qaynağıdır mum - bal şanının zinəti,
Arıya xidmətilə qazanmış bu dövləti.

Sən ki xidmət yolunda kəmərini bağladın,
1340 Qalx, ey Nizami, yüksəl, açıqdır qol-qanadın.

**Səkkizinci söhbət**

## YARADILIŞIN HÜSNÜNƏ DAİR

İlk dəfə xəlq olunmuş xilqətlərin çoxusu,
Tanrının dəryasından içməmişdi hələ su.

Nə dunyanın ovcunda səxa dənizi vardı,
Nə cahanda bircə toz, bircə çibin qanadı.

Hələ düzülməmişdi xilqətlərin cərgəsi,
Hələ açılmamışdı oyunların pərdəsi.

Hələ başlanmamışdı könül, can oyunları,
Gecə ilə gündüzün cəngi, döyüş anları.

Xilqət üzvlərində görünmürdü hərəkət,
1345 Hələ bilinmirdi heç varmı, yoxmu ədalət?

Tanrı öz kəmərini, öz feyzini çoxaltdı,
Dənizindən sahilə parlaq bir damcı atdı.

O qüdrət dənizinin bircə həyat ləpəsi,
Tərpətdi, hərlənməyə başladı göy qübbəsi.

Göylər axar su tökdü, yerlərdə islandı gil,
O iksirdən yoğruldu sənin də cövhərin, bil!

Dünyadan köçən zaman dönəcəksən əslinə,
Yenə qovuşacaqsan zərrə boyda nəslinə.

Nə bəxtəvərdi dünya, o zaman ki, sənsizdi,
1350 Hələ nəqşin surətsiz, canın da bədənsizdi.

Nə göy görmüşdü onda ələk-vələk dünyanı,
Nə də Yer dinləmişdi bunca nitqi, hədyanı.

Sən qədəm basmamışdın hələ cahan bağına,
İnan ki, şükr edirdi varlıq öz yoxluğuna.

Hələ dünya bağında nə gül vardı, nə tikan,
Hələ tozlanmamışdı başı aylanan cahan.

Hələ boylu deyildi gecə günduzə aşkar,
Hələ həyat qısırdı, təbiət də dul, bekar.

Kəmərbəstə deyildi Əkizlər bürcü onda,
1355 Qan almaqdan azaddı o şişkin damarından.

Ayın üzü tutulub qaralmamışdı hələ,
Su dolu teştin rəngi düşməmişdi bu hala.

Zöhrə üzü suluydu Yerin yanında hələ,
Harutun qanadları düşməmişdi Babilə.

Onda ayrıydı səndən bu səmalar, bu yerlər,
Bildin, həsrət çəkirlər, yolunu bəkləyirlər.

O gün ki, sən yarandın, təzələndi kainat,
Səslə avazla doldu iki cahan, bir həyat.

Fəqət, ey ulduzlara baxıb fal açan miskin!
1360 Qırdın ülkər dürrünü ülkər kəcavəsinin.

Nə qədər ki, ulduzlar azad idi falından,
Aylar, illər dəyişmir, sabit qalırdı zaman.

Saf bir ayna kimiydi hələ cahanın üzü,
Nəfəsin dəyən kimi ləkələndi güzgüsü.

Qüruba sən apardın məşəlini səhərin,
Səhərə "sübhi sadiq", "fərri kazib" söylədin.

Kül başına göylərin! Gör qoymusan nə günə,
Hələ də bel bağlayıb gəlir sənin səcdənə.

Can meyvəsi demişdir sənə bu doqquz fələk.
1365 Dillərindən eşitdim, eşit, inanma fəqət.

Tacın başından baha... Qoy söyləyim bir daha,
Necə ki, xalta itdən, torba eşşəkdən baha.

Bu laqqırtı evində tənə vurarlar sənə,
Cahanı satdın deyə bir arpa danəsinə.

Bircə ovuc torpağı sən bir cana dəyişdin,
Bircə gil qırığını bir cahana dəyişdin.

Ey göylərə dərd verən, ey yerini bilməyən!
Xəzinətək qalaydın gərək yer altında sən.

Sənin beyninin yağı, civə kimi cövhəri.
1370 Nə tez soyudu, görcək sincab rəngli bu yeri.

Hələ ki, basmayıblar fındıq boyda məzara,
Fındıq rəngli torpaqdan vaz keç, qalx səmalara!

Nə sincabdır, nə qunduz bu gecə-gündüz.
Bil ki, İlandır, əjdahadır bu ikiüzlü tülkü.

Əliuzunluq etmə, sən ki, pişik deyilsən,
Qoşulma dələduztək, dələyə, tülküyə sən.

Ölüm tələsi qurmuş bu yolun üstə aslan,
Neçin susuz maraltək quyuya üz tutmusan?

Fələk sənə göstərsə uzaqdan bulaq suyu,
1375 Aldanma ki, su deyil, sərabdır, ilğımdır o.

Nəfs atını bu qədər havalandırma, yetər,
Tap bir təmiz su iç ki, sənə duz yediriblər.

Nəfsinin xırmanına od vur, elə bir od ki,
Nəfsin qoy yanıb sönsün suda təbaşir təki.

Yusif çıxdı quyudan, çün halal bəndə idi,
Misir ilahəsinin gözü üstündə idi.

Bu göy qübbə altına ilk qədəm basdığın gün,
Dibsiz quyuya düşdün... necə məğmun göründün.

Saralmısan, görürəm sənin solğunluğunu,
1380 Onillik sirkə belə apara bilməz onu.

Acgözlüyün yüzillik çırağın yağı kimi,
Səni onillik sirkə pak eləyə bilərmi?

Yeddi qatlı göydədir dədənin qızıl qanı,
Yeddi loxma çörəkçin tökmə abır-həyanı.

Xırmanına od vurub yelpikləyən özünsən,
Dövlətini, varını təpikləyən özünsən.

Atıl, meydana gir ki, meydan sənindir, sənin!
İş gör, hökmünü bildir, fərman sənindir, sənin!

Piyalən var, nuş elə. Payız ötür, qış keçir,
1385 Olub-qalan ömrünün uç-dörd günün xoş keçir.

Alıb ixtiyarını, cəfa veriblər sənə,
Tapşırılıb cilovun taleyin əllərinə.

Ağır yük daşımaqdan qozbel oldun, şil oldun,
Yandın nəfsin yağında, ömür boyu qovruldun.

Sən - cahan mətbəxində ocağın külü, hisi,
Qiyamət günündəsə cəhənnəm gözətçisi!

Ey miskin! Qarnın dolu, gözlərin acdır, inan,
Çox-çox yedikcə məgər ağırlaşmayacaqsan?

Yemək, qarın alveri əgər yetsəydi dada,
1390 Çoxyeyənlərin çoxu sağ qalardı dünyada.

İnsan çox yaşasaydı, ömür düşərdi gözdən,
Ömrünün dəyərini az ömürdən istə sən.

Az ye, çevik, yüngül ol, rahat yaşa hər zaman,
Çox yesən ağırlaşar, min iztirab duyarsan.

Qarnın dopdolu olsa, başın yüz bəla çəkər,
Nəfsin quduzlaşması insanı söküb-tökər.

Nəfsin ilə bərabər sənə baş verilib, baş,
Yeməyəsən halalın olmayan neməti kaş.

Tamah sənin içində caynağıdır fitnənin,
1395 Tamahkarı aldadan bu əbləhdən qaç, çəkin!

Qorxuram ki, uyasan nəfs adlanan idbara,
Rəngini sənə verən üzüqara kaftara.

Bəzən inanmaq olmur rənglərin ahənginə,
Yaxşılıq, pislik düşür bir-birinin rənginə.

## MEYVƏSATANLA TÜLKÜNÜN VƏ CİBKƏSƏNİN HEKAYƏTİ

Yəməndə meyvə satan bir dükançı yaşardı,
Dükanını qoruyan tülkü yavrusu vardı.

Təlim-tərbiyə görmüş gözətçiydi bu yavru,
Sahibinin malını diqqətlə qoruyurdu.

Yüz cür oyun çıxartdı, fənd işlətdi cibkəsən,
1400 Əsərlənmədi əsla bala tülkü kələkdən.

Fikirləşdi cibkəsən, yumdu gözünü dərhal,
Çoxdan yatıbdır guya, yuxusu da şəkər, bal.

Tülkü bu qoca qurdu yatmış görüb yumşaldı,
Yerə qoydu başını, o da uyğuya daldı.

Tülkünü yatmış görüb fürsət tapdı cibkəsən,
Çaldı pul kisəsini. Getdi, itdi nəzərdən.

Keşikdə duranların qorxuludur yatmağı,
Ya başı əldən gedər, ya başından papağı.

Uyuyacaq yer deyil dünya, oyan, Nizami!
1405 Hər şeyi etməyin çoxdan çatıb məqamı.

**Doqquzuncu söhbət**

## DÜNYA QAYĞILARINDAN QURTULMA BƏHSİ

Ey vüsal gecəsindən daha əziz, mehriban,
Sübhün bayrağı kimi çevik kölgəli insan!

Nə vaxtacan kölgətək qəmgin görünəcəksən?
Qalx ki, yürü ki, bayraq gözəlləşir yürürkən.

Yola çıxan soltanlar öncə yükünü yollar,
Özündən öndə gedər karvanı qatar-qatar.

Sultan isən, çıx yola, səfər vaxtıdır artıq,
Yol üçün yemək götür, dəyərli azuqə yığ.

Özün yola çıxmamış göndər getsin yükünü,
1410 Bu gün başla sabahkı ruzu tədarükünü.

Bal arısı sabahı - uzağı gördüyündən,
Şanlarını doldurur balla elə bu gündən.

Baxın, savaş səfində hər qarışqa - qəhrəman,
Sabahını düşünüb, yem daşıyır durmadan.

Aqil insan oğlu da, kor deyilsə gözləri,
Qarışqadan, arıdan gərək qalmasın geri.

Səfa görmək istəyən zəhmətə arxalanar,
Yayda ruzu yığanlar, qışda rahat dolanar.

Nə sən bilirsən, nə mən, qananlar bilir bunu,
1415 Öz borcunu verməyin əvəzsiz olduğunu.

Heyif ki, aqibəti düşündürmür heç kəsi,
Yalnız bir anlıq olur çoxunun düşüncəsi.

Fələklərdən ucadır əslində məqamımız!
Aqibəti düşünmək - yüksəliş imkanımız!

Öz sonunu düşünmək imkanımız var bizim,
Başqa xilqətlərə bu, qismət deyil, əzizim.

Sevgi, həyat nəşəsi şirin olsa da candan,
Aqibəti düşünmək ondan da xoşdur, inan.

Biz ki, əzəl binadan vaqifik könüllərə,
1420 Torpaqdan yaransaq da, sahibik bir gövhərə.

Bu gəlişdən, gedişdən tək bizik xəbər tutan,
Qalır yaddaşımızda hərəsindən bir nişan.

Biz ki, doqquz fələyin dərs aldıq məktəbində,
Əbcədini oxuduq bizim yer lövhəsində.

Heç kəs damğalanmayıb bu dağla bizdən erkən,
Bu bağın ilk nübarı bircə sənsən, bir də mən.

O gün ki torpağım töküb də, islatdılar,
Bir az iksir atdılar, can mayası qatdılar.

Torpağın göz yaşıyla, qan ilə yoğrulsa da,
1425 Neçə xəzinə yatır, bilsən, onun altında!

Tanrının yoğurduğu bu torpağı tanı sən,
Şükür qıl, ey naşükür, ən ulu zirvədəsən.

Dərk elə mövqeyini, səfərinin səmtini,
Hardan gəlir bu yollar, hara aparır səni?

Bu səfərə çıxarkən nəydi fikrin, niyyətin?
Bu səfərdən dönməyin nədir sirri, hikməti?

Bu aləmə gəlməmiş, hələ lövbər salmamış,
Bizim bu dağılmışda hələ məskun olmamış.

Sən əzəli aləmin dolaşırdın fövqündə,
1430 Hüma səadətinə çatdın Həməl bürcündə!

Onda sənin eşqinin uçuş meydanı hədsiz,
Əbədiyyət yolun da sonsuzdu, ey xəbərsiz!

Enmək istədin yerə, göydə acizmi qaldın?
Bu torpağa, bu suya sərin kölgəni saldın.

Günəşin ətəyini ayağının altına,
Dartıb çəkirsən hərdən, dünya dar gəlir sana.

Bəzən tək yaşamağı üstün tutursan artıq,
Qayıtmaq sevdasına düşməyin də bir anlıq.

Tərəddüd içindəsən. Özgə hansı işin var?
1435 Bircə ipin üstündə tuta bilmirsən qərar.

Səxavət meydanında lütf saçan müflissən,
Bu varlıq aləmində köhnə sənsən, tazə sən.

Yavrusunu öldürən anadan əl çək, yetər!
Ata öyüdlərinə qulaq ver, ey bixəbər.

Ey sadə insan oğlu, dədənə bax, dədənə,
Gör neylədi? Dədənin yolu "Gəl!" deyir sənə.

Qoy burda əyləşənlər dinclik gözləməsinlər,
Bekar keçən ömür-gün hədər deyilmi məgər?

Hədər keçən günləri nə cür qaytarmaq geri?
1440 Səcdə qılıb, baş əyib öpməliyik bu yeri!

Biz ki, qara gildənik, hardandır ağ gün bizə?
Necə şadlanasan ki, şadlıq olub möcüzə!

Məgər varmı fələyin xoşbəxt etdiyi adam?
Varsa, nə sənsən, nə mən. Əl çək belə xülyadan.

Biz dünyaya gəldik ki, kədər duyaq, qəm yeyək,
Gəlmədik ki, nitq edək, axşam-səhər zəvzəyək!

Bu dünya dedikləri alğı-satqıymış, inan,
Bircə düzlük görmədim burda başdan-binadan.

Gələndə rəngin neçin şərab kimi qızardı?
1445 Gəlməyin arxasınca çün bir getmək də vardı!

Nə vaxtacan sürəcək bu hicranlar, görüşlər,
İstəmədən gəlişlər, istəmədən gedişlər?

Görün, hansı şübhələr könüldən gəldi, keçdi,
Yoxluğumuz bir yana, varlığımız da heçdi.

Uçma, axı cahana yavaş-yavaş gəlmisən,
Tələsmə, bu həyata gecikmisən axı, sən.

Vaxt çatıb... zəng çalınar, bizim köç də başlanar,
Sikkəmizlə ən yeni axçalar naxışlanar.

Çürümüş, köhnə gilə tazə bir can verərlər,
1450 Dağılmış parçaları yenə birləşdirərlər.

Ey bugünkü halından utanıb qızarmayan!
Fikirləş öz sonunu, barı o gündən utan!

Bu səhranın köhləni təkcə dindir, yalnız din,
Yalnız odur çarəsi bu qədər müşküllərin.

Bizi qarşıda gözlər nə qədər möhnət, kədər,
Gəlhagəl dərdlərimiz yalnız din ilə gedər.

Yol-yoxuş... atı bərk sür, tənbəl, ərincək olma,
Ey canı bərk, mətinləş, imanı kövrək olma!

Günəşin aynasını tut üzünə, bax bir an,
1455 Özündən soruş, öyrən, neçin üzüqarasan?

Üzr, tövbə özündən, qəbulu Allahdan um
Hər işini taleyə tapşırıb, olma məzlum!

## TÖVBƏSİNİ POZAN ZAHİDİN HEKAYƏTİ

Məscid əhli bir sofu uydu bir gün şeytana,
Məsciddən üz çevirdi, aldı onu meyxana.

Mey dilinə dəyincə mey kimi nalə qıldı:
- Zavallı canım! - dedi, - özgə nə çarə qaldı?

Nəfs ilə həvəs quşu könlümdə axtardı dən,
Heyhat, tələ qurdular təsbeh danələrindən.

Kəbəm çıxdı əlimdən, Kəbə artıq mənə yad,
1460 Ev-eşiyim dəyişdi, dönüb oldu xərabat.

Qara taleyim məni, gör, kimlərə tay etdi,
Qələndərlik öyrətdi, imanımı zay etdi.

Niqab örtdü, yaşmdı əqlin gözləri məndən.
Xərabatin özü də xarab oldu əlimdən.

Bu dünya darlığından qurtula bilsəydim, ah!
Ətəyimdən ləkəni bir silə bilsəydim, ah!

Qəzadan deyilmi bu? Mən hara, bu "Lat" hara?
Mübarək məscid hara, viran xərabat hara?

Bir gənc pərdə dalından dinləyərək zahidi,
1465 Təmiz, pak nəfəsindən od saçaraq söylədi:

- De, qəzadan sənə nə? Sənintək yüz min gəda,
Qəzanın nəzərində dəyməz bir arpaya da.

Tövbə qapısına gəl, təmizlə günahını,
Başqa hədyan söyləmə, seç Tanrı dərgahını!

Üzr istəyib, tövbə qıl, keçərlər günahından,
Qolu bağlı gedərsən yoxsa ora bir zaman.

Çöldə ot otladığın, yatdığın yetər artıq,
Bir az da fələklərin yaşıl bağçasına çıx.

Ayıltmasa göy səni çəkil, hicra guşəyə,
1470 Bir azca azuqə yığ o dünyaya köçməyə.

Qanlı yaşlar tökməyin, axı nə mənası var?
Çoxdan gəbərib gedib sağlığında yatanlar.

Səni yuxu sərsəmi görən "Şəfəq sahibi",
Yayınacaq gözündən, endirəcək niqabı.

Fələk köçü yüklədi, qalx, ey Nizami, oyan!
Kimdir bu gecə yarı ayağını bağlayan?

**Onuncu söhbət**

## DÜNYANIN SONU HAQQINDA

Ey fələk, bu hərlənmək nə vaxtacan sürəcək?
Bu nə zülmdür? Ey Yer, yavaş, aram ol görək.

Hər gecənin sonunda axı, səhər açılar,
1475 Hər yoxuşun sonunda axı, bir eniş də var.

Əsib yerin layları, titrəyir neçin, nədən,
"Qiyamət zəlzələsi dəhşətdir" ayəsindən.

Zəlzələdən çökürsə yaralı Yer kürəsi,
Fələk zəncirlərinin çürüməzmi həlqəsi?

Sökülür qəlpə-qəlpə Yer kürəsi - yanar dağ,
Qırır zəncirlərini zəncir divanəsi, bax.

Qopub düşür göylərin göy qurşağı, kəməri,
Kimlə yarışacaq Yer boş görəndə göyləri?

Ey fələk, ələk-vələk kainat kimə gərək?
1480 Bu qiyamət, bu dəhşət nə vaxtacan sürəcək?

Nə sübhün ətri qalıb, nə qürub ərğəvanı,
Nə bu yerlərin topu, nə göylərin çövkanı.

Yerlər qalxır göylərə, matəm havası çalır,
Ətəyini qaldırıb, göy də yerə alçalır.

Marığa yatmış fələk çıxır pusqu yerindən,
Qoparır bu aləmi oxundan, mehvərindən.

Qoca fələk yüz yerdən yırtır öz xirqəsini,
Torpaq inci düzümlü ipini, riştəsini.

Göylər enirkən yerə, yerlər də qalxır göyə,
1485 Alt-üst olur kainat, tamam dönür heçliyə.

İnsan adlı bəladan xilas olur göylə yer,
Hər ikisi insanın tozundan təmizlənir.

Göylər insan işilə bir də uğraşmayacaq,
Yerlər insan məkrindən tamam uzaqlaşır, bax!

Ulduzlar xəcalətli, ulduzlar ələk-vələk,
Bircə ovuc torpağa nə vaxtacan baş əyək?

Həlqələnib, qıvrılıb, işi bitirib fələk,
Son qisməti son anda bir çimdik torpaq yemək.

Ey dünyanın bağrını qan edən, fəğan edən,
1490 Heç varmı səndən savay onu bunca incidən?

Qəm küpünün içinə bu torpaq necə doldu?
Ətrafının rəngi də matəm yaşılı oldu.

Siz ki, çərxin önündə bu qədər məğmun, aciz,
Qəm küpünü torpaqdan nə cür təmizlərsiniz?

Yuyun ətəyinizi barı yeddi nəhr ilə,
Dumanlı çevrənizi qumla, qum sellərilə.

Alın çərxin əlindən ulduzlar xirqəsini,
Damğalayın qapqara xətlə Yer kürəsini.

Fələklərin sürətlə hirslə hərlənməsindən,
1495 Necə, bəla gələcək Yerin başına, bilsən!

Göydə yanan, partlayan, batıb gedən hər nə var,
Yer üçün bir nümunə, bir timsaldı apaşkar.

Partlayıb dağılan baş, görün, necə məhv olur,
Yer kürəsi eləcə kültək göyə sovrulur.

Bu mişk rəngli sədəf- göy bizə düşmən imiş, ah!
Gözləri ulduz-ulduz, özü yırtıcı timsah.

Yox, bu dənizdən çıxan dürrün sədəfi deyil,
Mərifət mədəninin daş-qaşı da deyil, bil.

O sədəfin sirrini kim bilsə, beyni donar,
1500 Zümrüd görmüş ilantək kor olar, gözsüz qalar.

O sədəfdə nə işıq, nə göz nuru ara, gəz,
Min-min gözü olsa da, heç biri heç nə görməz.

Bilirəm, bəyənmirsən ölümün haqq yolunu,
Özgələrin gözüylə çünki görmüsən onu.

Vaxtdır, öz ayağına zəhmət verib tələs sən,
Özgənin ayağıyla mənzil kəsə bilməzsən.

Zorun, zərin gücünə Bəhram göyə çıxsa da,
Korun qisməti gordu, bir məzardı axırda.

Bu qəbrin qapısını bağlamaq olmaz, olmaz!
1505 Bu damın bacasından boylanmaq olmaz, olmaz!

Sən bu dustaq evində səbr et, döz iztiraba,
Pəncərəni, qapını şaşqınlar kimi qapa.

Nə vaxtacan fələkdən bəhs edəcəksən, yetər,
Kül qoy onun başına, yelbeyinmiş nə qədər!

Kəhkəşanı, səmanı az qarğa, az söy barı,
Bir arpaya da dəyməz bu saman oğruları.

Aş bu mavi günbəzi, o qədər yüksəl ki, sən,
Boynunu dar həlqədən xilas edə biləsən.

Teldən nazik fəhm də, sapdan zərif xəyal da,
1510 Çərxin incə yolunu acizdir anlamaqda.

Acizlikdən, həyadan üzün yanır, fikir ver,
Çərxin yolu bir tükün ucundan da incədir.

Tükün ucunu bölmə, yetməzsən bu əsrara,
Xəmirdən bir tük kimi atar səni kənara.

İmkanın var, Qalxasan mələklər məqamına,
Bu qədər ki, güclüsən, neçin girmisən qına?

Könül vermə, bu gilin, bu qumun vəfası yox,
Dünyaya bağlanmağın daha bir mənası yox.

Burda başında papaq... demək, baş əyməlisən,
1515 Burda belində kəmər... demək, qulluq əhlisən.

Hünərlisənsə, hər gün paxılların artacaq,
Qəndin varsa, yediyin zəhər olacaq ancaq.

Bu həyat ocağına aldanma ki, şöləsi,
Cəhənnəm atəşinin haləsidir, haləsi.

Ay olsa da göylərin, fələklərin qəndili,
Yağı Günəşdən umur, ömür boyu dilənir.

Susamış bitkilərə nicat verən bulud da,
Donuq bir bəlğəm kimi dəyərsizdir həyatda.

Sanma ki, su səadət, bolluq qaynağı olmuş,
1520 Sudan nə çəkdiyini batan gəmidən soruş.

Dinclik yuvasıdırmı məgər bu viran yuva?
Nə üçün göz yumursan bunca çirkə, ayıba?

Öz eybini görməyi çoxdan yadırğamısan,
Özgəsinin eybinə ayna tutan kəminsan!

Sən ey aynalar kimi eybin şəklini çəkən,
Bil ki, eyibli nəfəs sənə tez vurar ləkə.

Ya hünəri tərk elə, cibindən çıxarıb at.
Ya öz eyiblərinin aynasını qırıb at.

Özgəsinin eybinə göz yum, əgər gözün var.
1525 Qüsuru kənarda yox, əvvəl özündə axtar.

Hər kəsdə hünər də var, eyib də var bil ki, sən,
Hunərli olacaqsan, eyibləri görməsən.

Qaranlıqda görməyə lampa gərəkdir sənə,
Gündüz qara qarğa da, dərhal dəyər gözünə.

Güllər kimi əlvandır tovusun qanadları,
Ayağının eybini başına qaxma barı.

Qarğanın əyni, başı qapqaradır, gözü ağ.
Gözün varsa görə bil, ağı qaradan qabaq.

## İSA PEYĞƏMBƏRİN HEKAYƏTİ

İsanın ayaqları yol açıb dünyalara,
1530 Qəlib çıxmışdı bir gün balaca bir bazara.

Gördü bir çoban iti, canavar kimi nəhəng,
Yol üstündə uzanmış cansız, nəfəssiz köpək.

Dörd yanını bürümüş adamlar qatar-qatar,
Leş yeyən quzğun kimi başına toplaşıblar.

Biri dedi: "Çatladar beynimizi bu cəmdək,
Yanan çıraq küləkdən uzaq gərək, gen gərək!"

Biri dedi: "Rədd edin, görünməsin bu murdar,
Gözümüzü kor eylər, könlümüzü dondurar".

Hərə bir hava çaldı: "Tfu!" - "Cəsəd!" - "Əlhəzər!",
1535 Zavallı, miskin leşə min bir cəfa verdilər.

Növbə çatdı İsaya, eyibdən vaz keçdi o,
İtin üstünlüyünü fikirləşdi, seçdi o.

"Naxışları, xalları, - dedi, - aləmdi, məncə,
Parlaq, saf dişlərinə nə dürr çatar, nə inci".

Qorxu ilə, ümidlə dənizdən dürr tapan var,
Sədəfini yandırıb tozuyla diş ağardar.

Özgəsinin eybini, öz hüsnünü görmə tək,
Öncə öz nöqsanını görə bilən göz gərək.

Demirəm ki, aynanı al əlinə, ya alma,
1540 Öz eybini görə bil, özünə heyran olma!

Niyə gərək özünü bahar kimi bəzəmək?
Saqın! Soldurar səni zaman bahar gülü tək.

Eybini örtən geyim zərif toxunduğundan,
Tanrı doqquz pərdə də göydən endirmiş əlan.

Bu göy yuvarlığının içində, ey gözü dar,
Söylə, sənin boynuna həlqə olmayan nə var?

İtsənmi ki, taxasan Sürəyya xaltasını?
Eşşəksənmi, çəkəsən yük daşıyan İsanı?

Fələk nədir? Atılmış, tərk edilmiş dul qarı,
1545 Cahan nədir? Saralmış bağların solğun barı!

Hər köhnəni, təzəni bircə-bircə sal yada,
Bu dünyada nə varsa, dəyməz bir arpaya da.

Yemə dünya qəmini, xacə, tərk et oyunu,
Qüssə çəksən, qoy yerə Nizaminin payını.

### On birinci söhbət

### DÜNYANIN VƏFASIZLIĞI HAQQINDA

Qalx, bu köhnə oyunçu səni tez verər bada,
Vəfa yoxdur fələyin açıq nərdtaxtasında.

Heç onun xislətində insaf olubmu bir an?
Murad nəqşi gözləmə vüsal qapılarından.

Dənizdə ayaqüstə durmağın nə xeyri var?
1550 Yükünü də, səni də udmazmı fırtınalar?

Ördəyə şahin dedi: - Uçaq, çöllər gözəldir,
Ördək dedi: - Özün uç, mənə göllər gözəldir.

Ey bu qəm gəmisində ləngərlənən zavallı!
Yük altında kürəyi qana dönən zavallı!

Boğar səni bu dəniz... At yükünü, at, qaçaq,
İnan ki, qarşındakı su yox, sərabdır ancaq.

Bircə aman guşəsi taparsanmı bu yerdə?
Vəfa iliyi varmı məgər bu sümüklərdə?

Bu dünyada zərrəcə naz çəkmə adəti yox,
1560 Bari; ortağı olma, əl çək ondan biryolluq.

Dünya nemətlərində nə tapacaqsan, eyvay,
Bulaşıq bir kasadan, boş bir süfrədən savay?

Dünyanı görənlərin ağızları qapandı,
Ondan bəhs edənlərin dodağı, dili yandı.

Karvanında nəyi var, bir-iki zəngdən savay?
Boşqabında nə gördün, ölgün milçəkdən savay?

Bu kasadan bir barmaq yeyənin qafa tası,
Zamanın barmağında oldu üzük halqası.

Görən yox bu cahanda bircə savab iş hələ,
1560 Yuxuları qat-qarış, fikirləri - tor, tələ.

Çəkil, qoy heçlik evi olsun xəlvəti guşən,
Çəkil, tamam uzaqlaş sən bu viranə kənddən.

Evsatan simsar kimi onu öyməkdə nə var?
Tərk et, evi bürüsün qoy tüstülər, dumanlar.

Bu dünyanı öpməkdə, qucmaqda məqsədin nə?
Sənmi doğmusan onu, hey qaçırsan üstünə?

Sən dünyanın üstündən xətt çək, bir az şad yaşa,
Sənə uzaq olandan uzaqlaş, azad yaşa!

Yolun, mənzilin uzaq, yormasın yollar səni,
1565 Hazırla yolluğunu, ruzunu, azuqəni.

Min-min bağrı yanmışı udan bir cəhənnəmə,
Bu şeytanlar, bu divlər məskəninə çöl demə.

Onun dirilik suyu - göz yaşı, ciyər qanı,
Ərzi yandıran Günəş - nəməkdanı, duzdanı.

Bu səhranın od rəngi - hərislərin şərabı,
Düz və duzlu adamlar sürfəsinin kababı.

Can vermə bu şorana, o döndərdi, baxsana,
Odun qəlbini suya, qəlbin odunu qana.

Zavallılar bu yolla gedə bilərmi məgər?
1570 Bir yol ki, baxmaq ilə qəlbi qana döndərər.

Bu divlər yatağından qalxır elə alovlar,
Qəmin ürəyi dərya, ürək bir damcı olar.

Od tutan bu çöllərin zahirinə uyanlar,
Ciyər kimi donarlar, atəş kimi yanarlar.

Neçin cırmaqlayırsan bu cəhənnəm çölləri?
Rədd et, ver cəhənnəmi, al cənnəti sən geri!

Bu tozlu-kirli məbəd nə qədər ki, durur sağ,
Fələk təqib edəcək səni ayaqbaayaq.

Gələr, bir gün səni də yaxalar o bağrıdaş,
1575 Götürər yavaş-yavaş, itirər yavaş-yavaş.

Bu torpağın başına dönüb dolanan insan,
Məgər sabah bir ovuc torpaq olmayacaqsan?

Heç bir kəsi tapdama, dayan, fikirləş bir an:
Sənintək çoxlarını tapdalayıb bu dövran.

De, kim apara bildi dünyadan salamat can?
De, kim oxuya bildi bu yazını sonacan?

Dayan, neştər tikanın ayaq basma üstünə,
Özünü qoru... min-min neştər durub qəsdinə.

Burda neyləyəcəksən, dolaşma veyil-veyil,
1580 Bir tələdir bu dünya, güvənməli yer deyil.

Fəna mənzilidir bu, səbat axtarma, əbəs
Bura payız yelləri bahar gətirə bilməz!

## NƏZƏR SAHİBİ BİR MÖBİDİN DASTANI

Ağsaçlı qoca möbid, yeri, yurdu Hindistan,
Yol keçəndə nə gördü? Bir bostan, bir gülüstan.

Ortasında naxışlı imarətlər, qəsrlər,
Qucağında çiçəklər əsim-əsim əsərlər.

Fələk kimi qan tökən qönçələr beli bağlı,
Az ömürlü lalənin başından çıxıb ağlı.

Fəvvarədir çəmənin tər süsəni, laləsi.
1585 İncə boylu qamışlar - qənd, şəkər piyaləsi.

Öz oxuyla yaralı güllər qalxana bənzər,
Canının qorxusundan əsir salxım söyüdlər.

Bənövşənin saçları öz boynuna bağ olmuş,
Nərgizin ətəkləri gümüş axçayla dolmuş.

Güllə qucaq-qucağa, nəfəs-nəfəsə lalə,
Biri yaqutla süslü, o biri incilərlə.

Yazıq hardan bilsin ki, bircə günlük ömrü var,
Sabahı düşünmədən bu gün olmuş bəxtiyar.

O ağsaçlı ixtiyar seyrə daldı gülzarı,
1590 Bir aydan sonra yenə burdan düşdü güzarı.

Hanı o güldən əsər, hanı bülbüldən əsər?
Burda qarğa qarıldar, burda saxsağan gəzər.

Cəhənnəm əvəz etmiş elə bil cənnət yeri,
Yəhudi məbədinə köçmüş qəsrin qeysəri.

Yaxşılıq elə bil ki, buxarlanıb yoxalmış,
Gül qomları yerində tikan qomları qalmış.

O xəzan bağçasında qoca ayaq saxladı,
Hər şeyə güldüsə də, öz bəxtinə ağladı.

- Bu dünyada heç nəyin vəfası yoxmuş - dedi.
1595 Dərdi çox, çəfası çox, səfası yoxmuş - dedi.

Hər nə ki, baş qaldırır bu torpaqdan, bu sudan,
Axırda viran olur, köklü-köməcli viran!

Xərabət diyarından yaxşı bir yerimiz yox,
Xarab olmaqdan özgə üstün tədbirimiz yox.

Rahib haqqın yoluna çevirincə üzünü,
Həm Tanrını tanıdı, həm dərk etdi özünü.

O sirr gövhərlərinin sərrafı oldu qoca,
Gövhərşünas tərəfdə qaldı ömrü boyunca.

Sən ey məcusilikdən, müsəlmanlıqdan qafil,
1600 Sən qurumuş bulaqsan, damcın da yox, bunu bil.

Sən o hindli qocadan geri qalma, kəm olma,
Tərk elə bu cahanı, bu heçliyə vurulma!

Daim məstsən gül kimi... bu məstlikdən əl çək sən,
Papağın, kəmərinlə çoxmu əylənəcəksən?

Qalx, gülün kəmərini burax əlindən, burax!
Güllər sənin qanınla kəmər bağlayıb ancaq.

Papağınla kəmərin bəla kəsilib sənə,
Sən onları girov ver eşqin meyxanəsinə.

Papaq ucaldar səni, xacə qılar könülə,
1605 Kəmər səni qul eylər bu torpağa, bu gilə.

Çalış, ağalıq, qulluq qəmindən qurtulasan,
Nizamdan Nizami tək bəlkə azad olasan.

## On ikinci söhbət

## DÜNYAYA VİDA

Vaxtdır, bu əyyam ilə, dur, vidalaş son kərə,
Bu dünyanın torunu tərk et dən sevənlərə.

Bundan gözəl ölkə tap, işıq gəlsin gözünə,
Bu hücrədən möhtəşəm bir qapı aç özünə.

Könul, göz nemətləri səninlə bahəm gedir,
Nalən də, göz yaşın da, bil ki, son azuqəndir.

Üç-dörd gilə yaş töksən ayrıldığın torpağa,
1610 Fidan kimi göyərər, könlün qalxar ayağa.

Dəvə xislətlisənsə, yolda rəqs elə, oyna,
Yoxsa atma cübbəni fil ayağı altına.

İndi ki, bir telə də burda məhrəm deyilsən,
Yalnız ölüm barədə düşünəsən gərək sən.

Getdi könlüncə olan dostların, tanışların,
Kimlə əyləşəcəksən, hanı zövqdaşların?

Gərçi hələ dünyada incə söhbət əhli var,
Kim səninlə qonuşar? Kim sənə həmdəm olar?

Bu natəmiz torpaqda, ey pəhrizçi könüllər,
1615 Təmiz su gəzməyiniz əbəs deyilmi məgər?

Var-yoxun dağılmamış, hicran gəlməmiş hələ,
Qazancını, pulunu dağıt, payla, bəxş elə.

At çiynindən yükünü, bir az asan get, asan,
Yükün yüngülləşərsə, mənzilə tez çatarsan.

Aradığın könülsə, qalx, göylərə baş çək sən!
Yoxsa yerdə, boş evdə axı neyləyəcəksən!

İndi ki, sən düşmüsən bu quyuya, bu tora,
Divarından deşik aç, ta çıxasan bayıra.

"Mim" kimi həlqələnmiş bu dünya çevrəsini,
1620 Parçalayıb atmasan, eldən buraxmaz səni.

Bu ulduzlu göylərin hədəf olma oxuna,
Bu çevrə sınırından çıx kənara, karıxma.

Çıxa bilsən gecənin, gündüzün cızığından,
Bu çevrə xəttini də kecə bilərsən, inan.

Ayaq basacağın yer möhkəm deyilsə əgər,
Heç bir işin dalınca getmə, çalışma hədər.

Hansı işə girişsən, hünər göstər, dada çat,
Geri qayıtmaq üçün sən mütləq bir lağım at.

Yolçuluğa - səfərə könül verən bir adam,
1625 Qərək daim saqına yol üstündə quyudan.

Selin-suyun ağzında ev-eşik quran insan,
Barı bir qapı aç ki, sel gələndə qaçasan.

İtin adı gələndə tülkünün rəngi qaçdı,
Dərhal yuvasındaca ikinci deşik açdı.

Bilmədi mavi qübbə çoxdan kəsib yolunu,
Tülkü ovçusu fələk tüstüylə boğar onu.

Bəs bu necə sevincdir, bəxtəvərsən elə bil,
Ey özündən xəbərsiz, ey qəflətindən qafil!

Sən əhd etdin, gələrkən bu fəna dünyasına,
1630 Dərd çəkib, dönəcəksən tez bəqa dünyasına.

Sən ki bu gün pozursan Tanrıyla peymanını,
Nə cür qurtaracaqsan öz əhdindən canını?

Könlün seçən yolla get, yalnız o yolu tanı,
Sən ki dünya görmüsən, rədd et iki dünyanı.

Aşağı baxma, torpaq ləngidər qədəmini,
Çox da qanrılma geri, qorxudar kölgən səni.

Könüllərdən ruzu yığ, yolda ev-eşikmi var?
Yaş axıt gözlərindən, axı, təşnədir yollar.

Sədəfinə təslim et saf incini, aparsın,
1635 Torpaqdan aldığını qaytar, canın qurtarsın.

Sənintək çoxlarının fələk yedi başını,
Apardı səndən güclü neçə dost-tanışını.

Sən fələklə vuruşda bir azca fəndgir ol ki,
Bir gün yerə sürtəsən kürəyini ər təki.

Bu fələklə vuruşmaq çox da qorxulu deyil,
Qılıncı gün şüası, qalxanı günəşdi, bil!

Bu dolaşıq kələflər hətta ilan olsa da,
Sənin ölməz eşqinin bir heçdi qarşısında.

Bir şüşə ki, qırıla bircə nəfəs küləklə,
1640 Çox da qalma qeydinə, vaz keç, onu tərk elə.

Qızılın atəşini söndürsün deyə, zərgər,
Şəkər tökər, düşməni qənd-şəkərlə öldürər.

Bilik qazan, ey könül, yan, işıqlan biliklə,
Zülməti nurla öldür, düşməni bir çiçəklə.

## ÇƏKİŞƏN İKİ FİLOSOFUN DASTANI

Bir mülkə ortaq olan iki həkim çəkişdi,
Aradan sözmü keçdi, odmu, alovmu keçdi?

Öz nəfsini güdərək hər biri dedi aşkar:
- Bir sarayın sahibi yalnız bir sultan olar.

Əgər haqq ikiləşsə, onu dinləməz heç kəs,
1645 Bir bədənin üstündə iki baş ola bilməz.

Bir məclisin başçısı iki Cəmşid olarmı?
İki qılınc saxlayan bir qın dünyada varmı?

Hər iki filosofun ləngər vurdu qəzəbi,
Çalışdı, özü olsun imarətin sahibi.

Nifrətə çevrilincə qızmış təəssübləri,
Qərara gəldilər ki, boşaltsınlar evləri.

Bacaları suvayıb, gecə yola düşdülər,
Evi satmaq üstündə dilləşib, didişdilər.

Bu işdən vaz keçdilər, seçdilər başqa bir fənd,
1650 Bir-birinə verməyə şərbət düzəldək, şərbət.

Bacardıqca, elmdə görək kim kimi ötür?
Kimin şərbətindəki zəhər daha güclüdür?

Kimin ağlı üstünsə, bina qalsın qoy ona,
İki bədəndəki ruh qovuşsun da bir cana.

Birinci iddiaçı düşündü yaxşı-yaxşı,
Bir ağu düzəltdi ki, dəysə yandırar daşı.

Uzatdı rəqibinə: - Zəhər deyil, şərbətdir,
Qəlbə qanadlar verən meydir, nazlı nemətdir.

Aslan ürəkli mərdin titrəmədi əlləri,
1655 Qənddir baldır! - deyərək aldı içdi zəhəri.

Qorxmadı "Nuşiqiya", çünki içmişdi öncə,
Zəhər dəyəcək yeri tiryəkləmişdi öncə.

Pərvanə kimi yandı, yenidən qanadlandı,
Gəldiyi məclis yenə onu öz şamı sandı.

Yolüstdəki bağçadan bir qızılgül qopartdı,
Dərhal əfsun oxuyub, düşməninə uzatdı.

Gülü verdi ki, onu öldürsün asan, yüngül,
Rəqibin zəhərindən daha kəsərliydi gül.

Düşmən əfsunlu gülü elə ki, ələ aldı,
1660 Qorxudan dizi əsdi, çökdü, bağrı yarıldı.

Bəli, çarə taparaq o, qurtuldu ağudan,
Busa bir gül iyləyib, dünyadan getdi əlan.

Dünya bağında hər gül, demə, güllər xasıdır,
Bir insan ürəyindən sızan qan damlasıdır.

Zəmanə bağının da baharı, başı sənsən,
Zəmanə bir qəm mülkü, onun naxışı sənsən.

Fanar kimi asılı ərzi çal öz daşına,
Külü qoy su səpilmiş ulduzların başına.

Aləmin xəyal, uyğu büsatından uzaqlaş,
1665 Bərbadından uzaqlaş, abadından uzaqlaş.

Gözün qalmasın çərxin şəfəq, işıq payında.
Qaralt küsuf kimi sən Günəşi də, Ayı da.

Dünya çadırı göydə Ay qulyabanı kimi,
Azdırıb İbrahimi yolundan etmədimi?

Gəncliyinə dağ çəkib, fələk sürüklər hara?
Nəşəli günlərini dərdli, qəmli çağlara!

İşıqlandıra bilsən, inan, könlünü bir gün,
Ağ günü, səadəti qaytarmaq yenə mümkün...

Ümid gülabı kimi təmiz göz yaşı tök ki,
1670 Təmizləyə biləsən bu qara, ağ lövhəni.

Ölçüb-biçsən işini bu dünyada sən əgər,
Məhşər tərəzisində qazancın artıq gələr.

O din ki, qüvvət verir qoluna axşam-səhər,
Sənin tərəzinin də əyarını düzəldər.

Düşüncəli, hünərli, qəlbi azad olan kəs,
Din qəmi çəkər ancaq, dünya qəmini çəkməz.

İstəsən ki, bu aləm daim məskənin olsun,
Dini Nizamiyə ver, dünya qoy sənin olsun.

## On üçüncü söhbət

## DÜNYADAN ƏL ÜZMƏYƏ DAİR

Ömür az, dünya qoca... uymuşuq ahənginə,
1675 Aldanma bu köhnənin tazələnən rənginə.

Dəliqanlı görünən bu Pirin əlindəki,
Əslində bir atəşdir, tutub qızılgül təki.

Məbadə aldanasan, çeşməsini ilğım san,
Qibləsi xaçdı, qorx ki, uyub namaz qılasan.

Bu qədər güldən sənə çatmaz bircə tikan da,
Çöp də aparmaq olmur, dağlar qədər yığsan da.

Yalnız gəldiyin yerdən, evdən gətirdiyini,
Apara biləcəksən, başqa heç bir şeyini.

Qiyamət dənizindən kimlər yaxa qurtarar?
1680 Yalnız yükü dənizə atıb çılpaq qalanlar!

Fərqi yoxdur, ya payla, ya da yığ sərvətləri,
Sənə hər nə veribsə, alacaq dünya geri.

Aləm əzəldən bəri alver evinə bənzər:
O dünyanı alırlar, bu dünyanı verirlər.

Barama qurdu kimi biri hazırlar ipək,
Biri həmin ipəyi kəsib yeyər güvətək.

Şam kimi saç yığdığın cəfəri qızılları,
Şam kimi öz nurunla işıqlanasan barı.

Söküb tök bədənini - doqquz dəlikli bütü,
1685 Altı başlı altunu doğra, dağıt büsbütün.

Sal ayağın altına, qızıl alma əlinə,
Qızıl qulu, bütpərəst deməsinlər qoy sənə.

Bir zərin ki, olmaya məqsəd, amal sikkəsi,
Zər deyil, zərnixdir o, yox dəyəri-dəyməzi.

İndi ki, bənd olmusan qızıl parıltısına,
Get, tovuz quşu bəslə, yüz rəng göstərir sana.

Yalnız dəmir gücünə sikkələnir qızıl, zər,
Dəmirçilər hünərdə şahdan əskikdir məgər?

Tac qayırıb qızıldan, Harun qalxdı, ucaldı,
1690 Qızılın ağırlığı onu quyuya saldı.

Başında gəzdirirsən, yük olar qızıl sənə,
Aparar səni, ayaq bassan üzəngisinə.

Qızılı heç almamaq verməkdən xeyirlidir,
Çünki qızılı vermək can verməyə bənzəyir.

Qızılı aldığın vaxt sənə tamah verirlər,
Qızıl əldən gedəndə qəlbə rahatlıq gələr...

Nə qədər yığsan belə, əldən çıxacaq tez-gec,
Canın rahat olmazmı qızıl yığmayasan heç?

Qızıl yığmaq dərd verir, baş ağardır səfratək,
1695 Onu meyvətək yeyib, dərdi dağıtmaq gərək.

Gündoğandan yayılmış qızıl butün cahana.
Fəqət günbatan zəri deyib cahillər ona.

Səxavətə düşməndir həm Qərb, həm də Qərb əhli,
Şərq ilə Şərq əhlisə səxavətin məşəli.

Şərqin sultanı Günəş nə verirsə hər səhər,
Axşamüstü Qərb alar, dilənçitək dilənər.

Quşların qol-qüvvəti yalnız qanadlarında,
Yaltaqların qüdrəti qızıl adlı varında.

Dəməşqin məhəngilə eşqin tərəzisində,
1700 Rum qızılı yoxlanıb xalislik bildirsə də.

Gözlər qamaşdırsa da, başına kül tök onun,
Çoxu qurbanı olmuş aldadıcı altunun.

Qızıl kimin başından qapmayıb papağını,
Kimin qulyabanıtək kəsməyib qabağını?

## XAİN SOFU İLƏ HACININ DASTANI

Bir Kəbə mübtəlası hazırlaşdı səfərə,
Öyrənib bələd oldu qaydalara, dəblərə.

Ehtiyacından artıq bir az qızılı vardı,
Öz halal dinarını kisəsində saxlardı.

Düşündü: filan sofu əl çəkibdir dünyadan,
1705 Tanrı bəndəsidir o, azdır bu cür düz adam.

Ürəyimə damıb ki, dəyanət də ondadır,
Qoy verim zəri, deyim: əmanət də ondadır.

Bu niyyətlə sofuya o baş çəkdi bir gecə,
Kisəsini əmanət verdi ona gizlicə.

- Yaxşı saxla bu sirri, - tapşırdı dönə-dönə,
Qayıdaram, kisəni yenə verərsən mənə.

Xacə səfərə çıxdı, düşdü yolun ağına,
Şeyx də sərin qızılı basdı yanan bağrına.

Titrəyirdi ürəyi neçə illərdən bəri,
1710 Bu qızılın sapsarı şöləsindən ötəri.

- İşlərimi bununla düzəldərəm! - söylədi,
Yolunu gözlədiyim xəzinəm əlimdədi.

Tanrının mənə bir az gec verdiyi neməti,
Gərək tez ötürüm ki, qaçırmayım fürsəti.

Kisənin boğazından ilgəyi açdı səfil,
Neçə gecə kef çəkib, şadlıqdan uçdu sofu.

Yaxasına keçirdi qızıl dolu kisəni,
- Göbəyimin üstündə görüm, - dedi, - qoy səni.

Cingildətdi pulları, bu səsdən xumar oldu,
1715 Gözəllərin saçları boynunda zünnar oldu.

Heyhat, parçalanınca şeyxin dərviş xirqəsi,
Zövqün yerini tutdu günah, qəm düşüncəsi.

Sofu elə yedi ki, əlinə düşən ovu,
Çırağı da bir gilə yağın möhtacı oldu.

Bizim hacı elə ki, Kəbədən geri döndü,
Öz hindlisi önündə bir Türk kimi göründü.

- Gətir, ey zahid! - dedi, - gətir görək bir onu.
Zahid soruşdu: - Nəyi? Hacı dedi: - Altunu!

Sofu işarə qıldı: - Sus, lütf elə bir qədər,
1720 Xaraba kənddən axı kim xərac ala bilər?

Sağlığına qızılı sərf elədim bazara,
Mənimtək müflis hara, dinar kisəsi hara?

Türk ki yəğma elədi, kim dayanar önündə?
Evini hindli qula ismarlar hansı bəndə?

Belimi qırdı mənim o rükni qızılların,
Dözə bilmədim, yedim, boynumdadır vəbalın.

Min bir sevinc içində sofu malı yemişdi,
Min bir göz yaşı töküb üzr istəyirdi indi.

- Kərəm eylə, lütf qıl, yaman peşman olmuşam,
1725 Kafər idim, dönmüşəm, bir müsəlman olmuşam.

Cahanın təbiəti min fəsada boyludur,
Bir fəsad da yarandı, təkcə mənimmi qüsur?

Hacıdakı mərhəmət qopartdı bir qiyamət:
"Əfv et, önündə dərviş ayaq üstə durub pərt!"

Demək, Tanrıya çatdı Tanrının verdikləri,
Zəhməti zərgər çəkər, zəri qapar müştəri.

Öyüd verdi özünə: - Azca təsəllimiz var,
Dərvişin heç nəyi yox... Heçdən nə almaq olar?

Bir arpası da yox ki, tutub alam əlindən,
1730 Çarəm nədir? Taleyə boyun əyməliyəm mən.

Sofünun boğazından keçən o maldan qalan,
Başı halqalı "Mim"lə kufi "Əlif'dir, inan.

Əfv olunmaq istəsən, ey Şeyx, qulaq as mənə:
Haramın olanları halal edimmi sənə?

Neştər batır nəfsinə, ey fələktək saxtakar,
Ac gözlü, qısa yenli, uzun əlli tamahkar!

Heç bir ürək nəfsdən, tamahdan ayrı deyil,
Vəfalı, etibarlı kişi yoxdur, bunu bil!

Din - əyarı qızıldır, vermə onu şeytana,
1735 Fəğfurun şərəfini layiq görmə səgbana.

Dini şeytana versən, cəzanı sən çəkərsən,
Müflisə verilən mal geri dönməz yenidən.

Dünya pislik yurdudur, axirət qazancıyıq,
Tutub din ətəyindən bir guşə tap, ey yazıq!

Bu yolların bəkçisi - yağmaçı quldurbaşı,
Burda müflis zəngindən, yoxsul varlıdan yaxşı.

Müflislərə toxunmur bu fələyin tilsimi,
Yalnız möhtəşəmlərin qırır qafiləsini.

Bu vəfasız dünyadan könlüm bir az halıdır,
1740 Arını məhv eyləyən öz şəhdi, öz balıdır.

Tamah salan varmı heç acı aslan ətinə?
Öləndə qurd-quş belə toxunmaz cəsədinə.

Ayaq üstə duran şam xonçada, başda gəzər,
Bədirlənmək istəyən Ay incələr, əksilər.

Torpaqla qurd dostluğu eləyir daim külək,
Özü yüngül, əli boş, heç nə itirməyəcək.

Göl quşları bilir ki, balıqların bəlası,
Gümüş pullarındadır, pullar ovun aynası.

Sənin diləklərinin tərəzisi olan zər,
1745 Beş rükət namazının fatihəsinə bənzər.

Əgər Nizami kimi sən pak ola bilməsən,
Bu arzu yollarında çətin kama yetəsən.

## On dördüncü söhbət

## QƏFLƏTDƏN OYANMA ŞƏRTLƏRİ

Ey qəflət yuxusunda xoşbəxt uyuyan xumar!
Yeyən, içən eşşəkdən, öküzdən fərqinmi var?

Xəbərsizsən aləmin bu mavi günbəzindən,
Dövr eyləyən günəşdən, göylərin mərkəzindən.

Sirri dərk edir ancaq nəzər əhli başbilən,
Nadanın nə ilgisi dövrün keşməkeşiylən?!

Vaxtdır, iş başına keç! Gözün bağlanıb neçin?
1750 İşini elə gör ki, işbilənlər bəyənsin.

Bərk yatmısan, yolunda tələ qurublar, oyan!
Məgər bu cür yatarmı iş bilən, iş anlayan?

Yığın-yığın qəmləri, sabahını düşün sən,
Qəm arxalı, qəm güclü, sən nə qədər zəifsən.

Sənin ağlın yaddaşsız bir qocadır, imdad et,
Yada salmır o səni, barı sən onu yad et.

Əgər yar olmasaydı ağlın, idrakın sənə,
Səni kim qaldırardı insanlıq pilləsinə?

Ağıl - Məsihadır, bil. Ondan üz döndərmə sən,
1755 Eşşəksənmi, palçığa eşşəyini sürəsən?

Ya get ağıl yoluyla, çıraq tapıb işıqlan,
Ya da biryolluq əl çək sən onun qapısından.

Xumar olma, korşaltma o parlaq ağlı, huşu,
Yedirmə bir sərçəyə o boyda qızılquşu.

Mey hər dində halaldır, amma gərdiş dəyişmiş,
Əqlə düşmən olması meyi haram eyləmiş.

Piyalənə tökdüyün üz suyundur, mey deyil,
Çeşmən, dirilik suyun yalnız öz ağlındı, bil.

Gərçi dünya qəmini içki bir az dağıdır,
1760 İçmə, ey xacə, içmə, idrakına yağıdır.

Kabab olan ciyərə səpilmiş duzdur şərab,
Duzsuzlara, kəmlərə qismət olsun bu əzab.

Bu barədə düz xəbər bilmək istəsən əgər,
Mey içmə ki, hər şeydən qoyar səni bixəbər,

Qəflət dünyasındadır kim ki, meyin quludur,
Mey qafilin alnına qəflət damğası vurur.

Boş xəyala bənd olan nəzərə, gözə mil çək,
Xərabata can atan ayağı zəncirləyək.

Öz boyuna "əlif' tək aşiq olan ey məğrur,
1765 Qara sevdaya saldı nəfsin səni, dayan, dur!

"Əlif'sənsə, qanadsız quşadön, barsız yaşa!
Ya "Bey" kimi bar gətir, ömrü gözəl vur yaşa.

Qürrələnmə, "əlif'tək məclislər şamı olsan,
"Əlif' kimi müflissən, "əlif' kimi yoxsulsan.

Sən ki, tikan deyilsən, dırmanma yüksəklərə,
Əlsiz-ayaqsız gül ol, bizi qərq elə ətrə.

Sən ki, çocuq deyilsən, həvəslənmə oyuna,
Sən ki, ömür deyilsən, boy istəmə boyuna.

Bitdi gənclik gündüzü, Günəş getdi batmağa,
Kölgə uzandı, ey nur, çəkil sən də qırağa.

Mən görmüşəm, elə ki Gün batır, qürub yanır,
1770 Hər xilqətin kölgəsi iki, üç qat uzanır.

Neçin kölgəpərəstsən bunca qarğalar kimi?
Düşmən kəsil zülmətə qızıl bir fanar kimi!

Özünü kölgəlikdən qurtara bilsən əgər,
İnan, eyiblərin də kölgən kimi çəkilər.

Zülmətdə əyləşməyə dözə bilmir hər kişi,
Təkcə dirilik suyu görə bilir bu işi.

Başı yerdə, ayağı göydə olan ey qafil,
Sənin fikir göylərin alt-üst olub, bunu bil.

Günəş qızıl teştini hər gün sənə verir ki,
1775 Yuyub mənlik tozunu pak edəsən əlini.

Paltarını bu teştdə təmiz yumaq istəsən,
Ucal, suyu Günəşin qaynağından istə sən.

Günəş yuvarlağını götür, sabuna bənzər,
Qanlı paltarlarını tamam yuyub təmizlər.

Oda, alova döndü səndə həyat yanğısı,
Ciyərində qalmadı hətta bircə damla su.

Nəfs, qərəz kirindən pak deyilsə bədənin,
Qızıl geysən də, daşca dəyərin yoxdur sənin.

Paklıq, təmizlik nuru bürüsəydi hər kəsi,
1780 Kimlə, nəylə dolardı cəhənnəmin mədəsi?

Yalnız cəhənnəmdən yox, hər istidən-soyuqdan,
Səni saxlayan zireh düzlük, paklıqdır, inan.

Əyriliyin yükləyər boynuna neçə nöqsan,
Düz olsan, hər bəladan, hər qəmdən qurtularsan.

Zərgər tərəzisitək dürüst olmaq istəsən,
Gərək hifz eləyəsən ürək düzlüyünü sən.

Sənə halal olmayan hər xırdaca arpadan,
Tərəzinin gözünə əskiklik gələr, inan.

Hər işin birər-birər gələcək öz yerinə, .
1785 Son günündə qəfildən çıxacaq qənşərinə.

Gizli işlərin sənə açıq göstəriləcək,
Az verib, çox almağın ortalığa gələcək.

Bu alverdə özünü günahkar etmə, saqın,
Artıq verib, əskik al, çalış borcun qalmasın.

Gül əyri olduğundan, qoynunda bitdi tikan,
Qamış şəkərə döndü düzlüyü ucbatından.

O yerdə ki doğruluq hökm edər, bayraq açar,
Dada çatan haqq özü onun ardınca uçar.

## ZALIM PADŞAHLA DÜZ DANIŞAN KİŞİNİN DASTANI

Ürəkləri sındıran zülmkar bir şah vardı,
1790 Dirəşməkdə, höcətdə Həccacı mat qoyardı.

Gündüzdən gecəyədək hər pıçıltı, hər xəbər,
Onun sarayındaca cəmləşərdi hər səhər.

Aytək, güntək itigöz bir xəfiyəsi vardı,
Bağlı qalan işləri ustalıqla açardı.

Sübhtək ikiüzlü, Aytək gecə gəzəndi,
Bir gün şahın önündə baş əydi, qüssələndi.

Dedi: - Gizli bir yerdə çox deyindi dalınca,
Səni zalım, qaniçən adlandıran bir qoca.

Casusun dediyindən öfkələndi hökmdar,
1795 Qocanı məhv etməyə fikrində verdi qərar.

Qum tökdürüb üstünə palaz sərdirdi çölə,
Divanə tacidardan qaçardı divlər belə.

Yel sürətli bir cavan çapdı, qocanı tapdı,
- Xain bilir şah səni, oyan! - dedi, - amandı.

O şeytan huylu zalım çağırmamış, özün get,
Yola gətir, inandır, öz dərdinə əlac et!

Destəmaz aldı qoca, kəfən geydi əyninə,
Salam verdi ədəblə, gəlib şahın önünə.

Qızmış, qara niyyətli şah yumruğunu sıxdı,
1800 Arxasında dayanmış qocaya kinlə baxdı.

- Eşitmişəm, - söylədi, - danışmısan dalımca,
Məni qəddar, yelbeyin adlandırmısan, qoca!

Mən Süleyman mülkünün sahibiyəm, bilirsən,
Hansı cürətlə mənə zalım, ya div deyirsən?

Cavab verdi ixtiyar: - Mən ki ayığam, nə qəm,
Sənin dediklərindən beş qat artıq demişəm.

Qocalar da, gənclər də qan ağlayır əlindən,
Kənd, şəhər - bütün ölkə dad çəkir əməlindən!

Mən ki eyiblərini bircə-bircə sayanam,
1805 Yamanını, yaxşını göstərən bir aynayam.

Düz, dəqiq göstərirsə ayna səni özünə,
Özünü qır, aynanı qırmaq yaraşmır sənə.

Sözlərimi araşdır, dinlə ağıl deyəni,
Düz demirəmsə, emr et, dara çəksinlər məni.

Qoca ki öz fikrini mərdanə, şax söylədi,
Düz sözü məğrur şaha bir az əsər eylədi.

Yumşaltdı hökmdarı işin qarası, ağı,
Özünün haqsızlığı, qocanın haqq olmağı.

Kəfənini çıxarın, xələt geydirin ona,
1810 Hökm elədi hökmdar: - Ətir səpin başına.

İstibdaddan, zülmdən o gündən əl çəkdi şah,
Əziz tutdu xalqını, dərdindən oldu agah.

Şahın dürüst işini heç kəs etmədi inkar,
Doğruluğu danmağa axı, kimin şövqü var?

Düzlüklə qurtularsan hər acıdan, ağrıdan,
Qoy düzlük səndən olsun, zəfərlərin Tanrıdan.

- Haqq söz halva da olsa, haqsız üçün acıdır,
Haqq - acı, fəqət hamı həqiqət möhtacıdır.

Sözü yerli-yerində, mətləbi düz söyləsin,
1815 Həqiqətin hamisi Tanrı tutar əlindən.

Nizaminin ki düzdür xilqəti də, qəlbi də,
Başa çatar, inşAllah, hər işi, mətləbi də.

## On beşinci söhbət

## PAXILLARDAN ƏLHƏZƏR

Bu pərdənin dalında ən qəribə oyunlar,
Bu pərdə mahir rəqib, göz aldadan sehrkar.

Çınlayır dünya sazı... rəqqası yoxdur, heyhat!
Dəniz cəvahir dolu... qəvvası yoxdur, heyhat!

Qılınc, tac parıltısı, dirhəm şöləsi, gövhər,
Nə istəsən, buyur seç... bərq vurur xəzinələr.

Cəbrayıla çatmaqmı qəsdin? Yaxşı həvəsdir,
1820 Burda nə tale xəsis, nə də qüdrət xəbisdir.

Ha xərcləsən, bu yatır zənginləşər, azalmaz,
Gəlirin çıxarından çox olar ki, az olmaz.

Qədəm bassan bu yola, hüsnə bax, rəftarı gör,
Çək qapı cəftəsini, ardında əsran gör.

Onun daşları yaqut, onun torpağı kimya,
Babalın öz boynuna, dalmasan bu dünyaya?

Burda qələm sındırıb şair, sənətkar əli,
Burda çox bilməcələr hələ üstü pərdəli.

Bu bağda hər dəqiqə təzə nübar yetişir,
1825 Necə təzə nemətlər, nə sovqatlar yetişir!

Könüllərin telində inci, mirvari nadir,
Gərdənliklər incidən, gövhərdən də gözəldir.

Dünya yolçuluğunda gör nə qədər yol gedən,
Bir az da ağıllıdır daldakı öndəkindən.

Yalnız idrak əhlinə yaraşır şərəf, ad-san,
İdrak üçün fərqi yox, cavansan, ya qocasan.

Eşitdim: qocalırkən mərcana çevrilir daş,
Düşün bir az, hər daşdan mərcan yaranmır, qardaş!

Xəbislər qocaldıqca bir az da quduzlaşır,
1830 Ləçər arvadlar kimi qeyzi başından aşır.

Bir vaxt səni südəmər, çocuq bilən çoxları,
Südün acıdır - deyə bu gün səni oxlayır.

Qocalarda gənclərə qayğı, insaf azalmış,
Cavanlara havadar qocalar lap az qalmış.

Qönçədən çıxmış gülün ətri zərif, incədir,
Fəqət köhnə tikanın yarası bərk incidir.

Dəyib xal salan üzüm - göz üçün bir tutiya,
İlansa qocalarkən dönüb olur əjdaha.

Cavanların başında ağıl qollu-budaqlı,
1835 Kif atan başlar isə çox da xoşlamır ağlı.

Ayı, günü, həftəni öyrənmək istəyənlər,
Baxmaz köhnə təqvimə, baxsa da verməz səmər.

Aslanlardan çox yeyər acgöz, qoca köpəklər.
Ceyranın göbəyini canavar kimi sökər.

Məni çox da qınama, qorxsam qoca qurdlardan,
Mən ki məzlum Yusifəm, yerim də quyu, zindan.

Yox, qocalar gənc kimi vura bilməzlər yara,
Gəncin əlinin suyu bənzər yanar odlara.

Gərçi gənclik igidlik, qəhrəmanlıq çağıdır,
1840 Heyhat, dəliqanlılıq dəlilik sorağıdır.

Ağ yasəmən çatarmı yamyaşıl, tər söyüdə?
Ağ saçları qoyarmı o bənzəsin hindliyə?

Mən ki qızılgül kimi inci, yaqut saçıram,
Cavan ikən qocalıq qovğasımı açıram?

Yalnız xudbinlərdi, bax, bərk tutanlar köhnəni,
Haqqa tapınan ərlər xudbinliyin düşməni.

İndi hilal gördüyün Ay ki, saçır nurunu,
Kamal çağına ercək, bədr adlandır sən onu.

Cavan xurma ağacı yüksəldimi səmaya,
1845 Əlini elə at ki, çata bilsin xurmaya.

Bu tarlaya səpilən toxum sünbülləşincə,
Daha danə söyləmə, bar-bərəkətdi, məncə.

Hövzə arxın suyundan dönüb dərya olunca,
Ona əvvəlki gözlə baxma, ey dargöz qoca!

Gecə gündüzə qarşı yumsa belə gözünü,
Gündüz başqa nəzərlə onda gördü özünü.

Neyşəkər xatırladır öncə adi pencəri,
Fəqət necə yüksəldir onu qəndi, şəkəri.

Dava hərisi olma, hünər qazan, igid ol!
1850 Varlığını hünərə verməkdir ən yaxşı yol.

Sədəfin axar suyu olsa da sonsuz umman,
Bircə damla yağışdır onda inci yaradan.

İstəsən ki, tacında parlaq gövhər görünsün,
Can odunu payla ki, odun gövhərə dönsün.

Bəxt ucaldan bayrağı kim aparır irəli?
Yalnız onu hifz edən igidlərin əlləri!

Sən bu viran vadidə qırmasan buxovları,
İradənin, əzminin olmayacaq ovxarı.

Əl uzatma, qarışma Tanrının işlərinə,
1855 İblisə dəyən qırmanc, ta ki dəyməsin sənə.

Ulu Tanrım, tutmasa hər kim sənin yolunu,
İqrarını qanmasa, inkar edər çərx onu.

**GƏNC ŞAHZADƏ VƏ ONUN QOCA DÜŞMƏNLƏRİNİN HEKAYƏTİ**

Mən bir dastan eşitdim: uzaq Şərq ölkəsində
Yaşarmış bir şahzadə, sərvlərtək azadə.

Varlıların zülmündən iztirab çəkən diyar,
Rüzgar kimi üsyankar, həyəcanlı, biqərar.

Təzə şah təzə ruhlu, köhnələr ehkam güdən,
Şah özü də qorxarmış oyanan fitnələrdən.

Uyumuşdu bir gecə səksəkəli, nigaran,
1860 Röyasında bir qoca ona dedi: - Ey cavan!

Sən ey tazə doğmuş Ay, köhnə bürcü dağıt, qır,
Ey yeni açılan gül, köhnə budağı sındır.

Köhnəni məhv elə ki, yeni əlində qalsın,
Həyatın da özüntək işıqlı, gözəl olsun.

Şahzadə oyanınca verdi bir yeni fərman,
İki-üç müxalifi çıxartdırdı aradan.

Qanad verdi yeniyə, qələm çəkdi köhnəyə,
Təzə şah təzə bir ruh bəxş elədi ölkəyə.

Bəli, fəsad əhlinin gərək kəsilsin başı,
1865 Andı pozan ordunu ləğv etmək daha yaxşı.

Qartımış kötüklərin sən vurmasan boynunu,
Sərvlər bəzəyərmi gülşənlərin qoynunu?

Bağlamasan kökünə tazə bulağı, arxı,
Tufanla güləşərmi çinarın qol-budağı?

Arıtmasan, açmasan gözlərini bulağın,
Gözü gülə bilərmi bağrı yanan torpağın?!

Özünü dərk edənin öz könül vaizi var,
Ən gözəl öyüdləri qulağına pıçıldar.

Ağlını - qılıncını çıxar qınından bir an,
1870 Nə vaxtacan onu sən qında saxlayacaqsan?

Gənclik zəka qılıncı, pak, ülvi bir həmnəfəs,
Köhnə mücrüdən deyil, o qında qala bilməz.

Var-yoxunu bəxş elə, sovqat yolla, pay göndər,
Ta ki sənə səxavət, kərəm əhli desinlər.

Vardan murad götürmüş varlılar, dövlətlilər
Yalnız səxa gücünə var-dövlətə yetdilər.

Yalnız səxa toxumu verir bəhrə, bərəkət,
Qiyamətdə ruzudur kərəm, qüdrət, səxavət.

Öz ehsan xəzinəndən, ya rəb, pay göndər mənə,
1875 Nizami ki qulundur, fərəc ver işlərinə.

**On altıncı söhbət**

## MƏSLƏKDƏ ÇAPUQ İRƏLİLƏMƏ

Ey bir əsim rüzgara əsir, ey başı qallı!
Bir ovuc qum önündən qaçıb gedən zavallı!

Kənd yox, sənsə kəndçinin qapısını döyürsən,
Mülkün yox, dəm vurursan Süleymanın təxtindən.

Qılıncsanmı, vurursan hər gün, bu qədər yara?
Davulsanmı, hay-haray salmısan min diyara?

Sən qılınc ağzı kimi gümüş parıltılar saç,
Nağara qarnı kimi möhkəm ol, cəbrə qatlaş!

Dartır nəfsin şeytanı səni özünə sarı,
1880 Hələ ki, ölməmisən, çəkin, əl vermə barı.

Hər muğun qarşısında əllərini xaç etmə!
Xətiblik sevdasıyla qılınc cənginə getmə!

Adəm asqırığının Məsihə çatdı səsi,
Qoy natiqlərə çatsın yalnız dövlət xütbəsi.

Kim ki pərvanələr tək xoşbəxt, fədakar yaşar,
Bir atəş ordusuyla təkbaşına çarpışar.

Bircə an yaşar, nə qəm, həyat sanar bu anı,
Verər yalnız cismini, alar canı, cahanı.

Sənin verdiyin xeyrat Tanrı yolunda deyil,
1885 Çünki haram qazancın tamam batildi, batil.

Sən aslan ol, çəkinmə kor mətbəx pişiyindən,
Sərt gilə dön, vəhm etmə cəhənnəm atəşindən!

Yalnız saxta sikkənin paxırını açır od,
Oddan nə qorxun sənin, ey saf qızıl, ey yaqut?!

Nə qədər qürur olar, ey dikburun hiyləgər?
Üç batmanlıq sümük, su, torpaq deyilsən məgər.

Cah-cəlal həvəsilə neçələri sənintək,
Gecələr də yatmayıb, vurnuxdular sübhədək.

O cəlalın hasili gör axırda nə oldu,
1890 Xeyri ziyanla bitdi, ömrü əyləncə oldu.

Sən, ey bir parça torpaq, ömrü verirsən yelə,
Ayağını fələyin başına qoysan belə!

Günəş kimi, Ay kimi tutsan belə göyləri,
Sən ki yerin oğlusan, qayıdacaqsan geri.

Kəkilini, başını fələk qoparar, saqın!
Ayaq basma üstünə təhlükəli hasarın.

Quşsanmı, cəhd edirsən daim ucalıqlara?
Əl çəkməsən canından, yetə bilməzsən ora.

Elə dolan ki, fələk özü baş əysin sənə,
1895 Göylər özü yıxılsın sənin qədəmlərinə.

Acı meyi içirsən, zəhərin nə günahı?
Suçlar, qüsurlar sənin, bu dəhrin nə günahı?

Gəl, dövranı qınama, ey xoş xasiyyət insan!
Mənə, sənə hələ ki, pislik etməyib dövran.

Can yandırdı zəmanə, çox çalışdı ki, bəlkə
Biz də bir adam olub çıxaq kəndə-kəsəyə.

Qüdrətimiz çatdımı, yetək o mərtəbəyə?
Neçin suçlarımızı yükləyək zəmanəyə?

Ləlin təbiətində ləl cövhəri yoxsa, qan:
Qəbul möhrü vurdurmaz ona heç bir hökmran.

Dunyanın hər guşəsi daş-kəsəklə doludur,
1900 Fəqət yaqut daşları nadir olur, az olur.

Tikan da, yasəmən də eyni torpaqda bitir,
Biri gözə qaranlıq, biri işıq gətirir.

Bilməm irmaq suyundan xeyir gələr, ya gəlməz,
Fəqət güldən o, rəngi, ətri apara bilməz.

Su gözəllik artırır. Ancaq bilməm, doğrusu,
Çör-çöpü yasəmənə döndərə bilərmi su?

Əhvalatlar, qanunlar qurulmasaydı bunca,
1905 Hər şey alt-üst olardı bəlkə dünya boyunca.

Dövlət gücü əzəli dövlət sahibinindir,
Bizim tədbirimizlə olmaması yəqindir.

Dövlətsizlər düşürlər torpağa üzüqoylu,
Dövlətlinin, güclünün nə fəhmi, nə qorxusu?

Dövlət, qüdrət sahibi bəxtiyardır hər yanda,
Sən dövlətin, qüdrətin qulu ol bu cahanda!

Sərvət, dövlət ucaldır şahları bir dağ kimi,
Dövlət verilmir sənə oyun-oyuncaq kimi.

Yalnız qüdrət əhlinin başına dolan ki, sən
1910 Dala, qabağa gedən çərxə bənzəməyəsən.

Hümmətsizə, nadana qoşulmaqdan nə çıxar?
Dövrün xoşbəxt oğlu ol, yaşa azad, bəxtiyar!

Covza bürcündən doğub, çağır səadətini,
Tap, bir ceviz də sındır, sən də sına bəxtini.

Dövlət qismətin olsa, sus təvazö gözlə sən,
Çəkil, yeddi fələyin qurtar düyünlərindən.

Rahat çağladığından sellər, sular bəxtiyar,
Düyünlü ud ağacı odda yanar, kül olar.

Könül verəm kimsəyə, bir azca ağıllı ol,
1915 Öz yükün sənə bəsdir, onsuz da çətindi yol.

Nə vaxtacan əl atıb özgə budağına sən,
- Dövlətim kaş bir az da çox olsun! - deyəcəksən?

Tutalım, qamarlayıb, aləmi tutdun da sən,
Gedəndə ki, əl çəkib, əliboş gedəcəksən!

Nəfs vurub dağıdır hər cür qayda-qanunu,
Qoy qənaət qılıncı vursun nəfsin boynunu.

Bu firuzə qübbə ki, fovqünə çatmır xəyal,
Sənin üçün genişdir, idrak üçün darısqal.

Ya heç fikirləşmədən keçir dünyanı ələ,
1920 Ya nəfsinlə aləmi öz başına dar elə.

Heyhat, bir könül əhli, uca, ulu qalmadı,
Cahanda mərifətli Adəm oğlu qalmadı.

Bizim doqquz katibin bir cüt hünərnaməsi,
Nişan verə bilmədi məna dolu bir əksi.

Məslək düşmənlərindən dostluq umma sən əbəs,
İlanlar zəhər verər, dirilik suyu verməz.

Məna yolunda yürü, bilik başın tacıdır,
Bil ki, qanan bir düşmən qanmaz dostdan yaxşıdır.

**YARALI ÇOCUĞUN DASTANI**

1925 Hər şeydən azad olan, şən, qayğısız bir bala,
Oynayırdı küçədə iki-üç yaşıdıyla.

Ayağını atarkən yazıq bala sürüşdü,
Yürüdüyü yoldaca üzüstə yerə düşdü.

Addımlaya bilmədi, özünü şikəst sandı,
Sanki təkcə dizi yox, qəlbi də yaralandı.

Təngnəfəs yürüdü çocuğun yoldaşları,
Əsərlənib, pərt olub, çatümışdı qaşları.

Onu sevən bir dostu sözünü uda-uda,
Pıçıldadı astaca: - Ataq, qalsın quyuda.

Sirr aşkara çıxmasın Günəş yayılan sayaq,
1930 Atasının yanında xəcalətli qalmayaq.

Bu yerdə uzaqgörən, sərt bir yavru da vardı,
Yaralanmış çocuğa düşməni tək baxardı.

Ciddiləşib, üz tutdu öz arxadaşlarına,
-Örtmək olmaz bu işi! - dedi yoldaşlarına.

Məndən görərlər. Məni düşmən bilirlər ona,
Büdrəyənin suçunu yükləyərlər boynuma.

-Qoy gəlib çarə qılsın! - Yürüdü zirək oğlan,
Uşağın atasına xəbər apardı əlan.

Kimin ki, xilqətində hikmət cövhəri vardır,
1935 Hər şeyə çarə tapır, həmişə üz ağardır.

Göylər vuran düyünü, soruş, yerdə kim açar?
Ayağını göylərə cəsarətlə basanlar.

Mən çərxin artığından, əskiyindən çəkdim əl,
Bununçün Nizamiyə fələk olmadı əngəl.

**On yeddinci söhbət**

## TAPINMA VƏ TƏCRİD BƏHSİ

Göydə Tanrıdan, yerdə nəfsindən qafil İnsan!
Həmişə can hayında, bədən qayğısmdasan.

Əbəs yerə bu qədər "Mənəm! Mənəm!" deyirsən,
Öləcək mənəmliyin göz yumduğun dəmdə sən.

Qucaqlama cahanı bu mavi qübbə kimi,
Qamarlama səninki olmayan bir aləmi.

1940

Hansı tərəzi çəkər cahanın siqlətini?
Hansı qol ölçə bilər səma səltənətini?

Sən bir toz zərrəsindən dağ qüvvəti istəmə,
Tiyan qaynadan odu bir çınqıdan gözləmə.

Taledən razılıqla kimlər bağlayar kəmər?
Gödəninə, nəfsinə qulluqdan əl çəkənlər!

Tamah miskinləşdirir ən dövlətli kübarı,
Riza tacı gəzdirir qənaət məhkumları.

Bu dünya yollarında nə qədər cibkəsən var!
Kimlərdir rahat? Ancaq cibləri boş olanlar.

1945

Qüdrətlisən, deməık, sən hər dərdə dözməlisən,
Yoxsa, get, dilənçi ol, tut iflas ətəyindən.

Tamam bığsız, saqqalsız, məğmun, darqursaq kosa,
Rast gəldi bir-birini yolan iki yolsuza.

Dedi: - İndicə bildim mən sizdən üzüağam,
Saqqalımı yoldurmaq qayğısından uzağam.

Elm, ürfan xadimləri məsləhət gördü bir vaxt:
Eşşəyi satmaqdansa üstündəki yükü sat.

Sən könül qapısına yetmək istəsən asan,
1950 Yola yüksüz, eşşəksiz İsatək çıxmalısan.

Kəbirlik dərdi çəkmək sən möminə yaraşmaz,
Bu cür göbək sallama, tünük, çevik ol bir az.

Dünya - ölüm dalğası. Yola yüngül yüklə çıx,
Yükü at burulğana gəlsin cana rahatlıq.

Sən ki dalğa üstəsən daim balqabaq kimi,
Qarnı, əliboş olmaq daha üstün deyilmi?

Yemək, yatmaq hələ ki, ucaltmayıb heç kəsi,
Xərabədə yerləşər böyüklər xəzinəsi.

Leş yeyən quzğun kimi qan içməkdənsə, inan
1955 Yaxşıdır qandan uzaq ala qarğa olasan.

Leş yemək qayğısından azad olmaq istəsən,
Cansız, qansız büt kimi asudəlik istə sən.

Ciyər qanı şərabmı? Yox, bir atəşdi - sönmüş,
Oddur, insan zülmündən utanıb suya dönmüş.

Qanının qüvvətini azalt, az ye, yoxsa sən,
Yoğun dəmirlər kimi gürz zərbəsi yeyərsən.

Qarınqulu olmaqdan xeyli yaxşıdır, inan,
Saxlayasan ruzunu, yavaş-yavaş dadasan.

Aslan az yediyindən qurdlara başçı oldu,
1960 Hər şeyi udan ancaq acgöz alovdu, oddu.

Gündüz - göz işığımız, gözün şəfəq çeşməsi,
Nədir yeməyi? Günəş - min ulduzdan bircəsi.

O qədər qurşandı ki, sübhün qızıl meyinə,
Gecə yandı, boğuldu, qan vurunca beyninə.

Çox basıb yeyənlərin ağlı, kamalı hanı?
Bilmir ki, reyhan köklü olur qəmlər qalxanı.

Əqlin - canındır sənin, bədəni, cismi sənsən,
Canın bir xəzinədir, sehri, tilsimi sənsən.

Aça bilərsənmi de, sən xəzinə köksünü,
1965 Qırmasan tilsimini, kəşf etməsən özünü?

Dünya daim sındırıb ona güvənənləri,
Bu cür güvənsiz ilə yoldaşlığın nə xeyri?

Qəm yemə, son çağların aləmə qəm yayanda.
Vecinə almayacaq dünya, sən olmayanda.

Zəncidən soruşdular: - Axı neçin gülürsən?
Üzün qara... əslində ağlayasan gərək sən.

Dedi: - Yaxşı deyilmi örtürəmsə, ay bala,
Üzümün qarasını dişimin ağlığıyla?

Heyrətlənmə, qaranın gülüş görsən üzündə,
1970 Qara bulud saxlamır ildırımı özündə.

Əgər bənd olmamısan bu zindana, əl-qol aç,
İldırım ol, dünyaya qızıl qəhqəhələr saç!

Tutuquşu güləndə çatladı qəndin bağrı,
Kəkliyinsə ağzını yumdu qaqqıltıları.

Ağlamaq daha xoşdur, yersiz gülməkdən, inan,
Yersiz gülsən, gülüşün zəncirini qırarsan.

İldırım kimi gülmək, sonra dərddən ağlamaq,
Ani bir qığılcıma döndərir ömrü ancaq.

Şadlanmadan şam kimi yanmaq nə, gülmək nədir?
1975 Bu gülüşə yaraşan əslində təziyədir.

Saqın! Sən elə gül ki, ağarmasın dişlərin,
Dişinlə, dodağınla sıxılsın gülüşlərin.

Çox ağlamaq aparar gözlərin işığını,
Çox güləndə itirər sevinc yaraşığını.

Hər yaxşını, yamanı, hər köhnəni, tazəni,
Elə qiymətləndir ki, itirmə əndazəni.

Qalx, bu cahan mülkündə qəm də çək, səfa da sür,
Hər ikisi birlikdə - qoşa qanadlı ömür.

Hər sevinən ürəkdə yanğılı bir qəm də var,
1980 Hər gündüzün gövhəri gecə bətnindən doğar.

Hanı elə bir kəs ki, dehr onu aldatmasın,
Dirilik suyu içsin, ölüm meyi dadmasın?!

Səhrada hər karvanın, köçün səfər zəngi var.
Hər şəkər süfrəsinə gəlib milçəklər qonar.

Ağbirçək bir dayədir sənə süd verən rüzgar,
Ona etibar elə yaxşı-yaman nəyin var.

Dünya sirkə verirsə, bal bilərək nuş elə,
Sus, anlamaz!O, daim sənə yaxşılıq dilər.

Bu yolda səbat edən evə salamat gedər,
1985 Xızra Musadır yalnız bu çöllərdə həmsəfər.

Böyüklərin nazını daim çəkəsən gərək,
Ta ki, sənə də çatsın böyüklük adlı çələng.

Yaman gündə yaxşı dost axtarar, tapar səni,
İlişsən, tora düşsən, tordan qurtarar səni.

## MÜRŞİD İLƏ MÜRİDİN HEKAYƏTİ

Pirlər məmləkətində kamil pirlərdən biri,
Yola çıxdı, yanında minlərcə müridləri.

"Yel də, yol da veribdir ulu Tanrımız" - deyə,
Mürşid müridlərinə bir yel etdi hədiyyə.

Şeyxə bütün müridlər bərk etiraz etdilər,
1990 Qaldı yalnız bir nəfər, baş götürüb getdilər.

Sual verdi pir ona təəccüblə, maraqla:
- Hamı getdi, sən qaldın... nədir məqsədin, bala?

Mürid cavab verdi ki: - Ey yeri qəlbim olan!
Ayağının tozudur başımın tacı, inan.

Yellə gəlmişəm məgər, burdan yellə gedəm mən,
Hansı od, hansı tufan qoparar məni səndən?

Rüzgar kimi gələnlər rüzgar kimi gedərlər,
Dözüm, səbat göstərər hümmət gözləyən ərlər.

Toz yüngül olduğundan tez qonar, tez də uçar,
1995 Daim yer dəyişənlər bir yerdə tutmaz qərar.

Vüqarlı, uca dağlar yavaş-yavaş doğulur,
Səbirli, sabitdi ki, əzəmətli dağ olur.

Pərdə yırtmaq zamanın əzəli vərdişidir,
Ağır yük daşımaqsa kişilərin işidir.

Sən ki eşşək deyilsən, əl çək bədən yükündən,
Zahidlik yükü daşı, xam deyilsən, əgər sən.

Sənin zahidlik xəttin əyilməsə, düz olsa,
Yas nədir bilməyəcək, hamı batsa da yasa.

Zahidliyin göz diksə zərli şah xələtinə,
2000 Bənzəyər Süleymanla zənbil hekayətinə.

Dəruni zahidliyin qəbası altında şam,
Hidayət nuru saçar, qızıl saçar hər axşam.

Xoşdur, zahid görünsə hətta meyxanələrdə,
Xəzinələr saxlanır çünki viranələrdə.

Zər yelənli bayrağın altında olduğundan,
Nizami zahidliyi səfa gətirir müdam.

### On səkkizinci söhbət

## İKİÜZLÜLƏRDƏN ƏLHƏZƏR

Daim özünə bənzər saxta sikkələr kəsən,
Qəlbi kimi boş qəlib yapanları tanı sən.

Gendən bax, üzdən tanı, onların içi zülmət,
2005 Sirr vermə, barmağına dolar səni kəmfürsət.

Qarşında işıq kimi parlaq görünər onlar,
Arxanca kölgə kimi oğrun sürünər onlar.

Üzdə şam kimi dümdüz, içi ud kimi düyün,
Düzlüyün arxasında əyrilikdir gördüyün.

Səndən həzər vurarlar nöqsanını görənlər,
Yaxşını tez unudub, yamanını görənlər.

Öpüb qucarlar səni, sözdə məhəbbətləri,
Dərinlərdə qıvrılar kinləri, nifrətləri.

Nitqləri alovlu, ciyərləri buz kimi,
2010 Ürəklər çoxdan ölmüş, özləri toppuz kimi.

Vurma can məhəkinə, zay olduğu bilinər,
Ayaq basma o yerə, əsrik deyilsən əgər.

Xəzinə gizlədiblər dağda, bu sirri açma,
Rüsvay edərlər səni, yanlarında danışma.

Küy basarlar: guya sən can-ciyərsən onlara,
Yalmanıb, yaltaqlanıb səndən yol umanlara.

Sülh edərlər səninlə, zay etməkçün sübhünü,
Allah vursun onların ülfətini, sülhünü.

Nəfs, mənfəət güdən hər ünsiyyət, hər tədbir,
2015 Düşmənliklə mayalı dostluğun kəfənidir.

Gəlir güdən dostluğun məgər səliqəsi var?
Xeyr! Düşmənlik ilə gizli əlaqəsi var.

Dost sənin zəhərini qənd sanar, şəkər bilər,
Eybini də az qala ləyaqət, hünər bilər.

Dost rahatlıq, səadət verən məhrəmdir sənə,
Əgər belə deyilsə, uyma, dərd, qəmdir sənə.

Həddini aşan sevgi bənzər atəşə, oda.
Pişik istədiyindən yeyər balasını da.

Dost kimdir? Dost sirrini saxlayan bir vəfadar,
2020 Məgər dostmu yel kimi hər pərdəni açanlar?!

Onların fikri-zikri səni yolmaq, şaşırmaq,
Qazancını, ruzunu bir əfsunla aşırmaq.

Üzdə aşiqin kimi mehriban görünərlər,
Dar gündə atıb qaçar, sanki toza dönərlər.

Qılıq göstərən dostu inkar edirsə qəlbin,
Dost deyil, düşməndir o, buna əmin ol, əmin.

Bədən hardan bilsin ki, kimdir əsil sevgili?
Vəfalı dostu yalnız qəlb tanıyır, can bilir.

Sənin bircə qəlbin var, qəlbində yüz kədərin,
2025 Bir gülün var, böyründə min bir tikan neştəri.

Cahan mülkü minlərcə, fəqət Firidun bircə,
İncə rayihə növ-növ, fəqət beynin kiçikcə.

Aləmdə hər varlığın bir incə pərdəsi var,
Sənin də min sirrini bircə ürəyin saxlar.

Sənin öz ürəyinin qıfılı yoxsa əgər,
Məgər sənin sirrini qıfıllarmı özgələr?

Qəlbi tünük deyilsən, onda bəs nə üçün sən,
Sirrini Günəş kimi ərzə bəyan edirsən?

İncə könlün sirrini faş etsə, yanma əbəs,
2030 Tünük şüşələr meyi çox da saxlaya bilməz.

Nəfəsi nəfəsindən ən yaxın dost istəsən,
Onu kənarda gəzmə, öz qəlbindən istə sən.

Bir halda ki, tutmusan ön cəbhədə yerini,
Onda yüz dost içindən seçməlisən birini.

Dostunun dost zatını sınaqdan keçirmədən,
Gizli gövhərlərini qarşısına tökmə sən.

**SİRR SAXLAYAN İLƏ CƏMŞİDİN DASTANI**

Cəmşidin çox güvənli, yaxın həmdəmi vardı,
Gündən nur alan Aytək şahdan işıq alardı.

Oğlan şaha mehriban, şah oğlanın məftunu,
2035 Bütün saray əhlindən üstün tuturdu onu.

Öz xəlvət işlərini ona açardı bircə,
Etibarda hamıdan sağlam olan o gəncə.

Şaha çox yaxınsa, bir gün o dözməyərək,
Uzaqlaşmaq istədi yayından çıxan oxtək.

Dəliqanlı cavanın könlündə sirr qatbaqat,
Bunları heç bir kəsə aça bilmirdi, heyhat.

Gəldi, bir gün nə gördü qonşu, ağbirçək qarı:
Sönən lalə yanaqlar onunkundan da sarı.

Dedi: - Ey sərvim, sənə əl atdı hansı xəzan?
2040 Sən ki şah irmağından su içmiş bir fidansan.

Sənin ki qismətindir, sarayda zövqü səfa,
Hardandır bu sıxıntı, bu solğunluq, əcəba!

Qocaların kədəri yaraşarmı cavana?
Yanağının laləsi neçin dönüb reyhana?

Sənsən cahan şahının gözdə olan gözdəsi,
Gərək sənin üz-gözün şah təki şölə versin.

Şahı görməklə gülər, şadlıq edər adamlar,
Şaha məhrəm olanlar hamıdan şad, bəxtiyar.

Dəliqanlı söylədi: - Xəbərin yox, ay nənə,
2045 Nələr yatır sinəmdə - sirlə dolu xəzinə.

Od tutdum, külə döndüm səbrimin ucbatından!
Səbrim saraltdı məni, səbrim yandırdı, inan!

Cəlalıtək böyükdür şahın könül aləmi,
Əmanət vermiş mənə sirrini göhvər kimi.

Saxladığım sirlərdən alışıb yanır sinəm,
Heç birini heç kəsə açıb deyə bilmərəm.

Sirri açıb deməsəm, partlayacaq ürəyim,
Dilimi dişlərimlə doğrayımmı, neyləyim?

Bircə gülüşümü də sizdən qızırqanıram,
2050 Sirrin quşu ağzımdan uçub gedər, sanıram.

Xilas ola bilməsəm bu sirlər caynağından,
Qəlbim qana dönəcək, ömrüm zindana, inan!

Hiss edirəm, dözməsəm, atsam sirrin daşını,
Tale elə həmin gün yeyəcəkdir başımı.

-Saqın! Heç kəsə açma, - dedi qarı, - bunları,
Öz sirrinin sirdaşı tək özünsən, bil barı.

Heç bir kəsə güvənmə, açıq deyim qoy sənə:
Hətta öz kölgəni də yaxın bilmə özünə.

Rəvamı qılınc ilə al qırmızı olasan?
2055 Ondansa qızıl kimi kaş saralıb solasan.

Eşitmişəm, hər gecə dilə çox yalvarır baş:
-Saqın! Açma! Amandır, açma sirrimi, qardaş.

Baş saxlamaq istəsən, boşboğazlıq eləmə,
Sirrini gündüz kimi tökmə bütün aləmə.

Dilini saxlayanlar nə dolaşır, nə çaşır,
Hürmək yalnız qudurğan köpəklərə yaraşır.

Tez kəsilər uzun dil, unutma bircə an da,
Dil ağızda gözəldir, qılınc isə qınında.

Rahatlığın rəhnidir bu öyüdün mənası,
2060 Dilin ucundan gəlir canın-başın bəlası.

İstəsən ah çəkməsin qanlı ləyəndə başın,
Dilini dişinlə kəs, sirri açmaqdan daşın!

Dilin şəkər də saçsa, dodaqlarını açma,
Bil ki, divar dalında dinləyən var, danışma!

Çölə bənövşə kimi yaymasan rayihəni,
Kimsə başını kəsməz, yerdən qoparmaz səni.

Eyibləri görürkən sən gərək lal olasan.
Bir az ağır eşitmək, susmaq vaxtıdır, inan!

Yazarkən, qələmini qıs, cilovla bir qədər,
2065 Bil ki hər kəlmən üçün hesab istəyəcəklər.

Axar su kimi pak ol, nə eşitsən, yuyub keç.
Gördüyünü aynatək göstərsən də, dinmə heç.

Uzaqgörən kişilər heç vaxt həddini aşmaz,
Gecə gördüklərini gündüz kimsəyə açmaz.

Bu ulduzlu qübbənin heyranıyam, düzü, mən:
Xəbərçilik edibmi heç gündüzə gecədən?

Sən də bir az pərdəli qalmaq istəsən əgər,
Gecə gördüklərini açıb demə gündüzlər.

Gecənin ürəyində neçə xəzinələr var,
2070 Min-min işıqlı dürrü qaranlığında saxlar.

İldırım kimi odlu ürəklə yaşayanlar,
Gördüyünün yanından saymazyana sovuşar.

Başını doqquz göydən dışarı çıxaranlar,
Dəruni aləminin meydanında at çapar.

Yaxınsa da dillə göz, uzaq biləsən gərək,
Necə ki, saç uzaqdır bədəndən çərək-çərək.

Eşqin gizli qalması bir möcüzə sayılır,
Elə ki üzə çıxdı, xərabatda bayılır.

Sirr düyünü vurarkən din ipliyi seçdilər,
2075 Həllacın da ipini bu pambıqdan eşdilər.

Nə qədər ki, bağlıdır qönçə rahat, salamat,
Dönür qan çanağına açılan kimi, heyhat.

Susmaq səadətinə ağız yetərsə əgər,
Başından keçənləri qəlbin dililə söylər.

Könlünün kasasından yesən, xoşdu bu nemət,
Dilinə dəyən kimi atəş kəsilir fəqət.

Ən gözəl natiqliyin adı sükutdur bu gün,
Sükut ilə yürümək - sənin zəfər yürüşün.

İşıq dolu könüllər sükut etməyi xoşlar,
2080 Ağız açmaz, bu haqqı özgəsinə bağışlar.

Könüllər dünyasında könül lüğəti gizli,
Bu lüğəti şərh edər yalnız ürəyin dili.

Ey Nizami, layiqdir qənaət mülkü sənə,
Çünki dilin xəsisdir, qəlbin - sonsuz xəzinə.

## On doqquzuncu söhbət

## AXİRƏTİ QARŞILAMAQ HAQQINDA

Bizim xəlvət məclisi, görün, nə yaraşıqlı,
On dörd günlük Ay kimi bədirlənmiş, işıqlı.

Qənd, şəkərmi paylayır şamlar gümüş xonçada?
Əlvan təxtlər döşəli, xoş qoxular saçmada.

Yağı kəsilmiş sənə əzəl gündən zəmanə,
2085 Dostluğundan əl üz ki, əsil düşməndir sənə.

Gör qanlı dişlərinə kimləri çəkib rüzgar,
Batıb, onu görüncə dilləri tutulanlar.

Sənə - dindən əl çəkib dünya tələb edənə,
Dinin keşikçiləri, bir görün nə deyir, nə:

"Qayıt ədalətsizin, nakəsin qapısından,
Bu sirlər sarayının ətrafında gəz, dolan!"

Dünya - bu odlu səhra səni coşdurdu... ancaq,
Burda gizlətdiklərin orda aşkar olacaq.

İtləri buz nəfəsli, atəş gözlü gördülər,
2090 İsti kürk geyindilər bu dünyabaz tülkülər.

Kükürd cəhənnəmidir bu zülmət çöl əzəldən,
Xoşbəxt o kimsədir ki, tez ayrıla bu çöldən.

Ağzının suyu axır... nəfsin cəhd elə sönsün,
At kükürd ocağına, od tutsun, külə dönsün.

Qaytar bu ərşdən gələn Tanrı əmanətini,
Qaytar qara torpağa öz torpaq cəsədini.

Qaytar çərxin borcunu, bu torpağı tərk elə,
Torpaq hər nə veribsə, bir gün alır... dərk elə.

Ədəblə, tədbir ilə dağı çiynindən at ki,
2095 Ruhun, can sərbəstliyin qanad çalsın quş təki.

"Mənəm! Mənəm!" deyənlər, gör, bu yolda nə qədər,
Bizim yollarımızı kəsmək istəyəcəklər.

Əqrəbin düşmənliyi əjdahadan beşbətər,
Bu aşkar hücum çəkər, osa xəlvət zəhərlər.

Görünürsə zor-bəla cılız düşmənə bənzər,
Görməməzlik, qafillik hər təhlükədən betər.

Cılız düşmənə qarşı azaltma qeyzini sən,
Düşməni kiçik bilsən sən özün kiçilərsən.

Gör, o gücsüz qarışqa qeyrətlidir nə qədər,
2100 Aslan balalarının gözlərinə mil çəkər.

Gövhərini bərk qoru, azmı bu çöldə quldur?
Təsbeh çevir, dua qıl, qulyabani nə çoxdur.

Könül yolunu kəsən soyğunçular, oğrular,
Tələsini, torunu mənzilə yaxın qurar.

Qorxuram ki, son gecə basqın etsinlər sənə,
Atsınlar imanını çevrənin kənarinə.

Qul karvanı, qafilə gəlib yetdi mənzilə,
Həyat dolu bir gəmi yaxınlaşdı sahilə.

Soyğunçular görməsə, çalış, gizlən yuxutək,
2105 Axar sular kimi ax, qovmursa quldur köpək.

Elə ki, qədəm basdın bu müqəddəs məbədə,
Hər nə almısan qaytar, saxlama bir zərrə də.

Özün gəlməsən bura, bəla gələr başına,
Fırladarlar şələni tapınağın dışına.

Dünyadan köçüb getmək sayılmasaydı hünər,
Dolanardı gecənin, gündüzün çərxi məgər?

Nə qədər ki, keçməyib yaxan divlər cənginə,
Tut könül ətəyindən, sığın imana, dinə.

Şəriət - xoş bir nəsim, canını tapşır ona,
2110 Aləmə bənd olma ki, üst-başına toz qona.

Şəriət gülşənində qızılgülsən, nanəsən,
Təbiətə tapınma, şəriətə tapın sən.

Hər kəsin qapısında sülənmə səba kimi,
Hər çör-çöpün dalınca yürümə hava kimi.

Gördüklərin kölgədir, sənsə nur ol, çıraq ol!
Hər şey sənin olsa da, sən hər şeydən uzaq ol!

Fələk səni dörd yandan çevrələmiş bir çənbər,
Görək ondan qurtula biləcəksən birtəhər?

Fələk bir gün söyləsə nələr keçib başından,
2115 Xəbər versə yaşından, sonsuz çağlayışından...

Onun dərinliyində itib batar mağaran,
O sonsuzluq yanında bir heç olarsan, inan.

Yüz-yüz nitqin, söhbətin bir sükutla bitəcək,
Min-min işin, xatirən ilim-ilim itəcək.

Hələ ki nəfəsin var, yaxşı olar ki, inan,
Bir eşqin qapısında can qoyasan, nəfəs, can!

Bu hala ki, düşmüsən... macal da az... qulaq as,
Eşqin meyindən savay heç nə sənə xoş olmaz.

Hanı, biçə bilibmi göylər elə bir donu,
2120 İki papaqlı oğru çala bilməsin onu?!

Nə iş görsən, inan ki, kin saxlayan bu fələk,
Öz kəskin qələmilə alnına həkk edəcək.

Üzr, naz qapısından de, hansını açdın sən?
Həmin qapı üzünə açılacaq təzədən.

Gözün şuxluq, istehza pərdəsidirsə əgər,
Sənə eyni pərdədə oyun göstərəcəklər.

Dünyada hər yaxşını, yamanı tanıyanlar,
Sənin yaxşını seçər, yamanmı yamanlar.

Kim bu yoldan keçirsə, qoyur bir iz, bir nişan,
2125 Pislik edən qansın ki, çıxa bilməz aradan.

Fikirləş, bu dünyada üzüqara, ya ağsan?
Burdan apardığınla orda tanınacaqsan.

Tikanla örtülübsə, gül özü də tikandır,
Ancaq əttarın adı daim ətir saçandır.

Saxtakarlıq etmə ki, məhşərdə yanmayasan,
Öz nəfsindən, Tanrından heç vaxt utanmayasan.

Sən bu ciyər dağlayan dövrə nifrətlə hayqır,
Bu qan dolu şüşəni çırpıb daşlara, sındır!

Bu əlvan oyuncağı qır ki, əngəl olmasın,
2130 Bu hərfə bir qələm çək, heç izi də qalmasın.

Qurşun rəngli qalanı - bu göyləri zəbt elə,
Bu əbləh xüttəlanı yəhərlə, min, dön yelə.

Elə at çap ki, doqquz minbərindən enərək,
Sənə şahlıq xütbəsi oxusun məğrur fələk.

Sənin borcun - vəzifən bayrağı yerə salmaq,
Mənim borcum - bayrağı ucaltmaqla ucalmaq!

Mən ki, Adəm oğluyam, qanadlanmaq istərəm,
Mələkdən də üstünəm, fələkdən də üstünəm.

Qamətim kiçiksə də, çox böyükdür qiymətim,
2135 Ulduzlar fövqündədir uçuş xəttim, vüsətim!

Susuzam, dərya kimi fəqət coşub daşaram,
Bayquş deyiləm, ancaq, xəzinələr açıram.

Ayağım fələk kimi xəzinə üstündədir,
Fikir, hünər bayrağım fələklər fovqündədir!

## HARUN ƏR-RƏŞİD İLƏ DƏLLƏYİN DASTANI

Xəlifəlik təxtini alırkən ələ Harun,
Ucalmışdı bayrağı Abbas oğullarının.

Öz yataq otağından çıxdı bir gecə yarı,
Bir az dincəlsin deyə gəldi hamama sarı.

Saçını taraş edən saray bərbəri - usta,
2140 Çox dadlı bir xəyala qapılmışdı iş üstə.

Dedi: - Ustadlığımdan agahsan, ey Xəlifə!
Qoy sənə damad olum, xoşbəxt olum bir dəfə.

Toy-düyün xəbərini çəkək bu aləmə car,
Qızını bu quluna nişanlasan, nə olar?!

Bu təklifdən xəlifə öfkələndi bir qədər,
Cilovladı qeyzini, susub, dözdü birtəhər.

Dedi: "Bəlkə çaşdırıb onu zəhmim, heybətim,
Bəlkə vurub başına hamamın hərarəti.

Ağlını itirib ki, sayıqlayır gəvəzə,
2145 Yoxsa dayana bilməz o, mənimlə göz-gözə.

Ertəsi gün bərbəri yenə bir az əylədi,
O qəlp pul üstündəki damğa gördü eynidi.

Bir də, bir də xəlifə o bərbəri sınadı,
Gördü bədbəxt ustanın qırılmayıb inadı.

-Vaxtdır, - dedi, - bu işi ayırd eləmək gərək,
Vəzirilə qonuşdu: - Bir məsləhət ver görək.

Adicə bir dəlləyin göz qoyun təlaşına,
Nə cür alın yazısı yazmaq istər başıma.

Mənə damad olmağı heç ona yaraşarmı?
2150 Görün, nə deyir mənə, üzündə həya varmı?

Yəqin bəla gətirir başıma qəza-qədər,
Gövhərimə atılan daş deyilmi bu məgər?

Öz ülgücü əlində, söz ülgücü ağzında,
Başım qalıb bu iki qılıncın arasında.

Vəzir dedi: - Başqadır bəlkə səbəb, şəhriyar!
Ayağının altında bəlkə bir xəzinə var.

Bu cahil dəliqanlı yanına gəldiyi dəm,
Əmr et, yuxarı keçsin bir az durduğu yerdən.

Höcətləşsə, dirəşsə, əmr et, boynu vurulsun,
2155 Qazaq durduğu yeri, görək nədir bu əfsun?

Usta bərbər dinlədi xəlifənin sözünü,
Cəld yerini dəyişdi, yığışdırıb özünü.

Heyhat, durduğu yerdən ayrılcaq rəngi qaçdı,
Gur, ötkəm səsi batdı, dili, nitqi dolaşdı.

Sözündə, üz-gözündə tamam başqa bir əhval,
Ədəb, tərbiyə nuru yerinə gəldi dərhal.

Xəzinəymiş, sən demə, ayaq basdığı torpaq,
Şah aynasında görmüş özünü, qismətə bax.

Xəzinədən bir addım çəkilən kimi geri,
2160 Yenə bərbər külbəsi qarşılayır bərbəri.

Ayaq basdığı yeri bellə qazıb çapdılar,
Doğrudan da, ordaca bir xəzinə tapdılar.

Bəli, kim ki, dünyada xəzinə üstündədir,
Ağzından gövhər saçır, yerə, göyə hökm edir.

Nizaminin də tilsim qıran söz xəzinəsi
Bir alovlu qəlbidir, bir də büllur sinəsi.

### İyirminci söhbət

### ƏSRDAŞLARIN YARAMAZLIĞINA DAİR

Biz ki əl çəkənlərik mənəmlik qovğasından,
Bəs niyə yapışmışıq dünyanın yaxasından?

Bağlandığın bu dünya yıxdı, xar etdi səni,
2165 Uddu bu qara torpaq gör nə qədər pöhrəni.

Ömür karvanı getdi, soruş indi biz nəyik?
Qafilənin ardınca sürünənlər kimiyik.

Çiynimizdə cüt mələk dərdimizi çəkmədə,
Bizimlə ülfətindən şeytan belə qüssədə.

Dünya işində oduq, xidmət işindəsə buz,
Gah külxan kimi isti, gah da kül kimi nursuz.

Hanı göz aydınlığı, hanı könül işığı?
Şaşırmış insanların olurmu rahatlığı?

Gecədən qaranlıqmış qiyamətin səhəri,
2170 Sübh namaz qılanların hanı bayraq əlləri?

Dodaqlarda qırıldı qayğısız, şən gülüşlər,
Canda nə qüvvə qaldı, nə arzudan bir əsər.

Uç, qanadlan, uzaqlaş sən bu qanlı tələdən,
Çarə yalnız ayıqlıq, vermə fürsəti əldən.

Qurd tülküdən dişlidir, tülkü qurddan bic, zirək,
Sivişib xilas olur daim kələk gələrək.

Cəhd et, verdiyin sözü yetirəsən yerinə,
2175 Çalışma nəfsin üçün, çalış Tanrı xeyrinə.

Külə döndər qəlbini, vəfa yalnız ondadır,
İnsaf gilindən doğan reyhanımız ondadır.

Ürəyin qazandığı hər qələbə, hər zəfər,
Sədaqətdən eşilmiş ən möhkəm yaya bənzər.

Görüb tərifləməsən insanda bir hünəri,
Bəlkə əlindən düşüb itər hünər gövhəri.

İnsanda bir qüdrəti görüb vəsf etsən əgər,
Onun qüdrət qaynağı birə beş qüvvətlənər.

Sərraf gözlü bir insan görərsə hünərini,
2180 Əzizləyər, gözünün üstündə saxlar səni.

Yalnız hünər gücünə paka çıxıb bu torpaq,
Heyhat, bu gün dünyada yox hünərdən səs-soraq.

Hünərli, baş qaldırıb, açarsa geniş meydan,
Hünərsiz çalışar ki, bassın onun başından.

Zaman cana doydurub, hünərlini məhv edər,
O qədər dağ basar ki, hünərdən bezər hünər.

Riyazət hünərini bir tamaşa zənn elər,
Ərənlər barəsində qara fikrə düşənlər.

Səxavətli mərdlərə israfçı deyir onlar,
2185 Sədaqəti, vəfanı müftə qulluq sayanlar.

Səxavət onlar üçün yalnız rişxənd qaynağı,
Müdrik söz, qüdrətli söz - qurumuş sel yatağı.

Buz üstünə çəkərlər vəfa nəqşini yayda,
Qaralamaq istərlər Günəşi də, Ayı da.

Kim ki, xoş nəfəsilə rifah, dinclik yaradır,
Onların nəzərində cərahətdir, yaradır.

Şirin söz, dadlı şərbət dadsalar bir dodaqdan,
Şərbətçinin dişini qırmaq istərlər ələn.

Bal göbəkli əncirtək sözlər verən alimi,
2190 Görüb üz turşudarlar sirkə içibmiş kimi.

Fəziləti, hünəri görən bir göz qalmadı,
Qüsur, eyb axtaranlar hey artdı, azalmadı.

Dənizdə inci tək-tək, çör-çöp qədərsizdi, bil,
İnsan övladı üçün bir hünər də az deyil.

Dəclə korun gözündə bircə damlaya bənzər,
Çəyirtkənin qıçını qarışqa qanad bilər.

Ar alan, namus satan dəllallar, qəlbi korlar,
Hünərli, ya hünərsiz hamını qısqanırlar.

Bunlar çamura batmış cəsəddən daha murdar,
2195 Ürəyi parçalayan dərddilər, zəqqumdular.

Tüstü olub boğarlar bircə zəka görsələr,
Yel olub söndürərlər, bir çıraq yansa əgər.

Halına bax dünyanın, gör kimlərdi rəhbəri?
Kimlər məngirləməkdə ən gözəl mövqeləri?!

Evdə öz namusunu qoruya bilməyənlər,
Öz əhditək məni də bəlkə sındırmaq istər?!

Fəzilətdə Ay kimi nurluyam, bilir aləm,
Bu gün incəlsəm belə, sabah bədrlənərəm.

Onlar bəxş edib mənə nə qədər dərdi, qəmi,
2200 Barı bircə çələng də ala biləcəklərmi?

Mənim könül bağımdan dərdiyim hər şerimi
Onlar inkar edirlər əski Nuh qövmü kimi.

Sən ey Xızrın bayrağı, ucal, bir qəza törət!
Yağdır, xoş nəfəsli Nuh, məlunlara min lənət!

Qəlbimdə onlar kimi yamanlıq sevdası yox,
Yad eləsəm onları unutsun məni məxluq.

Onların yamanlığı kinlə nərildəyən od,
Mənim cavabım isə - qılınc kimi bir sükut.

İncisi tək olanda hoqqa hay-haray salar,
2205 Çox olanda dincələr, səsi-küyü azalar.

Lökküldəyər qoca küp, azsa şərabı əgər,
Meylə dolu olanda durular, sakitləşər.

Biliklə dolmusansa, sükut edən bir dağ ol,
Təpədən-dırnağacan diqqət kəsil, qulaq ol!

## BÜLBÜL İLƏ QIZILQUŞUN DASTANI

Bağlar, çöllər, çəmənlər süs verəndə donuna,
Gəldi nəğməkar bülbül qızılquşun yanına.

Dedi: - Bütün quşlardan yaraşıqlı, qəşəngsən,
Bəs nə üçün susursan hamının yanında sən?

Bu dünyaya gələli, səsinlə, cəh-cəhinlə
2210 Heç kəsə bircə nəğmə bəxş etməmisən hələ.

Axı sən əyləşirsən sultanların əlində,
Bir kəkliyin döşüdür gündəlik yeməyin də.

Mənsə ruh aləmindən xəbər verirəm müdam,
Cibimdən göz işıqlı incilər çıxardıram.

Bəs nə üçün yediyim otdur, ələfdir mənim?
Tikanların dibidir daim yuvam, məskənim?

Cavab verdi qızılquş: - Məni yaxşı dinlə sən,
Sükutumu gör mənim, sən də susmağı öyrən.

Mən də bir az bilirəm bu dünyanın sirrini,
2215 Yüz mətləbi qansam da, demərəm heç birini.

Get, zavallı! Vurğunsan alçaq zəmanəyə sən,
Bir iş görmədən yüz yol gəvəzəlik edirsən.

Mənsə məna əhliyəm, feyzim Tanrıma bəlli,
Həm kəklik döşü verir, həm sultan əli, bəli!

Sən boş danışdığından soğulcandır yemin də,
Dilin tikanlıdır ki, tikanlıqdır yerin də.

Xütbə Firidun şahın ünvanına oxunur,
Kimdi məhəl qoyan ki, davul salır vurhavur?

Xoruz banlar, sanar ki, odur açan səhəri,
2220 Onun bu əhvalına yalnız gülər dan yeri.

Fələk görür işini daim dinməz-söyləməz,
Çənbərindən başını heç kəs qurtara bilməz.

Şerinin xoş səsini çox da qaldırma, oğlan,
Nizami tək şəhərə qapanıb qalmayasan.

## KİTABIN SON SÖZÜ

Tanrı yar olsun sənə, katib, sabahın xeyir!
Son nöqtəni qoydum mən. İndi növbə sənindir.

Naxış vur ki, bu xəlçəm səmalarla yarışsın,
Buqələmun qələmim rənglər sərgisi açsın.

Hünər almaslarını can yanğımla əritdim,
2225 Bir qələm bıçağı tək hökmdara bəxş etdim.

Qayadan, daşdan keçdi qılıncımın dəmiri,
Heyif, dəmir kürəmin bir azca dardı yeri.

Mənə tale dövləti yar olsaydı, bəlkə də,
Çıxmaz idi əlimdən hədiyyəm bu şəkildə.

Ürəyimə damıb ki, günahkaram bir qədər,
Əlimdə qaralanmış, yaralanmış vərəqlər.

Canımda bəslədiyim qızlar ki, gəlin gedir,
Bir neçə al sübhümün ilham yetirməsidir.

Bu əmlik kababından dad bir azca, ey sultan,
2230 Neçin o zəqqum ilə iştahanı pozasan?

Özün oxu diqqətlə, ilkin, hamıdan öncə,
Vur başa, cəlb edirsə səni idrak, düşüncə.

Burda ədəbdən kənar bircə söz belə tapsan,
Poz, əlinlə rədd elə, olsun qeyzinə qurban.

Dinə, elmə biganə söz tapılsa, qəzəblə,
Qələm çək üzərindən, o söz mən olsam belə.

Canımı verməsəydim bu ilahi əsərə,
Sovqat göndərərdimmi mən şəhərdən şəhərə?!

Ayaqlarım bu yurda bənd olsa da... nə zərər?
2235 Əlimdə, ovcumdadır bəlkə bütün ölkələr.

Dövran mənə söylədi: - Sən ki torpaq deyilsən,
Yetər, sayma yerində, ölüvay olma, tərpən!

İlhamımın pərisi əvəzsiz, ulu xilqət,
Uca boyuna görə kaftanı yoxdur fəqət.

Əynindəki yarımdon dizinə çatır ancaq,
Dizi üstə əyləşir buna görə... utancaq.

Uca boyun geyimi boya bərabər gərək,
Ta qalxarkən ayağa, utanmaya o mələk.

Heyhat, cavan, ya qoca, ha dalsınlar seyrinə,
2240 Quru şöhrətdən savay nə düşəcəkdir mənə?

Bizim söz bazarının alış-verişi durğun,
Qızğın hay-harayı var, qızılı yoxdur onun.

Gəncə mənim yaxamdan möhkəm yapışıb hələ,
İraq xəzinələri yoxsa keçərdi ələ.

Bir səs gəldi cahandan: - Ey qul, yetər əyləncə!
Axı kimdi Nizami, axı, hardadı Gəncə?

Tanrıma min şükür ki, yazım vaxtında bitdi,
Ömrüm sona yetməmiş bu kitab sona yetdi.

Başdan-ayağa qədər bəzəmək üçün onu,
2245 İncilərə qərq etdi Nizami ağ donunu.

Könül, bu pak incini ona çatdır, ona sun,
Gövhəri gövhər sacan şaha ərməğan olsun!

## İZAHLAR VƏ ŞƏRHLƏR

1 B. "Şəfqətli, rəhimli Tanrının adı ilə... başlayıram" - müsəlmanların hər hansı işə başladıqları zaman mütləq deməli olduqları ərəbcə ilk cümlə.

İkinci misra Məhəmməd peyğəmbər ilə bağlı bir hədisin məzmunundan götürülüb: Məhəmməd peyğəmbər Tanrının qəbuluna düşmək üçün merac edirkən qapısı bağlı möhtəşəm bir imarət görür: "Ya Cəbrail, bu nə qəsrdir?" sorur və cavab alır ki, "Bu ərşin altındakı Tanrı xəzinəsidir, onun açarı isə şairlərin nitqidir" (prof. Rüstəm Əliyev).

Müəllif burda "həkim" deyirkən özünü və Tanrıya xitab etməyə layiq yaradıcıları nəzərdə tutur.

4 B. Qələmin boynundakı boyunbağı - söz. Qələm - Tanrının qələmi. Hələ kainatı yaratmamış o, bu qələmi "Lövhi-məhfuz"də göylərin lövhəsində saxlamış, onunla varlığın nəqşini çəkmişdir.

6 B. Tanrı fələklərin pərdəsi arxasında baş verən bütün işlərdən agahdır, "pərdəli iş görən"lərin, yəni peyğəmbər mərtəbəsinə yüksələnlərin isə sirrini saxlayandır.

8 B. Birinci misrada insanlara ən nəcib duyğular, müqəddəs fikirlər aşılayan, onları mənən paklaşdıran, saflaşdıran Tanrının böyük mürəbbi, tərbiyəçi funksiyası vəsf olunur. İkinci misra Quranın "Gündüzü ruzu üçün yaratdıq!" ayəsi əsasında qurulmuşdur.

10 B. Səcdə nişanı - möhür yeri. Müsəlman namaz qılarkən alnını möhürə vurur və pak alnında möhür - damğa yeri qalır. Misra "Onların surətlərində səcdə əsəri vardır" hədisinə işarə vurur. İkinci misrada bütün sultanlara, hökmdarlara taxt-tac bəxş edən Tanrının qüdrəti, səxavəti vəsf olunur.

11 B. "Tədbirilə bişirən"... bəndədir, "çiy bilib bada verən" Tanrı, yaxud bütün qüvvətlərdən üstün duran fövqəlqüvvə.

12 B. Öz bəndələrini fitnələrdən, qovğalardan qoruyan Tanrının hami rolu, həkimlər və bilginlər üçün ilham qaynağı olması vəsf edilir.

15 B. "Bu varlıq mülkünün, kainatın sahibi məndən başqa kim ola bilər?" - Tanrıdan savayı kimin qüdrəti çatar ki, belə bir iddiaya düşsün?!

17 B. Ən müdrik alimlər, peyğəmbərlər belə Tanrı sirlərinə vaqif ola bilmədilər.

20 B. İnsanın bədəninə ruhu, canı, gözlərinə idrak işığını bəxş edən Tanrıdır.

23 B. Yerin kəmərinə bənzər dağları, gül tacma bənzəyən səmaları yaradan da Tanrıdır. Hər şey ona minnətçidir. Hər şey Onun böyüklüyündən,cəlalından və qüdrətindən xəbər verir.

24 B. Tanrı öz kəramətini, səxavətini nə qədər ki gizli saxlamışdı, hələ nə gül ilə tikan vəhdəti vardı, nə də şəkərlə qamış birliyi. Kəramətini göstərəndə o, bunları yoxdan yaratdı.

26 B. *İki-üç viran kənd* - Yer kürəsi. Quranda deyilir ki, dünyanın yaradılmasından öncə yerlə göy hələ bir-birindən ayrılmamışdı. Ayrılanda gecə, gündüz yarandı.

27 B. "Quranın" Ənbiyə surəsinin 31-ci ayəsindən iqtibas yolu ilə deyilib: "İnanmayanlar görmədilərmi ki, göylər və yerlər bitişik idilər və onları biz ayırdıq?!"

28 B. *Gövhər* - ulduzlar. Gövhəri sapa necə düzürlərsə, Tanrı göyə ulduzları eləcə düzdü, gecənin qara saçlarına sığal çəkərək, yoxluq tozunu sildi,varlıq yaratdı.

29 B. İki-üç çəmbər - Ay və ulduzlar. Yeddi düyün — yeddi iqlim zonası.Qədim coğrafiyaçılar Yer kürəsini yeddi iqlim qurşağından ibarət olduğunu hesab etmişlər.

30 B. *Günəşin donu* - ağ ipəkdən, gündüzdən ibarətdir. Ayın donu isə qaranlıq gecədir. Tanrı gecəni, gündüzü belə bir hüsn ilə yaratmışdır.

31 B. Dənizlərin, ümmanların buxarlanması buludların yaranmasına səbəb oldu. Bir vaxt Xızr peyğəmbərin zülmətdə tapdığı dirilik suyuna bənzər bulaqlar, çeşmələr çəmənlərin yaşıl sinəsində qaynamağa başladı.

32 B. *Gündüz badəsi* - Günəş şüaları. *Şəfəq qətrəsi* - lələ.

33 B. Su - yağış suyu. Od - Günəş şüaları. Dənizlər dibindəki ağappaq dürr və Yerin təkindəki qırmızı yaqut əslində təbiətin nadir möcüzəsi kimi su ilə Günəş şüalarının torpaqda, daşdakı vəhdətindən yaranmışdır.

34 B. Al qırmızı ləlin daş içində necə yaranmasını aydınlaşdırır. Küləyin,qasırğanın, tufanın şiddətindən, Günəşin istisindən buxarlanan su havaya qalxır və daşın, qayanın bağrına enir, sıxılır və yaranan ləlin rənginə qırmızılıq verir.

35 B. *Səxavət bağçası* - dünya gülşənləri, barlı bağlar. *Söz quşu* – yaradıcı ilhamın səsi.

36 B. Dil - nitq bağçası, xurma ağacı; söz - xurma; qulaq - sədəfi – şair kəlamı; dürr, gövhər.

37 B. Şirin yuxu pərdə dalında əyləşmiş şirin dilli bir gözələ oxşadılır.İkinci misra Quran ayəsindən iqtibas edilib: "Qoy adam baxıb görsün ki, nədən yaranıb? O, cərəyan edən sudan yaranıb!"

38 B. *Yerin saçı* - qədim astronomların fikrincə, yer yuvarlığının konusvarı kölgəsi.İkinci misranın məzmunu Quran ayəsindən alınıb: "...Adəm öz Tanrısına asi olub (qulaq asmayıb) yolundan azdı". Buna görə cəzalandırılmış və cənnətdən qovulmuşdur. "Vurdu üsyan damğası yanağına" buna işarədir.

39 B. Hədisə görə qızıl alçaq keyfiyyətli filiz sayılırmış. Lakin danışıq zamanı Məhəmməd peyğəmbərə Tanrı dərgahından vəhy gəlmişdir ki, qızıl xalis ülvi filizdir. Onun təbii şöhrətini bərpa etmək vacibdir.

İkinci misrada gülün qırmızılığı qadınlara məxsus heyz (aybaşı) hadisəsinə oxşadılır. Yağış yağanda gülün qırmızılığı nisbətən gedir, rəngi solur, deməli, heyzi aradan qalxır.

40 B. Guya Tanrı ulduzları göyə düzməmiş, göyün rəngi hisli, paslı təsir bağışlayırmış. Ulduzlar düzüləndən sonra göylər cilalanmış və hazırkı görkəmini almışdır.

Səbanın reyhanlara tapşırılması məcazdır. Tanrı tərəfindən ruzigarın pak və ətirli yaradılmasım alqışlayır.

41 B. *Torpağın qanı* - torpağın qüdrəti, bərəkəti. Gülün qırmızılığı torpağm qanı, qüdrəti məcazı ilə mənalandırılır. Burada torpaqdan yaranmış insanın təbiətin ən böyük yetirməsi kimi qızılgülə bənzədilməsi ideyası da vardır.

İkinci misrada idraki fəaliyyətin yalnız emosional ruh ilə qaynayıb qarışması zəminində fayda verəcəyi fikri irəli sürülür. Nizaminin fikrincə, yalnız, başı ilə düşünən, soyuq düşünən adam həqiqətə çata bilməz, həm də ürəklə düşünmək, ürək vasitəsilə fikirləşmək, düşüncəni hissi-emosional fəaliyyətlə birləşdirmək vacibdir.

46 B. Vəhm (*düşüncə*) özünə güvənərək Tanrının mahiyyətini dərk etməyə çalışdı. Heyhat, nail olmadı. Göz (vəhmin gözləri) axtardı, heyhat, o da kainatda Tanrının bənzərini, tayını tapmadı.

48 B. Kainatda Tanrının xəlq etdiyi hər nə varsa, hamısı onun eşqilə yaşayır, onun mahiyyətini dərk etməyə can atır. Heyhat, bu mumkün deyil.Yaradılmış yaradıcıdan yüksək dayana bilməz.

49 B. *Sidr* (*Sidrət ül-Müntəha*) Quran təliminə görə göyün yeddinci qatmda bitmiş əzəmətli bir ağacın adıdır. Sidr ağacının qol-budağında əyləşənlər və ərşə çıxanlar mələklərdir.

50 B. *Fələklər* (*göylər, çərx*) Tanrının qolu bağlı köləsidir. Fəqət hamısının, yerin də, göyün də ürəyi onun məhəbbətilə döyünür.

52 B. Tanrının yaratdığı kainat sonsuz olduğu üçün bizim gördüyümuz dünya nemətləri onun cəlalı qarşısında bircə danə kimidir. Sonsuz gülşənlərinin, bağlarının yanında əfsanəvi cənnət bağı (İrəm bağı) heç kimidir.

53 B. *Tovhid* - təktanrılıq, monoteizm, Tanrının bircə, yeganə vahid olmasını qəbul etmək. Nizaminin ata yurdu Gəncə, bu məfkurəni qəbul etdiyinə görə çiçəklənir, bar, bəhər yetirir.

## TOVHİD VƏ MÜNACAT

54 B. İslam anlayışına görə torpaqdan yaranmış insan onun xüsusi bir növüdür - zəif torpaqdır.

57 B. Quranm: "O doğmayıb və doğulmayıb" ehkamına ("əl-İxlas" surəsi, üçüncü ayə) işarədir.

59 B. *Can duzu* - ruh.

60 B. Əzəli və əbədi bir qüdrət olan Səndən başqa kimin cürəti çatar ki,müdrikliyin, qocamanlığın qarşısında xeyli gənc və az qala südəmər görünən bu əbləh, bu ikiüzlü, gecəli-gündüzlü dünyanın üstünə qışqıra bilsin ki, "həqq-mənəm, bu varlığın şəriksiz sahibi yalnız mənəm!"

61 B. Məhəbbətin könüllərdə o qədər əzəmətlidir ki, adın çəkiləndə eşq sahiblərinin bağrı çatlaya bilər, yaxşı ki onlara məhəbbətlə birlikdə səbir,səbat vermisən!

62 B. Sənin səxavətin, kəramətin aşkar olan gündən bəri Yer yuvarlağı öhdəsinə nə boyda məsuliyyət düşdüyunü anlayır, çiynində özü boyda yük daşıyır!

63 B. Lütfündən, səxavətindən yarandığını anlamasaydı, məgər Yer yuvarlağı, bəşəriyyətin və dağların ağırlığına tab edərdimi, onun ürək-göbəyi düşməzdimi?

67 B. Sənin birliyini dərk etməyə çalışanların qarşısından hər çür maneəni götür, hətta o maneə mən özüm olsam belə, rəhm eləmə, götür yolundan və qiyamət qopar!

71 B. *Zülmətbazlar* - Günəşə və oda tapınan atəşpərəstlər. Gövhərpərəstlər - antropomorfistlər və Tanrını cisim şəklində təsəvvür edənlər.Nizami onları müsəlmanlıq qarşısında əngəl sayır və rədd edir.

72 B. *Altı guşə* - altı cəhət: yuxarı, aşağı, ön, arxa, sağ, sol; *Doqquz pillə*- göyün doqquz təbəqəsi. Beytin mənası: qiyamət qopar, kainat zəlzələsi yarat, hər şeyi dağıt, məhv et!

73 B. Səmaların şənlənməsinə son qoy! Ayın işıq dolu camını Yer yuvarlağına çırpmaqla sındır! Tərslik, nəhslik rəmzi Zühəl (Saturn) ulduzunu muğənnilərin və musiqiçilərin hamisi olan, işrət məclislərindən başı ayılmayan, daim çalıb-çağıran Veneranın (Zöhrə xanımın) piyaləsinə çırp!

## PEYĞƏMBƏRLƏRİN SONUNCUSU HƏZRƏT MƏHƏMMƏDƏ GÖZƏLLƏMƏ

114 B. Tanrı dərgahında saxlanan "Lövhi-məhfuz"da Tanrının yazdığı birinci hərf - ərəb əlifbasının ilk hərfi - şaquli düz xətdən ibarət "Əlif olmuşdur. Ərəbcə şanlı, şərəfli mənasını verən Məhəmməd və Əhməd sözləri eyni kökdən olduqları və eyni mənanı bildirdikləri üçün Həzrət peyğəmbər ikinci adı ilə də məşhurdur.

115 B. Həzrət peyğəmbərin ikinci adındakı ("Əhməd" sözündəki) hərflər mənalandırılır. *Əlif*- Əhməd sözünün qapısı; Əlifin üstündəki həmzə işarəsi- qapı rəzəsi və onun qıfılının açarı; *hey* - dövlət dairəsi; *dal* - gərdənlik,boyunbağı; mim- kəmər, xidmətdə dayanmaq hünərindən xəbər verən qurşaq.

118 B. Nizami turuncun bu keyfiyyəti ilə Həzrət peyğəmbərin həyatı və taleyi arasında yaxın bənzəyiş görür. Bütün peyğəmbərlərdən, bütün Tanrı elçilərindən sonra gəlməsinə baxmayaraq, Həzrət Məhəmmədin adı Tanrı dərgahındakı "Lövhi-məhfuz"da ilk peyğəmbər sifətilə yazılıb. Deməli, turunc kimi o da öncə bar gətirib, bundan sonra çiçəkləyib, yəni bütün peyğəmbərlərdən sonra zühur edib, bəşəriyyətə bəlli olmuşdur.

119 B. "Adəm hələ su və torpaq şəklində olarkən mən peyğəmbər idim"hədisinə işarədir.İkinci misra islam fəlsəfəsinin belə bir müddəasına əsaslanır ki, Məhəmməd peyğəmbərlərin sonuncusudur, ondan sonra dünyaya bir daha peyğəmbər gəlməyəcək.

120 B. İslam əsatirinə görə Məhəmməd peyğəmbərin möcüzələrindən biri "şəqqül qəmər" - onun barmağının işarəsilə ayın tən ortadan parçalanmasıdır. Guya həmin gündən etibarən parçalanmış, incəlmiş Ay onun hakimiyyət möhürünə çevrilmişdir. Nizami heç bir zəbərcəd qaşlı üzüyün gözəllikdə, şərafətdə bu möhürə (Aya) tay olmadığını bildirir. Zəbərcəd sarıya çalan yaşıl daşdır. Qədim astronomların fikrincə, əslində yaşıl rəngdə olan Ay da, günəş şüalarını əks etdirdiyi üçün sarımtıl görünür.

121 B. Ərəb əlifbasında yazılışına görə "Mim" hərfinin baş tərəfi dairəcikdən, həlqədən ibarətdir. Nizami bunu qulun qulağındakı köləlik həlqəsinə bənzədir və cahanın Həzrət peyğəmbərə qul olduğunu bildirir. Lakin dünyanın özü də dairə, həlqə şəklindədir. Deməli, hər iki dünya Məhəmməd peyğəmbərin qulağı həlqəli quludur, köləsidir.

122 B. Merac zamanı yerdən göyün yeddinci qatına, Tanrı dərgahına bir göz qırpımında getdiyi üçün Məhəmməd peyğəmbərə "sahəölçən" ünvanı verilmişdir.

123 B. "*Ümmi*" - ərəbcə savadsız deməkdir və Məhəmməd peyğəmbərin ünvanlarından biridir. "*Ümmi*" və "*Adəm*" sözləri "*Əlif*" və "*Mim*" hərflərinin yardımı ilə yazılır, "*Məsiha*" sözü də "*Mim*" ilə başlanır. Adların yazılışında hərflərin ortaqlığından istifadə edən Nizami sübut etməyə çalışır ki,Məhəmməd peyğəmbər ondan əvvəl gəlmiş hər iki peyğəmbərdən: həm Adəmdən, həm də Məsihadan (Həzrət İsadan) üstün dayanır.

125 B. İslam etiqadına, görə kainat Tanrının "Kun!" ("Ol!") buyruğu əsasında yaranmışdır. Nizami Gəncəvi Məhəmməd peyğəmbərin adını Tanrı pərgarı ilə yaranmış bu aləmin ən işıqlı nöqtəsi hesab edir, onu dünya üzüyünün qaşı sayır.

*Nüktə* - incə məna, zərif fikirlər və düşüncələr. Nizamiyə görə, Məhəmməd məfkurəsi bütün deyilmişlərə son nöqtə qoymuş, bəşər fikrinin yekunu kimi ortaya çıxmışdır.

128 B. Həzrət Məhəmmədin ailə üzvlərinin ismət, ləyaqət sahibi olmalarına işarədir.

129 B. İslam etiqadına görə Həzrət Məhəmmədin məqbərəsini məhəbbətlə seyr edənlərin cinayətləri və suçu əfv edilir.

İkinci misrada Məhəmməd peyğəmbərin Məkkədən Mədinəyə köçməsi (sentyabr, 621) və müharibədə Məkkə mürtəcelərinə qalib gəlməşi (624-cü ildə) nəzərdə tutulur.

135 B. Həzrət Məhəmmədin yerdə ləng və təngnəfəs, göydə, merac zamanı isə ruh üstündə coşğun, qanadlı olduğunu alqışlayır.

136 B. *Sənət süvariləri* - ozanlar, şairlər; *Boz at* — ilham köhləni, yaxud yaradıcı qələm.

137 B. Həzrət Məhəmmədin meracı başqa şairlər tərəfindən vəsf olunduğu üçün Nizaminin yubanmasma işarədir.

## PEYĞƏMBƏRİN MERACI HAQQINDA

138 B. *Cənub hökmdarı* - Həzrət Məhəmmədin ləqəblərindən biri.

140 B. *Kainatın hərəmxanəsi* - maddi dünyanın göyləri.

142 B. Həzrət Məhəmmədin Tanrı dərgahına meracının ruhi deyil, çismani merac olması nəzərdə tutulur.

145 B. Yəni merac zamanı Həzrət Məhəmmədin bədəni, cismi də ruha, qanada çevrilmişdi.

151 B. *Çərx öküzü* - Sur bürcü; *Yer öküzü* - əfsanəyə görə Yer yuvarlağını öz belində saxlayan öküz; *gövhər*- Məhəmməd peyğəmbər.

152 B. Cevza bürcündə yerləşən ulduzlar öz düzülüş qaydasma görə kəmərə, Xərçəng bürcündəki 13 ulduzun topası isə taca bənzəyir.

153 B. Başaq bürcü Məhəmməd peyğəmbərin meracından o qədər fərəhləndi ki, bu gəlişdən feyz alıb təртəzə sünbülə döndü və "*Sünbülə* " bürcünü qoparıb aslan bürcünə atdı.

154 B. Tərəzi (Mizan) bürcündə yerləşdiyinə görə Zöhrə ulduzu (Venera,Çolpan ulduzu) tərəziçi, mizançı ləqəbini qazanmışdır. Məhəmməd peyğəmbərin merac hünərini səciyyələndirmək üçün Nizami deyir ki, bu gecənin qədrini, qiymətini yalnız Zöhrə özünün Tərəzi bürcündə ölçə bilər.

155 B. Məhəmməd peyğəmbər öz mənəvi əzəmətinə görə o qədər siqlətlidir ki, Tərəzi bürcü bu sanbalın, bu çəkinin qarşısmda səcdə qılmalı oldu.Zira Həzrət peyğəmbərin vəzni Mizan bürcünün daş-tərəzi vəznindən müqayisəedilməz dərəcədə ağırdı.

156 B. Süsənbər çiçəyinin şirəsi əqrəb zəhərindən qurtulmaq üçün məlhəm hesab olunur. Nizami Gəncəvi Məhəmməd peyğəmbərin nəfəsini Sü-

sənbər məlhəmi hesab edir. Həzrət peyğəmbər Əqrəb bürcünün quyruğuna yanaşmaqla onu zərərsizləşdirir.

157 B. Məhəmməd peyğəmbər Yay bürcü kamanından elə bir ox atdı ki,zəhər onun evinin Çəpiş-Cüdəy bürcündən xeyli uzaqlaşdı,qaçdı. Kaman -Oxatan (Qövs) bürcü; Ox (Tir) - Ütarid planeti; Çəpiş - Cüdəy bürcü.

Oxatan bürcünə daxil olanda Ütarid fəlakət törədir. Çəpiş-Cüdəy bürcündə Zühəl (Saturn) planetinin indi də işi fitnə-fəsaddan ibarətdir. Beytin mənası budur ki, Həzrət Məhəmməd Oxatan bürcündən şikaryıxan bir ox atdı və Zühəl planetini Çəpiş-Cüdəy bürcündən qovdu, buranı zəhərlənməkdən xilas etdi, Oxatan bürcündən çıxarmaqla Ütaridi də zərərsizləşdirdi.

Prof. R.Əliyevin yozumuna görə, burada yəhudi Harisin qızı Zeynəbin Həzrət Məhəmmədin çəpişin zəhərlənməsinə işarə edilmişdir.

158 B. Su və yağmurluq bürcü sayılan Balıq (Hut) bürcünün başı Günəşin yerləşdiyi Dolça bürcünə doğru əyilmişdir. Gözəllik rəmzi olan və buna görə günəşə bənzədilən Yusifin qardaşları tərəfindən su quyusuna atılması Günəşin Dolça bürcündən keçməsinə bənzədilmişdir. Dənizdə üzərkən balina tərəfindən udulmuş, Yunis isə bir müddət onun qarnında yaşamışdır... Beytin mənası budur ki, Yusif su dolunda quyuya atıldığı kimi, Həzrət peyğəmbər də Dolça bürcünün günəşidir, başını Dolça bürcünə söykəmiş Balıq bürcünün -balinanın Yunisidir.

159 B. 20 aprel çağlarına təsadüf edir. Sürəyya bürcünün üç hissəsi Öküz bürcündə, yalnız bir hissəsi Quzu bürcündə yerləşdiyi üçün, Nizami səmanm bu hissəsini şah təxtinə bənzətmişdir. Yəni Həzrət Məhəmməd öz Sürəyya təxtini Quzu bürcündə qurandan sonra səhralara, çöllərə bahar gəldi, gül,çiçək ordusu aləmi bürüdü.

162 B. Həzrət peyğəmbər səma gülüstanından keçərkən Tanrıdan əmr gəldi ki, "Sən həndəvərə baxma ki, diqqətin dağılmasın." Həzrət Məhəmməd "Yana baxmadı", yəni bu kəlamı gözləri üstünə qoydu, gözləri bu nur ilə sürmələndi.

163 B. Həzrət Məhəmməd ilə bağlı hədislərdən birinə işarədir: "Mənim Tanrım mənə ədəb öyrətdi"

165 B. Həzrət peyğəmbərin nəfəsinin ətri, mişki gecənin göbəyini mişk-bana çevirdi, aypara isə atı Bürağın ayağında nal kimi parıldamağa başladı.

181 B. Yəni Həzrət peyğəmbər merac yürüşündə maddi aləmi arxada qoydu, Tanrı dərgahına gəlib yetdi.

184 B. Həzrət peyğəmbər meracda ruh üstündə uçub getdiyi üçün canında cismani müqavimət duymurdu.

187 B. Yəni Həzrət peyğəmbər meracda Tanrı dərgahına daha ayaqları üstə deyil, başı üstə gedirdi.

## PEYĞƏMBƏRİMİZİ ÖYƏN İKİNCİ GÖZƏLLƏMƏ

207 B. Həzrət peyğəmbərin ayağının bildiyini özgələrin heç başı da bilmir. Yəni qeyri-adi zəka qüdrətinə malikdir.

210 B. Məhəmməd peyğəmbərin ciddi kişi olduğuna və çox nadir hallarda gülümsədiyinə işarədir.

211 B. 625-ci ildə Ühüd dağı ətəyindəki vuruşmada sapand ilə atılan daşdan Həzrət peyğəmbərin bir dişinin sınması hadisəsi yad olunur.

## SON PEYĞƏMBƏR HƏZRƏT MƏHƏMMƏDƏ ÜÇÜNCÜ GÖZƏLLƏMƏ

227 B. İslam etiqadına görə bədən natəmiz, ruh isə pakdır. Nizami Gəncəvi Məhəmməd peyğəmbərin fövqəlinsan yarandığını, deməli həm cismən,həm də ruhən pak olduğunu bildirir.

228 B. Əski əlifba ilə yazdıqda "zəhmət" sözündəki "Z" hərfi üstündən nöqtə götürülərsə, həmin söz "rəhmət" oxunur. Beytin mənası budur ki, Həzrət peyğəmbər hamının zəhmətini özü çəkdiyi üçün böyük təşəkkür, minnətdarlıq və rəhmət qazanmışdır.

237 B. Orijinalda "günahkar" əvəzinə "ətəyi islanmış" ifadəsi işlədilib. "Yerin göbəyi" deyildikdə, Kəbə nəzərdə tutulur. Beytin mənası budur ki, sən öz nəcib əməllərinlə aləmi üz qaralığından xilas etdin. Kəbə torpağı sənin pak, müqəddəs nəfəsinlə ətirləndi, çiçeklənib şöhrət tapdı.

239 B. Dini etiqada görə, Süleyman peyğəmbər təbiətin bütün xilqətləri, o cümlədən küləyin üstündə hakimiyyətə malikmiş. Onun əmrilə külək qasırğaya dönüb tufan qoparar, yaxud xoş bir nəsimə çevrilib bağların, gülüstanların üstündən əsər, aləmi gül, çiçək ətrinə qərq edərmiş: Nizami Gəncəvi Məhəmməd peyğəmbərin nəfəsini Həzrət Süleymanın mehindən də şəfa-bəxş və ətirli hesab edir, bu qüdrət sayəsində Həzrət peyğəmbərin ata yurdu Hicazın və ümumən, Ərəbistanın cənnət misallı bir məmləkətə çevrildiyini bildirir.

258 B. Cəmiyyətin və kainatın bilməcələrini tam dərk edə bilmədiyinə görə ağıl şikəstdir, onun yeganə loğmanı sənsən, gəl, yol göstər.

Həmişə, yolda, səfərdə olan Ayın da arayıb axtardığı sənsən, gah batır, gah çıxır, gah incəlir, gah bədrlənir. Bütün bunlar sənin vücudunu görmək həsrətindəndir.

## PEYĞƏMBƏRİMİZƏ DÖRDÜNCÜ GÖZƏLLƏMƏ

260 B. Məkkə şəhərində anadan olmuş Məhəmməd peyğəmbərin Mədinədə vəfat və dəfn edilməsini nəzərdə tutur.

273 B. Məhəmməd peyğəmbərin əmisi oğlu və qızı Həzrət Fatimənin əri Həzrət Əli (656-661) öz əfsanəvi qəhrəmanlığı ilə islam dini tarixində

məşhurdur. İkinci xəlifə Ömər (634-644) isə dini əsatirə görə hansı yerdən keçsəymiş, şeytan (iblis) həmin sahəyə üç gün ayaq basa bilməzmiş.

274 B. Rəvayətə görə, Məhəmməd peyğəmbər cümə və bayram günlərində özünün Yəmən şəhərində tikdirdiyi qara cübbəsini geyər və tellərini alnına tökərmiş.

276 B. Nizami Gəncəvi Məhəmməd peyğəmbərin 559 il yatdığını, yəni dünyadan o vaxtdan bəri getdiyini bildirir. Həzrət Məhəmmədin 11 -ci ildə vəfat etdiyini (miladi 632) nəzərə alsaq, "Sirlər xəzinəsi"nin qələmə alındığı tarix aydınlaşır. 559-11-570. Deməli, Nizami ilk poemasını 570-ci ildə (miladi 1174) yazmağa başlamışdır.

## PEYĞƏMBƏRİMİZƏ BEŞİNCİ GÖZƏLLƏMƏ

289 B. Butün peyğəmbərlərdən sonra gəlməsinə baxmayaraq Həzrət Məhəmməd bütün peyğəmbərlərin sonudur, yekunudur. Ondan sonra peyğəmbər gələ bilməz.

291 B. Beyt Həzrət Məhəmməd ilə bağlı bir hədis əsasında qurulmuşdur: "Mənimlə məndən əvvəlki peyğəmbərlərin məsəli ona oxşayır ki, bir kişi ev tikir, bitirir, bəzəyir, lakin bircə damının tacından başqa! Mən peyğəmbərlərin sonu olaraq həmin damın tacıyam".

292 B. Dini etiqada görə buğda yeyib cənnətdən qovulmuş Adəmin üzrü,tövbəsi yalnız Məhəmməd peyğəmbər tərəfindən qəbul edilmiş, Nuh peyğəmbər də ümumdünya daşqınından Həzrət Məhəmmədin yardımı sayəsində qurtula bilmişdir.

294 B. Dünya gülüstanında sənin vücudunun rayihəsilə Həzrət Adəmin üzrü, tövbəsi qəbula yetmişdir.

295 B. Sənin hər sözünu şəkər və bal kimi yeyən, qəbul edən Həzrət Adəm üzr istəyirkən, tövbə qılırkən, adi gülşəkər sənin qarşında öz adından utandı, gülşəkərlikdən əl çəkdi.

296 B. Qəbul topu - peyğəmbərlik mövqeyi. Tanrı bu mövqeyi lap əzəldən müəyyənləşdirsə də, topu öz çovkam ilə ələ gətirmək heç kəsə nəsib olmayıb, bu işi yalnız Həzrət Məhəmməd peyğəmbər bacarmışdır.

299 B. Prof. R.Əliyev bu beytin məzmununun Quranın "Nuh" surəsindən iqtibas edildiyini bildirir. Nuh peyğəmbər öz ümmətini bütpərəstlikdən əl çəkməyə və bircə Tanrıya tapınmağa dəvət qılarkən ona qulaq asmayıb günah işlətdilər, kafirlik və asilik etdilər. Onda Həzrət Nuh Tanrıya üz tutmalı oldu: "Xudavənda! Yer üzündə, evlərdə yaşayan heç bir kafəri saxlama!" Bu bəd duadan sonra Yer üzünü sel, su basdı, Nuh öz gəmisinə yalnız layiq bildiklərini götürüb xilas etdi. Həmin bəd dua Nuh peyğəmbərin səhvi, suçu sayılır.

300 B. Həzrət İbrahim ilə bağlı hədislərdən birində onun həyatda üç dəfə yalan danışmasından, deməli, atının üç dəfə büdrəməsindən söhbət gedir.

301 B. Dini etiqada görə, nəğmənin yaradıcısı, şair Davud peyğəmbər Uriya xanıma evləndikdən sonra səsini itirmişdir. Bəm səslə Tanrıya yalvarmaq əvəzinə o, zilə keçmiş, buna görə duası qəbula yetməmiş, peyğəmbərlik topunu əlində sonadək saxlaya bilməmişdir.

302 B. Qədim yəhudilərin peyğəmbərləri və padşahı sayılan Həzrət Süleyman peyğəmbərlik tacına layiq olduğu halda təxtindən, tacından əl çəkə bilməmiş, Tanrının ortaya atdığı qəbul topunu götürüb saxlamağı bacarmamışdır.

303 B. İmkanı olduğu halda, fürsəti əldən vermiş, düşdüyü quyuda yalnız ucuna kəndir bağlı dolça görə bilmişdir.

304 B."*Ətəyi islanmış*" ifadəsinin məcazi mənası "günahkar", "suçlu" deməkdir. Nizami deyir ki, Xızr peyğəmbər öz peyğəmbərlik funksiyasını yerinə yetirmək əvəzinə əbədi yaşamaq eşqinə düşdu, dirilik suyunun ardınca zülmətə getdi və dirilik suyu bulağında ətəyini islatdı, yəni bəşəriyyətin qarşısında suçlu, günahkar qaldı.

305 B. Həzrət Musa peyğəmbərlik piyaləsini içmək istədi, ancaq bacarmadı. Şüşəsini Tur dağında qayaya çırpıb, Tanrı dərgahına əl qaldırdı. "Özünü mənə göstər!" Lakin Tanrıdan cavab aldı ki, "Lən tərani" ("Sən məni heç vaxt görə bilməzsən!").

306 B. Atasından xəbərsiz olduğu üçün xalqın nəzərində ləkəli sayılan İsa peyğəmbər (Məsihə) peyğəmbərlik süfrəsinə heç tamah da salmadı. Yəni Tanrı dərgahına çatmaq, onunla görüşmək səadəti heç gümanına da gəlmədi.

307 B. Peyğəmbərlər içində Tanrı ilə görüşmək səadəti yalnız Sənə nəsib oldu, Tanrıdan başqa heç bir kimsəyə, heç bir nemətə ulvi məhəbbət bəsləmədin, qəbul topunu udub Tanrı görüşünə nail olan bircə Sənsən, öz qeyrət və iradən ilə fələkləri heyran qoyan qüdrətsən.

314 B. Sənin nəfəsində elə bir qüdrət var ki, dilsiz-ağızsız heyvanları, bitkiləri, cansız təbiəti belə dilə gətirir, onlara nitq verir.

316 B. "*Kun - Ol*!" əmri ilə Tanrının dünyanı altı günə yaratmasına işarə olunur.

## İSLAM PADŞAHI MƏLİK FƏXRƏDÇİN BƏHRƏM ŞAH İBN DAVUDA ÖYGÜ

328 B. "Nöqtə kimi düyünlənmək" Nizami Gəncəvinin Gəncədə yaşadığına və bu şəhərdən çıxıb gedə bilmədiyinə işarədir.

329 B. *Hüma* (Hümay) əsatirə görə geniş qanadlı səadət quşudur, guya kimin üstünə qanadını gərsə, həmin adam xoşbəxt olar, hətta padşah seçilə bilər. Nizami Gəncəvi Bəhram şahı özünün hüma quşu, himayəçisi, hamisi olmağa çağırır.

334 B. Nizami Gəncəvi onun üstünə fərr (Ahuraməzda tərəfindən nəsib edilmiş nur həlqəsi) sala biləcək böyük hami, himayədar arzulayır.

338 B. Sən zülmətdə dirilik suyunu tapan Xızr peyğəmbər və iki qitənin fatehi Makedoniyalı İskəndər qədər güclü şəxsiyyətsən, "Məcesti" (Şərqdə "Əlməcəsdi") adlı ulduzşünaslıq əsəri yaratmış böyük yunan alimi Ptolomey (Petlimus) kimi bilginlərə qibləgahsan, yol göstərənsən.

340 B. Dini etiqada görə, üzüyünün qaşında "Tanrı" kəlməsi yazılmış Süleyman peyğəmbər bütün heyvanlar, quşlar, cinlər, divlər və müxtəlif dilli tayfalar üzərində mütləq hakimiyyətə malikmiş.

341 B. Süleyman peyğəmbərin atası Davud peyğəmbər olduğu kimi Fəxrəddin Bəhram şahın da atasının adı Davuddur. Bu bənzəyişdən istifadə edən Nizami Gəncəvi Bəhram şahın bütün təbiət üstündə mütləq hakimiyyətə malik Süleyman peyğəmbər səviyyəsində qüdrət, cəlal və istedad sahibi olduğunu bildirir.

344 B. Vuruş və müharibə ilahəsi, həmçinin cəngavər sayılan Mərrix ulduzunun farsca adı Bəhramdır. Bu ad uyğunluğundan istifadə edən Nizami Gəncəvi bildirir ki, Bəhram şah Davud oğlu öz bəhramlığını, yəni müharibə meydanında cəngavərliyini aşkara çıxarsa, "Yeddi gözəl" qəhrəmanı Bəhram Gurun nəsibi yalnız gor olar, yəni Ərzincan hakiminin qarşısında davam gətirə bilməz.

346 B. XII əsrdə Bəhram şah Davud oğlunun hökmranlıq etdiyi Ərzincan vilayəti Ermənistanı, Rum elini (Bizansı) və Əbxazıstanın böyük bir hissəsini əhatə edirdi.

352 B. *Mavi pənçərə* - səma, fələk. Müəllif bildirir ki, hər kim Bəhram şaha pəncə qaldırmağa cəsarət etsə, pəncəsiz qalacaq, yəni istər-istəməz məğlubiyyətə düçar olacaqdır.

353 B. Bəhram şah elə əzəmətli bir hakimiyyətə malikdir ki, yola saldığı karvanların zınqırovlarının, zənglərinin səsi fələyin qulaq pərdəsini yırta bilər. Özünün alovlu, qızğın nəfəsi ayna kimi görünən Ay səthinin şüşəsini parçalaya bilər.

## HÜZURUNDA YER ÖPƏRKƏN SÖYLƏNİB

357 B. Bəhram şah Davud oğlunun bütün vuruşlardan müzəffər çıxması,doqquz qatlı göylərin belə onun qüdrətindən agah olması nəzərdə tutulur,alqışlanır.

358 B. "Yerin, göyün qulağı" deyildikdə iki balığın - səmadakı Hut (Balina) bürcünün və əsatirə görə Yer yuvarlağını öz belində saxlayan əfsanəvi balığın qulağı nəzərdə tutulur. Nizami demək istəyir ki, yerin dibindən tutmuş fələklərə, səyyarələrə qədər bütün incilər sənin zəfər qılıncına yaraşır.

360 B. Qılıncın Fərat çayı qədər qan tökmüş və düşməni dirilik suyundan yoksun məhrum etmişdir.

362 B. *Key Xosrov* - İranın tarixi, əfsanəvi qəhrəmanlarından biri: qüdrətli şah rəmzi, Firdovsi "Şahnamə"sinin başlıca personajlarından biri; Cəmşid - tarixi əfsanəyə görə İranın şahlar panteonunda Pişdadiyan sülaləsinin dördüncü hökmdarı. Rəvayətə görə şərab, mey onun zamanında kəşf edilmiş, Cəmşid adı və cami-cəm deyilən piyalə Şərq poeziyasmda şadlıq rəmzi kimi işlənmişdir.

Beytin mənası budur ki, sənin piyalən iki qüdrətli sərkərdənin və padşahın qüvvəsini özündə təcəssüm etdirən möhtəşəm bir hökmdarın əlindədir. Buna görə sənin çıraq çöhrənin nuru və işığı günəş pərvanəsini yandırıb külə döndərə bilər.

367 B. Çoxlarını vəzir, vəkil mərtəbəsinə qaldırsan da, əlindən tutan, sənə yardım edən yalnız ulu Tanrıdır, onun mələkləridir.

371 B. Firidun - Dəmirçi Gavənin Zöhhaka qarşı üsyanından sonra taxta əyləşmiş əfsanəvi İran şahlarındandır. Özünü ikinci Zərdüşt elan edərək Zərdüşt dinini bərpa etməyə və əsrinin tələblərinə uyğunlaşdırmağa çalışmışdır.

*Zöhhak* - İranın klassik şahlar panteonunda Pişdadiyan sülaləsinin beşinci hökmdarı sayılır. Milliyyətcə ərəb olduğuna görə onu Zöhhak Tazi də adlandırırlar. Əjdaha mənasını verən Zöhhak zülm və istibdad timsalıdır. Əfsanəyə görə çiyinlərindən çıxmış iki ilana hər gün iki gəncin başını yedizdirərmiş.

*Beytin mənası*: Firidun kimi haqsever, mərd, cəsur insanlara arxalanmasan, ölkəni zülm, istibdad bürüyər, çiyinlərindən ilan çıxmış Zöhhak kimi sital müstəbidlər baş qaldıra bilər.

374 B. Təxt, tac sənə irsən keçməsə də, onu döyüşdə qazanmısan.

## KİTABIN YAZILMASI SƏBƏBİ

397 B. Beytin mənası: Nizaminin boş qalmış könül dənizini öz incilərinlə zənginləşdir, "*Sirlər xəzinəsi* "ni bəyən, təqdir et.

399 B. Əfsanəyə görə, Nuh peyğəmbər qopacaq tufanı öncə bilib yaxşı bir gəmi düzəldir və ümumdünya daşqınından xilas olur. Buna görə Nuh peyğəmbər heç bir tufanda qərqolmaz ilk və qüdrətli gəmiçi sayılır. Nizami demək istəyir ki, mənim tufanlı dənizə bənzər əsərimdə - "Sirlər xəzinəsi"ndə Nuhun özü qərq ola bilər.

Əsatirə görə Xızr peyğəmbər zülmətdə tapdığı dirilik suyundan içib əbədi yaşayan şəxsiyyətdir. Şairin fikrincə, Xızr kimi ən əzəmətli şəxs belə bu dirilik suyunda - "Sirlər xəzinəsi"ndə öz kuzəsini smdırıb naçar qala bilər.

403 B. Birinci misra "Hədiqətül-həqaiq" ("Həqiqətlər bağçası") müəllifi Sənainin Qəznə hakimi tərəfindən qiymətləndirildiyini işıqlandırır. İkinci misrada Nizami deyir ki, mən də "Sirlər xəzinəsi" dastanını yazmaqla

damğamı Rum elində sikkəyə vurmuşam, yəni Ərzincan hakimi Bəhram şahın adına layiq əsər yaratmışam.

406 B. Nizami Gəncəvi türk - azərbaycanlı olduğuna işarə vurar və farsca yazan başqa şairlər içərisində özünü qərib hesab edir, onu bu qəriblikdən yalnız Bəhram şah kimi hökmdar türkün qurtara biləcəyini söyləyir.

407 B. Nizami Gəncəvi öz poeziyasının orijinallığına işarə vurur, təzə sözlərini bar gətirən ətirli bağa bənzədir, öz gücünü özgədən, piltədən və neftdən alan çırağa oxşamadığını, müstəqilliyini bildirir.

410-411 B. Prof. R.Əliyev və professor Mübariz Əlizadə bu cür beytlərin Nizami üslubuna və xarakterinə zidd olduğunu və katiblər tərəfindən qondarıldığını bildirirlər.

417 B. Arxadan gələnlər - Nizamilə yarışmaq istəyən şairlər.

425 B. Nizami yenicə tamamladığı "Sirlər xəzinəsi"ni Ərzincan hakimi Bəhram şaha təqdim etməkdə çətinlik çəkdiyini bildirir. Görünür, həmin dövrdəki irili-xırdalı müharibələr gediş-gəliş yollarını kəsmişdir.

## SÖZ QOŞMAĞIN FƏZİLƏTİ HAQQINDA

432 B. Nizami cahanın Tanrı tərəfindən "*Kun - Ol*!" əmrilə yaradılmasına işarə edir. Onun əzəli qələmi "Lövhi-məhfuz"da kainatın taleyini sözlə yazıb, deməli, hər şeydən öncə sözü yaratmışdır.

437 B. Yaradıcı şəxsiyyətin cam - bu aləmə yadigar qoyub getdiyi sözündədir, bədəni, cismi, gövdəsi gəldi-gedərdir, tələl (skelet) hökmündədir.

440 B. Kainatın yaradılışından məqsəd sözdür, onun sonu da sözdən ibarətdir. Əbədi qalan yalnız sözdür.

444 B. Yalnız həqiqəti axtaranlar və tapanlar böyük söz yaratmağa və bu sözün sayəsində yaşamağa qadirdirlər. Sözü gerçəkliyi pərdələmək vasitəsinə çevirənlərə, bomboş xəyal uydurmaçılarına söz heç vaxt üz göstərmir,yalançıları, saxtakarları yaxına buraxmır.

445 B. Yaradıcı insanın taleyi yaratdığı sözün dəyərindən asılıdır.

446 B. Damarları donanlar, bağrı yananlar – bədii və elmi söz yaradıcıları, şairlər və alimlər.

450 B. Söz - Tanrının "*Kun - Ol*!" əmri. *Candakı şah damar* - ruh. *Kələfin ucu* - maddi aləm. Beytin mənası: Tanrı neməti söz kəşf edilməsəydi, ruhu və bu maddi aləmi tapmaq olardımı? Yox!

451 B. Təbiətin və şəriətin bütün qanunları yalnız bədii və elmi sözün sayəsində kəşf olunub və möhürlənib, təsdiq olunub.

454 B. Söz qasidi - qələm və dil.

## ÖLÇÜLÜ SÖZÜN ÖLÇÜSÜZ SÖZDƏN ÜSTÜNLÜYÜ

462 B. Poemanın ilk beytindəki hədisin məzmunu yenidən yada salınır:"Ya Cəbrail, bu nə qəsdir?", "Ya Məhəmməd, bu ərşin altındakı Tanrı xəzinəsidir, onun açan isə şairlərin nitqidir".

463 B. *Sözün tərəzisini quran ulu hökmdar* - Tanrı. *Sözün aşiqləri* - peyğəmbərlər.

464 B. *Ərşin bülbülləri* - şairlər.

465 B. İlham məqamında şairlər mələk səviyyəsinə ucalırlar.

471 B. Şairlik əvəzinə saray məddahlığı edən, eybəcəri gözəl kimi qələmə verən şeirbazların həyasızlığı, sərvət, şöhrət düşkünlüyü ucbatından poeziyanın ləyaqəti ayaqlar altına salınmışdır.

472 B. Söz pərdəsində ahəng yaratmağı bacaranlar, yəni yaradıcı qüdrətə malik olan şairlər yoxsul həyat keçirsələr də, mənən zəngindirlər, onların özü yerdə, ruhu göydə yaşar.

473 B. Qələm, kağız götürüb dizi üstündə şeir yazan şairlər şahlardan fərqli olaraq, qılınca və orduya ehtiyac hiss etmədən ürəkləri, ölkələri tutmağa qadirdirlər. Buna görə onlar məğrur və əzəmətlidirlər, heç bir şahın dərgahına baş əyməzlər!

474 B. Yaradıcı qüdrət hər iki cahanın hökmdarıdır. Onun ömürdən başqa mənəvi ömrü, dünyadan başqa mənəvi dünyası var.

475 B. Dizinə dirsəklənib başını aşağı dikən sənətkar bu vəziyyətilə gərilmiş kamana bənzər. Kamandan çıxan ox şairin dilindən saçılan bədii sözdür ki, mənəvi şikarı ələ gətirir.

476 B. Yaradıcılıq məqamında böyük əzablar çəkən şair istədiyi sözü tapanda düşdüyü əzabdan qurtulur, öz kaman həlqəsini qırır, dikəlir.

477 B. Fələyin qulağına həlqə taxmaq onu özünə qul etmek deməkdir.Yalnız yaradıcı qüdrət sahibləri bu işi görməyi bacarır, zamanı özünə təslim edir, fələyi qulağı həlqəli qula çevirə bilirlər.

478 B. Hoqqabaz fələk hoqqa, oyun çıxardığı halda, yaradıcı qüdrət sahibi onun qarşısına misilsiz söz inciləri çıxarır və buna görə fələyin belini sındırır, ona qalib gəlir.

479 B. Yaradıcı ilham məqamında sənətkarın ürəyi köks qəfəsini dağıdır,uçur, qanadlanır və sənətkarın dodağından öpmək istəyir. Niyə? Çünki indicə dodaqlarından dürrə, mərcana bənzər sözlər saçılmışdır.

489 B. *Beli kəmərli mərdlər* - şairlər.

491 B. Məddah saray şairləri, qarınqulular, ucuz şöhrət və sərvət düşkünləri sözü satmaqla görün nə dərəcədə alçalır, sənətin sikkəsini hörmətdən salırlar.

492 B. *Zülmətə işıq salan ləl* - günəş, yaxud poeziya.

494 B. Burada saray şairlərinin aqibətinə işarə olunur. Sultanın qızılı hesabına zərli əba geyən şeirbazlar axırda sultanın qəzəbinə düçar olur, bəzən dəmir çeynəmək, qılınc zərbəsi dadmaq dərəcəsinə gəlib çatırlar. Burada saray şairlərinin boğazına əridilmiş qızıl tökmək dəbinə də işarə var.

495 B. Nizaminin fikrincə, sultan qəzəbindən qorunmağa yeganə təminat şairin öz nəfsini cilovlamağı bacarmasıdır, o, civə kimi saf, təmiz qalmağı bacarmalıdır. Qədim kimyagərlərin fikrincə, qızıl civəyə doğru can atdığı halda, civə qızıla doğru can atmır. O müstəqildir, pakdır.

497 B. Özləri verməyincə hökmdarlardan pul, mükafat, imtiyaz umma!

500 B. Sənətkarın hörmətini, nüfuzunu ucaldan yalnız öz poeziyasıdır. Yalnız böyük poeziyası sayəsində o, göyün yeddinci qatında yerləşən əfsanəvi Sidr ağacı mövqeyinə yüksələ bilər, cəmiyyətin ən uca qatında mövqe tutan sultanlardan, şahlardan belə yüksək və əzəmətli görünər.

501 B. Beyt "Şairlər - söz hökmdarıdır" ərəb məsəli üstündə qurulmuşdur.

502 B. Sən əsrlərin, fələklərin başı üstündən keçib gedə biləcək böyük, qadir, ülvi söz yaratmağa borclusan. Nəfsini cilovla, özünü gəldi-gedər şahlar, sultanlar önündə alçaltma!

503 B. Burada gündüzdən daha çox gecələr çalışan şairlər şama bənzədilir. Gündüzlər sakit dayanan şamlar yalnız gecələr yaşayır, əriyə-əriyə işıq saçmaqla ayıq-sayıq ömür keçirirlər.

508 B. Yalnız bədii sözün ləyaqətini uca tutan şairlər Ay kimi işıqlı, Günəş kimi qüdrətli poeziya yarada bilərlər.

512 B. Düzəliş üçün şeirlərini başqa şairlərin ixtiyarına vermə, onlar sənin min bir əziyyətlə becərdiyin tarlanı tapdaya, inci düzdüyün sapı qıra bilərlər.

515 B. Nizami öz poeziyasının inqilabi mahiyyətini işıqlandırır: Mən şeri ümumxalq malı etdim, meyxanədən və saraya xidmət vəzifəsindən qurtardım, sənəti uca bir mövqeyə qaldırdım.

516 B. Nizami Gəncəvi öz poeziyasının beynəlmiləl mahiyyətinə işarə vurur. Bu poeziya yalnız xirqə (qıldan toxunma, yamaqlı, cındır əba) geyən sufilər, dərvişlər və zahidlər üçün deyil, belinə zünnar (qıldan toxunmuş kəmər) bağlayan xaçpərəstlər, məsihilər üçün də gərəklidir. Nizami poeziyası olan yerdə nə xirqəyə ehtiyac qalır, nə zünnara. Bütün bəşəriyyətə məxsus Nizami sənəti dini atributların hamısından yüksək dayanır.

521 B. *Harut və Marut* - Tanrı tərəfindən göndərilmiş iki mələyin adıdır. Hər ikisi Zöhrə xanıma vurulub, onu yoldan çıxarmaq istəyirlər. Tanrının buyruğu ilə Zöhrə planetə çevrilir. Harut ilə Marut isə Babilistanda cəzaya məhkum olunur, dərin bir quyudan başıaşağı asılırlar. Poeziyada Harut, Marut, Babil sehr, əfsun rəmzi kimi işlədilirlər. Nizami ana yurdu Gəncəni Babilistana, öz poeziyasını isə cadugərlərin tilsimini qıran qüdrətə, habelə dan ulduzu Zöhrəyə bənzədir.

522 B. Bu məntəqənin (Gəncənin) Zöhrəsi (musiqiçi və müğənnilərin hamisi), mənim Zöhrəm tərəziçidir, sözümün dəyərini tərəzidə çəkir. Mizan bürcündə ölçür və görür ki, mənim şeir-sənət dilim ruh aləminin dilidir,ləyaqət və gözəllik meyarıdır.

523 B. Harutun sehr və tilsimləri yalana, adam aldatmaya əsaslandığı üçün haramdır, mənim sənət cadularım isə həqiqətə, ilhama güvəndiyi uçün,zəhmətimlə qazandığım gündəlik duzum, çörəyim qədər halaldır. Mənim halalım hər cür haramı sındırır, batil edir.

## GECƏNİN VƏSFİ VƏ KÖNÜLƏ DALMAQ SÖHBƏTİ

525 B. *Qalxanı suya atmaq*, qalxanı atmaq - təslim olmaq deməkdir.

Beytin mənası: gecə düşdü.

529 B. *Ayın süd nənəsi* - fələk, göylər. *Gündüz zınqırovu* – Günəş.Beytin mənası: Ay göy qübbəsində bədrləndi, az qala, Günəş qüvvəsilə nur saçmağa başladı.

534 B. *Üzüqara kafər* - gecənin qaranlığı.

536 B. Burada söhbət kəllə qəndə bənzəyən Ayın ətrafında yeni ulduzların doğmasından, müğənnilər və musiqiçilər hamisi Zöhrə ulduzunun daha da şənlənməsindən, həndəvərə bol-bol sevinc, fərəh qığılcımları saçmasından gedir.

541 B. *Pak, təmiz atəş* - insanın mənəvi qüvvəti, yaradıcı ilhamı.

*Atəşə su səpmək* - mənəvi qüvvəti öldürmək, yaradıcılıq ilhamını söndürmək, insanın nəfsə, tamaha uyması, kiməsə yalmanması, mədhnamə yazması və s.

*Yel kimi yedək atını minmək* - şöhrət, sərvət düşkunü olmaq, heyvani tələbləri ehtiraslar ocağında yelləyib qızışdırmaq.

553 B. Nizamiyə görə, insan yalnız qırx yaşından sonra kəmala yetməyə başlayır, çoxları üçün ömrün qırx ili hədər gedir, çünki bu dövrdə nəfsə, tamaha, ürəyi söküb-tökən heyvani ehtiraslara uyur. Dərrakəli insan lap gənclikdən gərək bunun qarşısını alsın, öz ömrünün və mənliyinin qədrini bilsin.

565 B. *Qapı cəftəsi* - qupquru, cansız predmet, biganəlik rəmzi. Qapı cəftəsinə bənzəyənlər dost deyil, onlar insan menliyinə işıq, qüdrət gətirməyə qadir deyillər.

571 B. Yəməndə xüsusilə parlaq görünən cənub ulduzu Süheylin işığı,qədim təsəvvürə görə, burada emal olunan əla növlü dərinin - ədimin şəffaflığına səbəb olur. Nizami ağ dərili, parlaq dərili insanların xoşbəxtliyini də bu ulduz altında doğulması ilə bağlayır və həmin ulduzun gözəlliyinə, nur qüdrətinə layiq olmağa çağırır.

572 B. Yəni fikrim işıqlandı.

573 B. *Hatif(ə)* - qışqıran, bağıran, hayqıran, dəruni səs, mələklərin, yaxud vicdanın səsi.

576 B. Məni maddi dünyaya bağlayan təbii-bioloji instinktlərin hökmündən qurtulmağı bacardım, ruh qüdrəti qazandım.

578 B. Maddi aləmdən qurtulmaq, mənəvi yüksəkliyə qalxmağı bacarmaq insana baha tamam olur, yalnız canını dişinə tutmaqla bu işi görə bilirsən.

580 B. Yəni: açıldım, büküldüm, yumrulanıb topa döndüm, top kimi başsız, ayaqsız bir şey oldum. Ətəyim yaxamdan seçilmədi.

587 B. Məhəbbət karvanımm öncülləri mənə nəvaziş göstərdilər, vücudumun zahiri pərdəsini qaldırdılar ki, ürəyimi görə bilsinlər.

591 B. Prof. R.Əliyevin yozumuna görə yeddi xəlifə - ürəyin yeddi xidmətçisidir: 1. Ürəkcik. 2. Ağ ciyər. 3. Qara ciyər. 4. Öd kisəsi. 5. Dalaq. 6. Mədə. 7. Böyrək.

Birinci misra Firdovsinin "Şahnamə"sində İsfəndiyar ilə bağlı "Yeddi xan" ("Həft-xan") dastanına işarə vurur.

592-595 B. *Günorta şahı* – Günəş (ürək). Nəfəsabadm istilənməsi -nəfəs alırkən ağ ciyərin istilənməsi. *Qızıl donlu süvari* - ürək. *Paltarı ləl rəngli gənc* - qara ciyər. *Acıqlı bir cavan* - öd kisəsi. Qədim təbabət anlayışına görə, öd kisəsinin iki ağzmdan biri ağ ciyərə açılıb qam təmizləyir, onun tortasını özünə çəkir, ikinci ağzı isə qursaq ilə birləşib, qara səfranı mədəyə çatdırır, adama iştah gətirir, buna görə muəllif ona şikar kəşfiyyatçısı ləqəbi vermişdir. *Qara qul* — dalaq. *Kəməndatan* — mədə, onun *kəməndi* -bağırsaq. *Misbədənli pəhləvan* - böyrək.

600 B. *Dilək quşu* - ruh. Dilək quşunun uçması - insanın dünyaya əlvida deməsi, ruhun cismdən xilas olması.

601 B. Könül deyir ki, mənim odum, atəşim cismani ürək yuvasının tüstüsü ilə ülfət yapa bilməz, çünki ürək səni maddi aləmə çəkir, məni isə mənəvi aləmə. Mən duzam, ürək isə duzun nə olduğunu bilməyən bir parça et.

602 B. Söhbət yenə ruhun, könülün bədəndən, cisimdən, ürəkdən üstünlüyü haqqında gedir. İkincilər, Nizaminin fikrincə, gəldi-gedər və müvəqqətidir, birincilər əbədi, əzəli. Buna görə Nizami Gəncəvi ruhun kölgəsini dəhrin, bu dünyanın sərvindən daha əzəmətli hesab edir. Ruhun ayağı və addımları adi insan ayağmdan və insan addımlarından daha cəsur, daha qüdrətlidir.

603 B. Mən elə bir xəzinəyəm ki, çox da uzaqda olmadığım üçün istəsən məni ələ gətirə bilərsən. Yaxşı ki, son dərəcə varlı olduğu halda həm də son dərəcə xəsis olan və buna görə Tanrı tərəfindən cəzalandırılan və xəzinələri ilə birlikdə yerin yarğanma gömdürülən Qarunun ixtiyarında deyiləm.

608 B. *Riyazətlə məşğul olmaq* - oruc tutmaq, namaz qılmaq, az yatmaq,yemək, nəfsi, tamahı ram etmək və s. bu kimi vasitələr ilə qəlbi tərbiyələndirməkdir. Doqquz fələyin çevrəsindən çıxmaq isə maddi aləm qayğılarından qurtulmaq deməkdir. "Riyazət öyrədən" anlayışı orijinalda "rayiz"şəklində işlədilmişdir. Bu sözün digər mənası xam atı ram edən minici deməkdir.

609 B. Keçmişdə döyüş atını döyüş şəraitinə alışdırmaq məqsədi də qıldan düzəldilmiş kəndirdə düyün vurmaqla yeddi həlqə hazırlar, birincisini atın boynuna salar, qalan hissəni yerin üstünə sərərmişlər. At ayağını həmin həlqələrə qoyub irəliləməyi bacarsa, onu əhliləşmiş sayarmışlar. Riyazət yolu ilə kamilləşən Nizami özünü həmin çətinlikləri dəf edən köhlənə bənzədir, qüdrətli əsər yazmaq üçün varlığında qüdrət qaynaqları kəşf etdiyini bildirir.

610 B. Riyazət öyrədən pir məni elə təlimlərdən keçirdi ki, bütün əzab - əziyyətlər, çətinliklər arxada qaldı, cismani dügümlərdən qurtuldum.

616 B. Qədim Misir fironu Əzizin Həzrət Yusif peyğəmbərə vurulmuş arvadı Züleyxa klassik poeziyada şəhvət, tamah, çılğın ehtiraslar rəmzidir.

617 B. *Sübhün çırağı* - Günəş.

619 B. Burada "bağa çatdıq" ifadəsi "ruh aləminə qovuşduq" mənasındadır.

622 B. Yəni: köksüm lalənin bağrı kimi dağlandı. Belimin qurşağı güllərin kəməri kimi ləçək-ləçək, dağım-dağım oldu.

626 B. Nəfəsinin qüdrətilə ölüləri dirildən İsa peyğəmbər (Məsiha, Məsih) kimi yarının rayihəsi mənə ürək, can verdi.

635 B. Göbəyinin yumşaq tükü ilə fərqlənən tülkü, dərisinin gözəl rəngini sanki tikanlara bəxş eləyib. Ceyranlar isə göbəyindəki mişki (ətirli maddəni) elə bil rayihəsi aləmi bürümüş çiçəklərə, güllərə bağışlamışlar.

639 B. Bir-birinə sarmaşan Xeyri gülləri yelpiyə dönərək bağın, gülüstanın ənbərini, ətrini hər tərəfə yaymaqdadır.

640 B. Qaşları, kirpikləri boyamaq üçün istifadə olunan sürmənin tərkibində zümrüd də vardır. Bu tərkib gözə işıq gətirdiyi halda, ilanın gözlərini kor edir.

642 B. Nizami Gəncəvi vur-tut bircə günlük ömrü olan süsən çiçəyini, dini əsatirə görə anadan olduğu gün dil açıb danışan Həzrət İsa peyğəmbərə bənzədir. Bu çiçək dini rəvayətə görə, cibinə salıb çıxaran kimi əli şüa saçan Musa peyğəmbərə bənzəyir, Həzrət Musanın ərəbcə "bəyza" deyilən ağ əli kimi parıldayır.

646 B. Nizami yaradıcılığında Türk anlayışı gözəllik, qüvvət, paklıq, ağlıq və işıq anlayışlarının atributudur. Burada o, ağ yasəməni qıpçaqlarda

(əngin çöllərdə) yurd salmış türklərin aypara nişanlı döyüşçü çadırına oxşadır. Bu çadır o qədər əzəmətlidir ki, Sürəyya ulduzunadək ucalıb da ona şölə verir.

647 B. *Məcus* - atəşpərəst, zərdüştçü. Nizami laləni atəşkədə atəşinə, alov dillərini isə oda sitayiş qılan muğ kahinin yuxarı qalxmış əllərinə bənzədir.

648 B. Sehl və Lalə, Süheyl və Səmən əsatirdə aşiq-məşuqə sayılırlar."Türk yasəmən" ifadəsi isə Nizamidə ənənəvi məcazlardandır. Türkün əbədi bahar, təzəlik, paklıq rəmzi olduğuna işarədir.

649 B. Qaqum adlı heyvana yağı kəsilmiş sincabın mənası yaşıllıq deməkdir. Müəllif demək istəyir ki, yumşaq axar su yaşıl otlara toxunur.

652 B. Yarpaqlar və budaqlar arasmdan yerə düşən şüalar klassik şeirdə kölgənin dodaqlarına oxşadılır. Yarpaqlar tərpənirkən həmin şüalar da tərpəndiyinə və yer dəyişdiyinə görə bunu da kölgənin nitqi hesab etmişlər. Hərəkət etməyən quma məcazi mənada ölü qum deyilir.

İkinci misranın mənası: suyun təhriki ilə diriltmiş qum çay axarı boyunca yürüşdədir (prof. R.Əliyev).

655 B. Lalənin manqalında (məcmərində) uzərrik yandırıb tustünü söyüdə yelləyərlər ki, cadu smsm, onun bədənindən çıxsın.

659-660 B. Keçmişdə güləş meydanına çıxan pəhləvan hərif axtaranda əlində narınc atıb tutaraq var-gəl edərmiş.

Birinci beytin mənası: Günəş doğdu. Yəni Günəşi əlində narınc kimi atıb-tutan göylər özunün yaşıl-mavi gözəlliyinə görə Yerə, onun turunclu bağlarına meydan oxuyur.

İkinci beytin mənası: Öz gümrahlığı və coşğunluğu ilə öyünən bahar ilə bayrağmı şəfəqlərlə süsləmiş fələklər arasında da belə bir rəqabət var.

663 B. Fələk bağlardan keçəndə yaşıllığını girov qoyub əvəzində yaqut kimi qırmızı, al şəfəqləri çalıb getmişdi.

667 B. Sərv ağacını çox sevən qırqovul adətən ölüm vaxtı yaxınlaşanda can vermək üçün onun dibinə gəlir. Burada həm də ölü turac tapılanda güman eləmişlər ki, o, qırqovulun canını almağa gəlmiş, caynaqları ilə sərvi zəncirləmək fikrinə düşmüşdür. Başqa bir etiqada görə qırqovulu öldürən sərv ağacının qoxusudur.

669 B. Etiqada görə bayquş xarabalıqda yaşayır. Xarabalıqda isə çox vaxt xəzinə yerləşir. Bayquşu adətən bəduğur sayıban öldürürlər. Nizami demək istəyir ki, xəzinə sirrini saxlamağına bayquş başı ilə cavab verir, viranədə yaşamaq və viran olmaq onun alnına yazılıb.

672 B. Şəmşad baharı gördüyü üçün qızışan, odlanan lalənin ürək döyüntülərini hiss etdi, kölgəsini onun yanar bağrının üstünə saldı ki, lalə alışıb yanmasm.

673 B. *Gecənin göz titələri* - ulduzlar.

674 B. *Qızıl kəndirli Yusif*- Günəş, yaxud dan yeri.

Beytin mənası: Dan yeri söküləndə yasəmənlər çiçək açdı, şüalar çiçəkləri bürüdü.

675 B. Keçmişdə yəhudilər dini qaydalara əməl edərək, müsəlmanlardan seçilsinlər deyə sarı paltar geyər, yaxud geyimlərinin üstünə "qiyar" deyilən sarı mahud parça, çit tikərmişlər. İkinci misra sudan Günəşin doğmasma işarədir ki, bu halda suyun qüdrəti Həzrət Musa peyğəmbərin möcüzə göstərən ağ əlinə oxşadılır. Burada Günəşin sudan çıxıb, suda batmasına dair qədim təsəvvürə də işarə olunur.

676 B. Torpaq içdiyi suyun sayəsində qazandığı bütün möcüzələri: ormanları, gülüstanları, zəmiləri... dünyaya göstərdi.

678 B. Söhbət kölgə ilə işığın bir-birilə əylənməsindən, öpüşüb görüşməsindən, yarpaqlar və budaqlar arasından düşən şüaların kölgə yanmda gözəlliyindən gedir.

## BİRİNCİ XƏLVƏTİN SƏMƏRİSİ

684 B. Güllərə gül ətrini, şəkərə şəkər dadını bəxş edən o gülnəfəslini, şəkər gülüşlunü gördüm.

688 B. O, duzlu gözəl danışdıqca (cümlə-cümlə şəkər doğradıqca), başqa dodaqların şəkəri suya düşür, nitqi heçə-puça dönürdü.

689 B. Şəkər yeməyi xoşlayan tutuquşu klassik şeirdə natiqlik timsalıdır.Burada həm zahirən, həm də daxilən tutuquşudan üstün olan gözəl danışıq nümayiş etdirməkdə, şəkər saçmaqda hər cür rəqiblərini kölgədə qoymasından söhbət gedir.

692 B. Təbər (Xəzər, Kaspi) dənizinin cənub sahillərində yerləşən Təbəristan vilayəti özünün qırmızı rəngli innab ağaclan ilə də məşhurdur ki, farsca buna "Təbərxun" (təbər qanı) deyirlər. İnnab ağacı çox möhkəm olduğuna görə bundan bəzən balta sapı, yaxud gürz qayırmaq üçün istifadə olunur. Nizami burada gözəlin gül dodaqlarının balta, yaxud gürz funksiyasında işlədilən innabdan daha çox qan tökdüyünü, dil şirinliyinə görə qəndi, şəkəri xəcil etdiyini bildirir.

694 B. Ud ağacı düyünlü olduğuna və alışanda şiddətlə yanıb-yandırdığına görə, ən başlıcası xoş, məstədici rayihə saçdığına görə, Nizami gözəlin xalını ona bənzədir.

İkinci misra bu fikri daha da zənginləşdirir: ürəkləri alovlandıran gözəlin yanaqları o qədər ətirlidir ki, sanki gündüzə bənzər yanaq sədəfində qaliyə -ətir-ənbər əziblər.

700 B. Burada gözəlin dar ağzı inci qutusuna, dadlı, duzlu söz söyləməyə hazırlaşan dodaqları qəndə, şəkərə bənzədilir.

704 B. Nizami Gəncəvi gözəlliyin şiddəti önündə az qala dəli-divanə olduğunu bildirir. Həddini aşmasm deyə keçmişdə dəlini qandallarmışlar.

705 B. Yəni Günəşin üzünü gillə suvamaq mümkün olmadığı kimi ürəkdəki kədəri də meyin, şərab içməyin gətirdiyi ani nəşə ilə silib aparmaq mümkün deyil.

706 B. Yeni şərab düşkünlərinin əlacı şərabda, acı meydə olduğu kimi dərdlilərin də çarəsi acı dərdi, qəmi çəkməyi bacarmasındadır.

## İKİNCİ XƏLVƏT - GECƏ GÖRÜŞÜ

717 B. *Gecə şahı* - darğa, şihnə. *Gecə bəkçisi* - keşikçi, qarovulçu. *Çırpınan böcək* - şirəyə batıb qanadsız qalan pərvanə, milçək.

Beytin mənası: Darğa keşikçilərinin qanını tökmüş və pərvanələri qanadsız qoymuşdu ki, məclisin gedişatma mane ola bilməsinlər.

718 B. *Pərdə dalındakılar* - hərəm sakinləri, həyalı məşuqələr.

719 B. Burada Süheyl - mey paylayan saqi, yetim dürr və şeh damlası kimi parlaq görünən - büllur piyalə, ləl və mirvari isəənginə və dəyərinə görə onlara bərabər tutulan gül rəngli meydir.

720 B. *Cigərin şamı* - ciyərin şam kimi alışıb-yanması. *Şamın ciyəri* - şamın piltəsi, fitili. *Atəşin ürəyi* - od.

721 B. Ud ağacı şəkərsiz yana bilmir, odur ki, yandıranda ona şəkər qatırlar. Elə bir ülvi məclis açılıb ki, burada ud ağacı özü yanmağa can atır,buna görə şəkər saçır və bu şəkər onu alovlandırır.

722 B. Keçmiş toylarda gəlin ilə bəyin başma qızıl səpilməsinə, etrafa noğul, şəkər yağdırılmasma işarədir.

725 B. *Şirin vədə* - vüsal vədəsi. *Dirilik suyu* — məşuqənin şirin dodaqlarınm həyatverici qüvvəsi.

726 B. Tülkünün göbək xəzi onun bədəninin ən yumşaq hissəsi sayılır.Qaplan bu xəzi altma salıb, yəni məşuqəsini aşiq qucaqlayıb. Ceyranın (məşuqənin) vüsal yatağmda göbəyinə düşən hörükləri isə aslanın (məşuqun) belində kəmərə çevrilmişdir.

728 B. Burada şamm nuru ilə dolmuş şamdanlar saqilərin dolu qədəhinə bənzədilir. Bu halda şamın başma dolanan pərvanələr şərab qoxusundan məst olmuş, bayılmışdır.

730 B. Musiqi və şənlik ilahəsi olan Zöhrə (Venera) bu məclisə o qədər vurulmuşdu ki, səmadan enib məclisə gəlmişdi. Sazını elə bir şövq ilə çalırdı ki, dürüst bir ahəng ilə çalan əlləri az qala mizrabı sındırırdı.

731 B. Məclis elə qızışıb ki, uyğusuzluqdan xumar olanlar belə yata bilmir, bir-birinə şölə verən çıraqlar kimi nur saçırlar.

735 B. Süreyya yeddi ulduz toplusundan ibarət Ülkər bürcüdür, yaxud Sur bürcüdür. Şənlik fərəh və musiqi ilahəsi olan Zöhrə ulduzu da həmin bürcdə yerləşir. Məclisindən, gözəlliyindən vəcdə gələn şadlıq quşu elə qanadlanır ki, qanadlanıb ərşdə onların hamısmdan yuxarı qalxır.

736 B. Dan quşunu (xoruzu) kəsib kabab eləyirlər ki, banlamasın. Məclisin başa çatdığını xəbər verə bilməsin. Xoruzun od üstündə bişirilməsi məhəbbət quşlarının (sevənlərin) ciyərinə su səpmiş kimi olur. Yəni onlar sevinirlər ki, banlama əhvalatı olmayacaq, məclis davam edəcək.

737 B. *Səhər quşu* - Günəş.

743 B. *İnnabı püstə* - al dodaqlar. *İncə xətt* - üst dodağın göyərən zərif tükləri.

744 B. Gözəlin gecə kimi qapqara saçları qara hindliyə bənzər xal və Babil sehrindən üstün "Halal sehr" ilə, yəni naz, qəmzə ilə ovsunlanmışdır.Müsəlmanlığa heç də zidd olmayan bu halal sehr Zöhrəni yoldan çıxarmağa çalışan və buna görə cəzalandırılmış, Babilistanda başıaşağı vəziyyətdə quyudan asılmış Harut ilə Marutun cadusundan üstündür.

749 B. Dini etiqada görə, İsa peyğəmbər (Məsih, Məsiha) öz nəfəsinin gücü ilə ölünü diriltdə bilirmiş, bu halda torpaqdan yaranmış ürəyin ağzından dirilik suyu fışqırırmış.

750 B. *Ayın yaşmağı* - buludlar.

751 B. *Al dodaqların şəkər saçması* - şirin və gözəl qonuşmaq, gül üzün badam saçması isə - tərləməsi deməkdir. Gülün şəkərə pənah aparması yanaqların tərdən xilas olmasına və öz aşiqlərinə şirinlik, zövq bəxş etməsinə işarədir.

756 B. *Yanağının atəşi* - bütpərəst Nəmrud tərəfindən oda atılan Allah aşiqi Həzrət İbrahim Xəlilullah peyğəmbər. Bir dəstə reyhan - odun gülzara çevrilməsi. *Nərgiz* - gözlər, yaxud Allahın yolunda qurban kəsiləsi İsmayıl. *Xəncər* — kirpiklər.

759-760 B. Gözəlin açılmış ağ yaxası elə bir şölə saçır ki, bu huri sifətlinin işığından yalnız qara camaat deyil, seçmə adamlar da ovsunlanır, özlərini itirirlər. Qədim təbabət anlayışına görə sərsəmlər və epleptiklər güclü işığa dözə bilməz, qəşş edər, özlərindən gedərlərmiş.

762 B. Nərgizin ağ ləçəkləri gümüşə, ortasının sarı çiçəyi qızıla bənzədiyindən Nizami Gəncəvi zərli piyalələri ona oxşatmışdır.

765 B. Vüsal məqamına işarədir.

## İKİNCİ XƏLVƏTİN SƏMƏRİSİ

768 B. Əzəlin toxuduğu o xalça - poeziya, Nizami poeziyası. Şairin fikrincə, öz zərifliyi, naxışları, xallar ilə, ən başlıcası, gərəkliyi ilə insana xidmət edən xalça kimi böyük poeziya və ümumən, hər hansı incəsənət nümunəsi ömrə məna gətirir, hədər getmiş, itmiş günləri sanki geri qaytarır.

770 B. Nizamidə Türklük gözəlliyin ən yüksək mərtəbəsi deməkdir. Burada söhbət Türk gözəlindən və onun eşsizliyindən (misilsizliyindən) gedir.

771 B. Keçmişdə belə bir təsəvvür varmış ki, kətan Aya nöqsan gətirir (prof. R.Əliyev).

776 B. Mən bir su arxı kimi başımı o çəmənin (o gözəlin) ayağına qoymuşam ki, ondan qüvvət alım, gözəlin göz yaşıdır, məhəbbətdir arxımızı dirilik suyu ilə dolduran, bizi yaşadan. Mən yaşıllığamsa, o, günəşdir. Mənim nöqsanlarımı, ləkələrimi aradan qaldıran, yuduğum libasımı qurudan və paka çıxaran da onun hüsnünün atəşidir.

791 B. *Günəşin yaratdığı hövzə* - dan yeri.

792 B. Beytdə gecənin əriməsi, səhərin açılması vəsf olunur. Ulduzların gümüşü Günəşin qızılı altında qalır.

794 B. Yəni gecə bitdiyi, sübh açıldığı üçün yarın vəslinə yetə bilmədim, canımı onun yolunda sübhə qurban verdim.

803 B. İlanın başındakı muncuq şəkilli buynuzcuq keçmişdə cadu və sehrin, gözdəymənin əlacı sayılarmış.

## Birinci söhbət
## ADƏMİN YARADILMASINA DAİR

814 B. Burada hələ günah işləməyən Adəmin Həvva ilə birlikdə cənnətdə dolaşması və paklığı, çocuqluğu nəzərdə tutulur.

815 B. Burada Adəmin buğda yeməklə günahı işlətməsinə və tövbə qılmasına işarə olunur.

816 B. Həzrət Adəm mələk və pərilərin son yavrusu sayılır. Beytin məzmunu Qurandan gəlmədir: "Biz səmum atəşindən əvvəl cinləri xəlq etdik"

818 B. Beytin məzmunu Qurani-şərifdən gəlmədir: "O, Adəmə bütün adları öyrətdi", "O, Adəmi torpaqdan yaratdı. Sonra ona "Ol!" dedi".

819 B. *Bulaşıqdı* — çünki torpaqdan xəlq olunub. *Təmizdi* - çünki ruhu var. *Qızıldı* - çünki İnsan yaranıb. *Sərrafdı* - çünki yaxşını pisdən, xeyiri şərdən seçə bilir. *Məhək daşıdır* - çünki günahları yoxlamaq üçün sınaq vasitəsidir. Bu təsvirlə Nizami Adəmin tam qiymətini verir.

820 B. Adəm səmada yaşayan mələklərin, pərilərin varisi və bütün bəşəriyyətin atasıdır və deməli, yaşamaq aynasıdır.

821 B. *Canın şəkli* - cism. Adəm bəşəriyyətin canının şəkli, biçimidir,yəni cismidir. Səmanın yeddi qatı onun qolunda bilərzik kimidir, yəni buyuruğuna tabedir. Adəm kainatın əşrəfidir, bütün xilqətlərdən üstündür.

822 B. *İki beşik* - göylə yer, pərilər və insanlar aləmi.

823 B. *Zindan əhli* - bu dünyada yaşayanlar. *Ruh əhli* - ruhanilər. Adəm ona görə saqi sayılır ki, Tanrının ona öyrətdiyi adları o, mələklərə və insanlara öyrətmişdir.

824 B. Cahan dairəsi Adəmin alış-veriş aləmi, bazarıdır, Tanrı öz yaradıcı qüdrətini ilk dəfə onun timsalında aşkarlayır.

827 B. Birinci misra Adəmin ən parlaq göz-nəzər sahibindən, yəni Həzrət Məhəmməd peyğəmbərdən peyğəmbərlik nuru almasına işarədir. Ən uca ağac – cənnət.

828 B. *Cənnət quşları* - mələklər. *Dən aldı* - bilik aldı. Mələklər Adəmə ona görə minnətdardırlar ki, Adəm Tanrıdan öyrəndiklərini onlara öyrətmişdir.

831 B. Beytin məzmunu Qurani-şərifdən gəlmədir: "Bütün mələklər ona (Adəmə) səcdə qıldılar. İblisdən başqa".

832 B. Beytin mənası Qurani-şərifdən gəlmədir: "O (Tanrı) dedi: - Ey iblis, sənə nə olub ki, baş əyənlərlə birlikdə secdə qılmırsan?

O cavab verdi: - Mən sənin quru torpaqdan, dağılmış qara gildən yaratdığına heç vaxt səcdə qılmaram".

838 B. Adəmin atasız, anasız yarandığına işarədir.

840 B. Cənnətdən qovulduqdan sonra Adəmin Günəş altında yanması və dərisinin saman rənginə düşməsi nəzərdə tutulur.

845 B. Cəzalandırmaq məqsədilə buğda ağız açır ki, insanları udsun. *Buğdanın ağzı* - onu iki hissəyə bölən orta xətt.

853 B. Onun günahı ucbatından solmuş ismət gülünü canlandırmaq üçün Adəm yağış yağdırdı, buna görə Sərəndibə köçüb çadır qurmağı lazım bildi. *Sərəndib* - Seylon.

855 B. Rəvayətə görə əməlindən peşman olub tövbə qılmış Həzrət Adəm Hindistanı qırx il dolaşaraq göz yaşları tökmüş, yas, matəm rəmzi olaraq nil (lil) rəngli paltarını daim əynində daşımış və başına bəla kəsilmiş nil çöhrəli fələk yalnız bundan sotra ondan əl çəkmiş, Adəmin tökdüyü göz yaşları yerində yaşıl çəmənlər göyərmişdir.

856 B. *Fələk vuran ləkə* - yeməyə məcbur edildiyi buğda sayəsində cənnətdən qovulması.

857 B. Turan dünyasının bir hissəsi olan Xəta (Xətay, Kitay, Xütən, Qara Kitay, qədim Türklərin iki qitəni qapsayan (ehtiva edən) məskənlərindən biridir. Dəqiq xəritəsini vermək çətindir. Ancaq hər halda Himalay dağlarından başlayaraq Əfqanıstanın şimal hüdudlarına, Xorasanın cənubunadək uzandığı, Tibet (türkcə: tanqut), Qaraqurum, Pamir (türkcə ham yer – hamar yer), əsası türklər tərəfindən qoyulmuş Xanbalıq (Pekin) ərazilərini qapsadığı şəksizdir.

Nizami Gəncəvi bütün türklərin o sırada Xəta türklərinin cismani və əxlaqi hüsnü ilə fəxr etdiyini bildirir. Üzüqara Adəmin Xəta türkləri kimi üzüağ olduğunu, Ay kimi şölə saldığını və qüsurlarını, xətalarını tövbə papağı altında gizlətdiyini vəsf edir.

860 B. *Altıqapılı ev* - dünyanın altı cəhəti: alt, üst, ön, arxa, sağ, sol. Dini rəvayətə görə Adəm cənnətdə olarkən cənnət xəzinəçisinin ona verdiyi gül

və bitki toxumlarını qoruyub saxlamış və cənnətdən qovulandan sonra planetin hər tərəfinə səpmişdir.

862 B. *Ud*- Hindistanda bitən elə bir gözəl ağacdır ki, yandırılanda ətrafa xoş bir rayihə saçır, buna görə manqalda istifadə olunan odun sırasında ayrıca yer tutur. Nizami bəşəriyyət qarşısmda böyük xidmətləri olan Adəmi "ud" və "eşşək" epitetləri ilə süsləyir. Burada "eşşək" zəhmət və cəfakeşlik timsalıdır.

863 B. Bu beyt ilə Nizami bəşəriyyətə xitab edir, onun yolunda Həzrət Adəmin nələr çəkdiyini bildirir.

864 B. Nə qədər ömrün bahar çağındasan, gəncsən, enerjini, özünü gözəl əməllərə həsr et ki, alaq, tikan sayaraq səni bostandan, insanlıq aləmindən kənara atmasmlar.

865 B. Qocalıq ömrün son baharı, xəzan çağıdır. Buna görə gəncliyin qədrini bil, xalqa xidmətini gənclikdə gücləndir! Ömrün sonu titrətmə, qızdırma, möhnət və iztirab ilə doludur.

874 B. Nizaminin fikrincə, cismani və mənəvi hüsnün atributlarından biri - çeviklikdir. Yalnız nəfsini cilovlamağı bacaran, dünya yükünü çiyninə götürməyən pak nəfəsli, pak cövhərli insanlar çevik və ruhən qanadlı olurlar.

875 B. Bundan əvvəlki beytdə yürüdülmüş fikrin davamıdır. Nəfsini cilovlaya bilməyənlər, dünya yükünu öz öhdəsinə götürənlər Qaf dağı kimi ağırlaşıb öz yerində qalır, çevik, ruhən qanadlı insanlar isə ruzigar kimi azad " və sərbəst dolaşırlar. Beləlləri bütün kainatm mənəvi hökmdarıdır.

877 B. Divarları aynalı otaq - bizim dünya. Bu dünyada hamı və hər şey səni gördüyü halda, sən yalnız özünü görürseə, deməli, xudbinsən, eqoistsən.

878 B. Nizaminin fikrincə, eqoist, xudbin adamlar diri olsalar da ölü kimidirlər, çünki hər şeydən üstün tutduqları vücudlarını cəmiyyətdən və təbiətdən özləri ayrı salmışlar.

## UMİDSİZ PADŞAHIN BAĞIŞLANMASI DASTANI

900 B. *Fani muncuqlar* - qızıl, mülk, varidat yığmaq aludəliyi.

## İkinci söhbət
## ƏDALƏTLİ VƏ İNSAFLI OLMAĞA DAİR

907-908 B. Nizami kainatın əşrəfi, ən böyük yetirməsi, təbiətin nadir dürdanəsi hesab etdiyi İnsanı öz adma layiq olmağa çağırır: öz ömrünü, varlığını yalnız böyük və nəcib əməllərə, xeyirxah, bəşəri qayələrə həsr edənlərin Tanrı xəzinəsində inci kimi yaşamağa layiq olduğunu bildirir.

910 B. *Əzəli nur* - kainatı, təbiəti və bəşəriyyəti yaradan qüdrətin cövhəri. Nizaminin fikrincə, İnsan həmin gövhərdən daha çox bəhrələnmiş,

başqa canlılardan fərqli olaraq ona idrak qüvvəsi verilmişdir. Buna görə insan canlıların şahı sayılır və bütün xilqətlər üçün məsuliyyət onun boynuna düşür.

912 B. İnsanı şərəfləndirən əvvəlki parçada yürüdülmüş fikri davam etdirir. Öz zəka, humanizm və iradə gücünə görə bütün canlıların tacı və tacidan adlanmağa layiq İnsan kainatda öz müstəsna rolu ilə fəxr edə bilər.

913 B. *Dünya çevrəsinin dışı* - ruh dünyası. Nizaminin fikrincə, yalnız öz insan funksiyasını dərk edən zəka və iradə sahibləri ona mənəvi ömür qazandıran ruh dünyasında yaşamağa qadirdirlər. Beləlınin qiyməti hər iki cahan üzüyünün qaşı qiymətindədir, yəni çox yüksəkdir.

926 B. Yəni maddi varlıqları verib mənəvi sərvətləri qazanmaq imkanın var ikən nə üçün şeytana uyursan, əksinə davranırsan?

927 B. *İksir* - qədim kimyagərlərin nəzərində elə bir maddədir ki, guya onun sayəsində adi metalları qızıla çevirmək olar. Nizami demək istəyir ki,din kəhrəbasının bircə qırığı da bu cür qüdrətə malik batman-batman qızıldan üstündür.

928 B. *Daş, qara torpaq* - maddi aləm, bizim dünya; *cəvahir, saf qızıl* - ruhlar aləmi, din, mənəvi qüvvət.

941 B. Müsəlmanlıq mövqeyində mətin dayanan Nizami Gəncəvi atəşpərəstliyi (günəşpərəstliyi) rədd etdiyi üçün Günəşi mənfi epitetlə səciyyələndirir, arsendən (siçanotundan, mışyakdan) düzəldilmiş zərnix (topadaq) oyununa bənzədir. Aybaşı çağlarında müsəlman qadınlar, gəlinlər və qızlar namaz, oruc ayinlərindən azad olduqları üçün bu oyun ilə baş qatmaq, əylənmək ixtiyarına malikdirlər.

942 B. *Doqquz mıxlı çadır* - bu dünya.

943 B. Dini anlayışa görə Həzrət Məsih (Məsiha, İsa) peyğəmbər atəşpərəstliyi aradan qaldırmaq üçün göyün dördüncü qatına qalxmışdır ki, Günəşi öz nəfəsinin gücü ilə üfürüb söndürsün (prof. R.Əliyev).

## ADİL NUŞİRƏVAN İLƏ VƏZİRİN HEKAYƏTİ

979 B. *Çiynindəki yük* - zülmün yükü.

990 B. *Günəşə at çapanlar* - Tanrıya can atanlar.

## Üçüncü söhbət
## DÜNYA HADİSƏLƏRİNƏ DAİR

1011 B. Sam məşhur pəhləvan və qəhrəman Rüstəmin babası, Zalın isə atasıdır. Zal anadan olanda ağ saçlı imiş. Buna görə Sam xalqa gülünc olmaq qorxusu ilə uğursuz saydığı çocuğunu bir dağ başına atıb qayıdır. Simürğ isə bunu bir ət parçası bilərək yuvasına gətirir. Fəqət başı tüklü olduğundan

yemir, yavruları ilə birlikdə bəsləyib böyüdür. Atası qara saçlı, oğlu ağ saçlı nüktəsi Firdovsinin "Şahnamə"sində qələmə alınmış bu rəvayətdən doğmuşdur.

1016 B. Orijinalda "su içində odlanar" ifadəsi əvəzinə "nalı oda qoymaqdan" söhbət gedir. Keçmiş cadugərlər bir şeyi, yaxud şəxsi hüzura gətirmək məqsədilə nalı oda qoyub əfsun oxurmuşlar. Nizami demək istəyir ki,ümmanda, dənizdə əziyyət çəkənlər hər cür vasitəyə əl atırlar ki, sahilə çıxa bilsinlər.

1017 B. Ən bəxtəvər insan belə sonadək tam bəxtəvər deyil, çünki ölümdən qurtuluş yoxdur.

1023 B. Fikrin ona görə cılız və dardır ki, nəfsinə əsir olmusan, maddi aləmdən dördəlli yapışmısan, ruh mənəviyyat aləmindən xəbərsizsən.

1029 B. Nəbatat alimlərinin fikrincə, gül bağlarında xüsusi növlu bir tikan olur, sünbül çiçəyinin kökünü o tikana sarıyıb bir muddət saxladıqda sünbülün ətri çoxalır.

1030 B. Nizami Gəncəvi "ciyərlər dağlamış" səhranın timsalında zalımları, zülmkar sultanları, qanlı imperiyaları qələmə alır və onların bəşər məhkəməsi önündə mütləq cavab verməli olacaqlarına hökm verir.

1041 B. Ədalətli, humanist Həzrət Süleyman peyğəmbərin dünyası çoxdan arxada qalıb, zülmkarlıq, qəddarlıq dövrü başlanıb, buna görə də cəmiyyətdə kişi yox kimidir.

## SÜLEYMAN PEYĞƏMBƏRLƏ QOCA ƏKİNÇİNİN HEKAYƏTİ

1053 B. *Quş dililə danışmaq* - mənasız, boş danışmaq.

1066 B. Hər kəs gücü çatan işdən yapışmalıdır.

1070 B. Yalnız nadir qəhrəmanlar xalqın qayğısını çəkməyə qadirdirlər. Sirri hər kişi saxlaya bilməz.

## Dördüncü söhbət
## RƏİYYƏTİN HAQQINI PADŞAHIN QORUMASI

1077 B. Bəsrəli Rəbiə məşhur zahid qadın olmuşdur. Bir gün yanar çöldə susuzluqdan bayğın düşmüş bir it görür, başındakı külahını saçlarıyla bağlayır, quyuya dol kimi sallayır, su çıxarır. Əshabi Kəhfin yeddincisi sayılan heyvanı ölümdən qurtarır. Bu yolla övliya mərtəbəsinə qalxır. Quranın “əl-Kəhf” surəsinin 21-ci ayəsində dini təqiblərdən çəkinib mağarada gizlənmiş altı gənc və onların itindən söhbət gedir. Sahiblərinə qeyri-adi sədaqətinə görə həmin itə danışıq qabiliyyəti verilib. Nizami bu ayədən istifadə etmişdir.

1079 B. Yalnız erkəklik aktını yerinə yetirənlər, Nizaminin fikrincə, kişi sayıla bilməz. Kişi olmaq böyük, xeyirxah iş görmək, tərəqqi uğrunda mübarizə aparmaq deməkdir.

1088 B. Rəvayətə görə Qəznəli Sultan Mahmud (997-1030) məcusilərin (atəşpərəstlərin) mərkəzi olan Sumenat şəhərini zəbt edərkən oradakı bir atəş məbədini dağıtmış, bundan mütəəssir olan möbidlərdən biri sultana ölüm diləmək üçün xəlvətə çəkilmiş, sultan xəstələnmiş, heç bir dava-dərman dadma yetməmiş, ölümünün qaçılmaz olduğu anlaşılınca ariflərdən birinin məsləhətilə möbidin bəd duasını pozmaq qərarına gəlmiş, buna görə sağaldığını yalandan bildirmiş, bəd dua pozulmuş, ölümdən qurtulan sultan böyük şənlik ziyafəti vermişdir.

Beytin mənası zülmkarlıqdan əl çəkməyə çağırışdır.

1090 B. Su tısbağası sahilə çıxıb yumurtlayır və yumurtalarını quma basdırıb dənizə qayıdar. Yumurtalar qumda qızıb yetişəndən sonra qabığı partladıb çıxan tısbağa yavruları özləri analarının ardınca dənizə gedir.

Beytin mənası: Əgər su tısbağası belə bir qabiliyyətə malikdirsə, onda görün mələklərdən daha yüksək mövqe tutan İnsan nələrə, ən azı zülmkarlığı aradan qaldırmağa qadirdir, əlbəttə ulu Tanrının mərhəməti sayəsində!

## QARI İLƏ SULTAN SƏNCƏRİN HEKAYƏTİ

1108 B. *Abxaz qarəti* - 1139-cu ilin sentyabrında Gəncədə baş vermiş fəlakətli zəlzələdən sonra şəhər dağılmış və viran görən Gurcüstan çarı Gəncəyə hücum edərək yağmalamış, dinc əhalini qarət və əsir etmişdir (prof. R.Əliyev).

1127 B. Xeyirxahlığın və ağ günün timsalı olan Simurğ quşu. Əfsanəyə görə Elbrus dağının əlçatmaz zirvəsində yaşadığına görə, Nizami ədalətin cəmiyyətdə yoxa çıxdığını və qalxıb yalnız Simurğ qanadı altına sığındığını bildirir.

## Beşinci söhbət
## QOCALIĞIN SİFƏTLƏRİ

1130 B. Dörd ünsürün vəhdətini alqışlayan bu beytdə atəşlə su - gəncliyin, *torpaqla yel* - qocalığın rəmzidir.

1133 B. Yəni: qocalmısan.

1138 B. Nizami insan cismində gənclik ilə qocalığın çarpışdığını təsvir edir. Qara saçlar qara zənci ordusuna bənzədildiyi halda ağ saçlar ağüzlü, müdrik və müzəffər türk ordusuna oxşadılır. Nizamidə türklük paklığın, üz ağlığının, istedad və qəhrəmanlığın, ən başlıcası, humanizmin timsalıdır.

Bu qara, ağ saçların nəyi öyrədir sənə?
Gecədən yol gedirsən təfəkkür gündüzünə

beyti də bunu təsdiqləyir. Türklük, burada zəka qüvvəsi, təfəkkür gündüzü, idrak günəşi biçimində aşkarlanır.

1143 B. *Cəmşid dövləti* - gənclik, Nizami üçün mənəvi çiçəklənmə və kamal çağları - qırx yaş dolaylarıdır.

1151 B. *Qara daş* -məhək daşı.

1153 B. Burada kafurun kimyəvi maddə kimi soyuqluğu və ağlığı qocalığın soyuqluğuna, qocanın saçlarının ağlığına təşbeh gətirilir.

1155 B. Əfsanəyə görə, günəş batarkən rəngləri çalaraq (oğurlayaraq) göyün dördüncü qatında nəhəng bir küpün içinə doldururmuş. Həmin mövqedə yaşayan İsa peyğəmbər bu böyük sərmayə sayəsində boyaqçılıq edərmiş. İsanın arxadaşları həvarilər bez ağartmaqla dolanarmışlar. Şair bezağardanlar ilə boyaqçıların münasibətinə işarə edir.

1156 B. Bu beytin dürüst elmi şərhini verən prof. R.Əliyevin yazdığına görə, paltaryuyan ilə boyaqçının yaxınlığı sübutlarından biri də budur ki, su (ab) və ay işığı (məhtab) arasında sıx bağlılıq var, çünki dənizlərdə, ümmanlarda qabarma (mədd), çəkilmə (cəzr) hadisəsi, habelə yağışların yağması Ayın hərəkətindən, dövriyyəsindən ayrılmazdır.

1160 B. Bir şəxsdə rumluluq (üzağlığı) ilə zənciliyin (üzqaralığı) birləşməsi onun ikiüzlü olması deməkdir. İkiüzlülər, elm, maarif yolunda dəridən-qabıqdan çıxsalar belə Nizaminin fikrincə, kəmalə yetə bilməzlər, onların alnında həmişə zalım və cahil damğası görünəcək.

1162 B. Ağaclar yazağzı çiçəkləyəndə sanki başlarına ağ tac qoyurlar, mövsüm dəyişdikdə isə başqa rəngə düşürlər.

Beytin mənası: Kainatın əşrəfi olan insan bu cür davrana bilməz, o bir rəngli, bir sifətli olmalıdır.

1168 B. Müstəqim mənasından başqa beytin məcazi mənası budur ki, dörd ünsürün; torpağın, odun, havanın, suyun vəhdətini alqışlayır. Təbiətin və cəmiyyətin bu özülə söykəndiyini bildirir.

## KƏRPİCKƏSƏN QOCANIN HEKAYƏTİ

1178 B. Əmirlər, sərkərdə və qəhrəmanlar basıldıqda (məğlub edildikdə), ölüm məqamının yaxınlaşdığını hiss edincə vəsiyyətlərində arzu edərdilər ki, məzarlarının üstü həmin qocanın kəsdiyi kərpicləri ilə götürülsün. Bu halda onlar ümid bəsləyirdilər ki, bu sipər (bu kərpiclər) onları himayə edəcək, qəbir əzabından qoruyacaqdır.

1183 B. Birinci misrada yer səthi qalxana, torpaqqazan bel isə qılınca oxşadılıb (prof. R.Əliyev).

1188 B. *Kölələr yük daşıyar* - Zülmə boyun əyənlər, təslimçilər və fərarilər özlərinə layiq rəzil həyata məhkumdurlar. Mən belələrinə nifrət bəsləyirəm, öz zəhmətimlə dolanıram.

## Altıncı söhbət
## VARLIĞIN ETİBARI HAQQINDA

1196 B. *Bu göy rəngli pərdə* - səma, fələk.

*Müvəqqəti vücud* - insanlar.

Beytin mənası: Yalnız insanlığa xidmət yolunu tutan insanlar yaşamağa və mənəvi ömrə layiqdirlər. Qalanları müvəqqətidirlər və həddindən artıq olduqları üçün gərəksizdirlər. İnsanlıq özünü özgələrə həsr etməkdən başlanır. Beleləri ədəb nuru ilə parlayan gözlərinin gövhərini başqalarının xidmət kəmərinə dikiblər.

1198 B. Bu pərgar nöqtəsində, bu dönüb dolanan dünyada elə bir vücud yoxdur ki, müəyyən bir işlə məşğul olmasın.

1199 B. *Neçə yəhərli at* – fələklər, göylər, ulduzlar. *Süvarilər* - insanlar.

Beytin mənası: Kainatda hər şey insan üçün yaradılıb. İnsan öz zəka gücü sayəsində ulduzları köhlən kimi yəhərləyib çapa bilər, deməli, bütün kainat onun hökmündə, iradə və ixtiyarındadır.

1200-1201 B. Nizaminin fikrincə, Tanrı hələ "Ol!" (Kun!) əmri ilə kainatı yaratmaq ərəfəsində İnsanı düşünmüş, kainatı İnsan üçün xəlq etdiyini qərarlaşdırmışdır. Buna görə Nizami insanın və məhəbbətin hər şeydən qədim, qocaman və əzəli olduğu fikrini qətiyyətlə bildirir.

1202 B. Yəni yaxşını yamandan, gözəli eybəcərdən seçmək üçün sənə iradə və ixtiyar verildi.

1203 B. Quş dəni necə dənləyirsə, əcəl də səni eləcə dənləyib torpağın kamına çəkəcəkdir. İndi ki belədir, gözəl yaşamağın yolunu öyrən, maddi aləmi müvəqqəti say və mənəvi aləm üçün yaşa!

1204 B. Leş yeyən kərkəs və quzğun kimi yaşama, təbiəti çırmaqlayan bu quşları tərk et və onların hamısının başı üstündə yaşarı, ruh, paklıq, nicatvericilik timsalı Simürğ kimi qanadlan!

1205 B. *Can qəfəsindəki quş* - ruh, Nizaminin fikrincə, insan özü gəldi-gedər xilqət olsa da, ruhu əbədi, ölməzdir. İnsan cismində yaşasa da, özü bu cisimdən xeyli yüksəklərdə durur.

1211 B. İki aləm: maddə və ruh aləmi.

1214-1216 B. Nərgizin gözlərinə sürmə çəkən dan yelləri, misə qızıl rəngini verən kimyəvi iksir olduğu kimi insanı da insan mərtəbəsinə qaldıran onun ruhudur. Ürəkdə yerləşən ruhunun gücünü dərk edə bilsən, sən bütün kainatın sultanı, hökmranı ola bilərsən. Bəşəriyyətin ən böyük sərvəti olan elm və bədii söz də ruhun yetirməsidir, idrakın hər cür töhfələri də. Yalnız ruhuna xidmət et!

1217 B. *Ceyran göbəyi* - ceyranın müşk vəzləri. "Müşk" deyilən ətirli maddə burda yerləşir.

1219 B. Ceyranın dərisi nisbətən yüngül, zərif və möhkəm olduğuna görə qədimlərdə bundan kağız yerinə istifadə olunarmış. Dəri, gön üstündə məktub yazılarmış. İlk kitablar dəri-gön vərəqlərdən ibarətmiş.

1222 B. Gecədən səhərə doğru yürü, dan yeri sürdüyün köhlənin ağ nalı kimi şəfəqlənsin. Yəni ibadətlə məşğul ol, şüalardan yaralanan səhər kimi ahın, nalən ürəyini yaralasın, nalə qılıb Tanrıya yalvar, səhər namazının nuruna bürün!

1231 B. Prof. R.Əliyevin yozumuna görə, bu beytin ikinci misrası Qurani-şərifin "ət-Təlaq" surəsinin yeddinci ayəsinin tərcüməsidir. Ayə belədir: "Tanrı hər sıxıntıdan sonra genişlik (asanlıq, şadlıq) gətirir".

## OVÇU İLƏ İTİN VƏ TÜLKÜNÜN HEKAYƏTİ

1233 B. Ovçunun elə bir cəld, yavuz sərt və çevik qaçan iti vardı ki, Günəş şüası belə ona çata bilməzdi, buna görə it işıq sürətinə nöqsan tutardı. Prof. R.Əliyev yazır ki, şair "ahu gereftən" mürəkkəb felini ustalıqla oynadıb şairanə məcaz yaradır. Həmin felin ilk mənası "ahu tutmaq", digər mənası isə "irad tutmaq" deməkdir.

1240 B. *Arpa* - ən kiçik çəki vahidi. *Dirhəm* - çəki vahidi altı danka bərabərdir: Hər dank iki karat, hər karat isə dörd arpa çəkisindədir.

1247 B. Köhnə təbiblərin fikrincə, yağlı xörək ziyandır, səfraya gətirib çıxarır.

1254 B. Beytin məzmunu Qurani-şərifin "ət-Təlaq" surəsinin yeddinci ayəsindən gəlmədir: Həyatda, insan varlığında hər bir qəmdən, kədərdən sonra fərəh və şadlıq gəlir.

1261-1265 B. Beytlərdə yəqin anlayışı fəlsəfi termin kimi işlədilib. Mənası əqidədə möhkəmlik, sabitqədəmlik, özünə inam və qüdrət deməkdir. Nizami haqqa inamında qətiyyətli olmağa çağırır.

1270-1271 B. Yəqin əhli misilsiz, *kamil* - onlar, *naşı* - biz. Yəqin əhli kamil insan simvoludur. Onlar Qurani-şərifin haram elan etdiyi şərabı içdikdə belə halallığı nuş edirlər, bu nemətə bal dadı gətirirlər. Çünki müstəqil şəxsiyyətə malikdirlər və nəyin halal, nəyin haram olduğunu bizdən yaxşı bilirlər.

## Yeddinci söhbət
## İNSANLIQ MƏRTƏBƏSİNİN BÜTÜN XİLQƏTLƏRDƏN ÜSTÜNLÜYÜ

1279 B. Nizaminin fikrincə, İnsan kainatın əşrəfidir və əslində Tanrı kainatı İnsanın şərəfilə yaratmışdır. Ay, Günəş, bütün səyyarələr və bütün nemətlər İnsana xidmət naminə xəlq olunub. Buna görə İnsanı təbiətin nazlı yavrusu adlandırmaq olar. Qurani-şərifin "ət-Tin" surəsinin dördüncü ayəsində deyilir: "Biz insanı ən gözəl şəkildə yaratdıq. Buna görə insan bütün

xilqətlərdən daha kamil olması müqabilində nəcib, xeyirxah, humanist olmalı, özündən aşağı pillədə duranların hamısı qarşısmda məsuliyyətini, cavabdehliyini daim dərk etməlidir. İnsan bütün flora, fauna aləmini, bütün təbiəti sevib qorumağa, yaşatmağa borcludur. Onun başlıca məziyyətlərindən biri cəmiyyəti kamilləşdirmək və təbiətlə cəmiyyət arasında üzvi ahəngdarlıq yaratmaqdan ibarətdir.

1280 B. Bu beytdə Nizaminin humanizm konsepsiyasının məğzi verilib. Tanrıdan öyrəndiyi "adlar elmi"ni və bütün bəşəri təcrübəsini Adəm öz törəmələri üçün qoyub getmişdir. İnsan bu məsuliyyəti və kainatın əşrəfi olduğunu dərk etməlidir.

1280-1283 B. İnsan əzəli dayədən süd əmməyincə qənd, şəkər dadıb, yəni xilqətcə gözəl, ülvi, humanist yaradılıb, suyu şirin və qanı şirin xəlq olunub. Məgər bundan böyük yaxşılıq olar? İnsana yalnız mənəvi üstünlük, idrak adlı misilsiz töhfə deyil, həm də cismani üstünlük verilib. Bütün xilqətlər ilə müqayisədə ən kamili, ən gözəli İnsandır!

1286 B. Nizaminin fikrincə, bütün heyvanlar və quşlar və ümumən, canlı-cansız təbiət İnsana xidmət üçün yaradılmışdır. Buna görə insan öz xidmətçisinin qədrini bilməli, flora, fauna aləmini, ümumən, təbiəti qorumalıdır.

1294 B. Ay gündüzlər pərdəli gəldiyi, görünmədiyi halda, gecələr görünür, deməli pərdəsiz qalır.

1295 B. Gecə hər şeyi öz qaranlıq pərdəsi altmda saxladığı halda dan yeri- sübh bu pərdəni aradan qaldırır və bütün gizlinləri faş edir.

1296 B. Yeni Bal arısının sirləri bəzən elə sirr olaraq qala bildiyi halda,sənin heç bir sirrin bəşəriyyətin nəzərindən yayınmır. Bal arısının gül pərdəsi deşiksiz, bütöv olduğu halda, sənin fəza, fələk, göy adlı pərdən şan-şan, göz-gözdür. O gözlər hər şeyi apaşkar görür.

1297 B. *Hörümçək toru* - acgözlük, nəfs, tamah toru, şöhrət, sərvət düşkünlüyü.

1298-1299 B. *Pərdə ardındakı Tanrı ərənləri* - ilahi qüvvələr. *Pərdə dalından çıxmaq* - din yolundan çıxmaq.

1304 B. Sən heç olmasa qırx gün riyazət cəbrinə qatlaşa bilsən, bədənin cürbəcür ehtiraslardan: sərvət, şöhrət, qadın düşkünlüyü və acgözlük azarı kimi müxtəlif xıltlardan təmizləməyi bacarsan, ruhun yuvası, qaynağı olan könül kimi, can kimi paka çıxarsan (prof. R.Əliyev).

1311 B. Ucuz ehtiraslar ardınca qoşmaq dəmirçixanaya getmək və od kürəsinə yanaşmaq kimidir: üstünə çmqılar səpələnəcək, bəlkə də səni yandıracaqdır. Zəka və təfəkkür, insanlığa xidmət ardınca getmək isə əttar dükanına varmağa bənzər. Bu halda sən düşüncə və idrak rayihəsinə qərq olacaqsan!

1318 B. Məhəmməd peyğəmbərin əmisi Əbu-Talib islamiyyəti qəbul etmədiyinə görə əslində cəhənnəmə vasil olmalıdır. Lakin Həzrətlə qohumluğu onu əsfələsafilin atəşindən qoruyur. İslamı qəbul etməsə də, Əbu-Talib nəcib, xeyirxah kişi olmuş, Həzrət peyğəmbər onun xətrini istəmişdir.

## FİRİDUN ŞAHIN CEYRAN OVU HEKAYƏTİ

1325 B. Ahunun belinin dərisi sərt, qaba olduğu halda, qarnının dərisi, xüsusilə göbək ətrafı hamar, incə və yumşaq olur. Şah əlindəki kamanın kirişini o qədər dartdı və sürtdü ki, ceyranın göbəyi kimi yumşaltdı və öz atını (Rəxşini) odlanmış ciyəri kimi qızışdırdı.

1330 B. Kaman dilə gəlib deyir ki, bu ceyran yavrusu sənin nəzərinin himayəsində irəliləyir. Kimin cürəti çatar ki, sənin diqqətinə, zirehinə tərəf ox tuşlasın?!

1331 B. Sən çalğıçısan, şahim, məgər razı olarsanmı ki, sənin ceyranını ovlasınlar, dərisindən dəf düzəldib özgələr çalsın?! Yaxud dümbək çalanların əlləri ilə döyəclənsin?! (prof. R.Əliyev).

1336 B. Mənası: Hər kim öz xalqına, bəşəriyyətə sədaqətlə və təmənnasız xidmət etməyi bacarırsa, o, xəzinə sahibi olacaqdır.

## Səkkizinci söhbət
## YARADILIŞIN HÜSNÜNƏ DAİR

1341-1342 B. Yəni insanlıq və kainat yaradılmazdan öncə varlıq bomboş və olduqca yoxsul idi. Prof. R.Əliyevin elmi açıqlamasından aydınlaşır ki, bu məqamda Nizami məşhur yunan filosofu Ərəstunun yaradan və yaradılmışlar arasındakı fəsilələri öyrənmək üçün icad etdiyi on qatlı (mərtəbəli) əql nəzəriyyəsindən bəhrələnmişdir: birinci əql, küll əql, fərdi əql və sair.

1348-1350 B. *Axar su* - hərəkətdə olan göy, yaxud onun qar, yağış yağdırma şakəri. Yəni Tanrı öz kəraməti ilə yerləri, göyləri hərəkətə gətirməklə, səni su ilə gilin vəhdətindən yaratdı. Sən bir toz zərrəsi kimisən, dünyanı tutsan da, yenə zərrəciyə çevrilib yox olacaqsan, bir cüz ikən küllə qovuşacaqsan. Səndə nəfs, tamah, sərvət, şöhrət düşkünlüyündən ibarət o qədər kirli ehtiraslar var ki, dünya sənsiz çağlarını şükranlıqla xatırlayır.

1355 B. Əski astronomiyaya görə, göydəki on iki ulduzlar topasından biri sayılan Cevza, yaxud baş-başa vermiş iki qızcığaz şəklində Əkizlər bürcü Hava bürcü hesab edilir. Buna görə soyuqdəymə və qan aldırma hadisəsi ilə əlaqələndirilir.

1356 B. Keçmişdə Ay tutulanda teşti, ləyəni döyəcləyib, yaxud mis qapaqları bir-birinə çırpıb haray-həşir qoparardılar. O çağlar sən yox idi, deməli, teşt də sənin mənasız hay-küyün, döyəcləməyin ucbatından zərbələr yemirdi.

1357 B. Dini əsatirə görə Harut və Marut adlı iki qılman tərəfindən yoldan çıxarılan əli qavallı gözəl musiqi və şənlik ilahəsi Zöhrə ayağı sürüşgənliyinə görə Tanrı tərəfindən cəzalandırılmış, yerdən göyə qovulmuş, Venera

ulduzuna çevrilmişdir. Onu yoldan çıxaran Harut və Marut isə qanaddan məhrum edilmiş və Babilistanda bir quyuda başıaşağı halda asılmışdır.

1360 B. Sən dünyaya gələndən sonra ulduzları gözə gətirdin və bəd nəzərinlə onların şən gəcavəsi üstündəki bayrağın ulduzunu qırdın (prof. R.Əliyev).

1363 B. *Səhərin məşəli* - günəş. *Sübhi sadıq* - buludsuz, dumansız, parlaq sübh. *Fərri kazib* - yalançı şəfəq, yaxud alatoran sübh.

1364 B. Sən ki göylərə bunca əzab, əziyyət vermisən, gör nə qədər miskindir ki, hələ də sənə səcdə qılır, sənə xidmət etmək üçün belinə kəmər bağlayır!

1365 B. İsa peyğəmbərin təliminə görə "insan ruhun səməridir", şair buna işarə ilə bildirir ki, eşit, inanma, çünki bunlar ürəyin yox, dilin sözüdür (prof. R.Əliyev).

1366 B. Sən daşıdığın İnsan adına layiq deyilsən. Tacın başından daha qiymətlidir. Elə bir itsən ki, boyunda gəzdirdiyin xalta belə səndən bahalıdır.O qədər eşşəklik eləmisən ki, qarşındakı arpa-saman torbasına da layiq deyilsən. Nizami bu cür ittihamlar irəli sürürkən insanın heyvansal mahiyyətini,acgözlüyünü, sərvət və şöhrət düşkünlüyünü, ruh və mənəviyyat zənginliyi qayğısı çəkmədiyini ifşa edir.

1367 B. *Laqqırtı evi* - dünyamız.

1368 B. *Bircə ovuc torpaq* - bədən. *Bircə gil qırığı* - bədən, cism, can- yuvası - ürək olan ruh aləmi.

Beytin mənası: Sən bədənini yaşatmaq naminə ruh aləmindən əl çəkdin. O dünyanı atdın, yalnız bu dünyanı tutdun.

1370 B. Nizami Gəncəvi yenə insanın maddi aləmə aludəliyini və mənəvi aləmə biganəliyini rüsvay edir. Maddi nemətlər sırasında fındıq soyuducu maddə sayılır.

Beytin mənası: Sincab kimi çevik mütəhərrik, qaynar beyin, alovlu zəka sənə ona görə verilmişdir ki, öz ruhunun qayğısını çəkəsən! Amma sən əksinə davrandın, fındıq rəngli torpağa bağlanmağınla onu soyutdun, korladın, öz qanadlarını qırdın. Özünü dəli, divanə etdin.

1371 B. "Ölməmişdən əvvəl ölün!" - Əl çəkin zülm etməkdən, yırtıcı ehtiraslardan, acgözlükdən, sərvət və şöhrət düşkünlüyündən. Əl çəkin!

1372 B. Dünya budaqdan budağa atılıb səninlə əylənən sincab deyil,qədrini bilməsən, yaşamağı bacarmasan, səni kamına çəkən əjdahadır, yırtıcıdır, gecəsi, gündüzü kimi ikiüzlüdür, yəni aldadıcıdır.

1373 B. Dələ yalnız pişikdən qorxur. Sən ki pişik deyilsən, dələduzluqdan, pişiyi qorxutmaqdan, alçaq ehtiraslar ilə əylənməkdən əl çək! Gecə- gündüz kimi tülkülük etmə, ikiüzlülükdən əl çək!

1374 B. Ovçuların dediyinə görə maralı ceyran və cüyürü asan ovlamaq üçün aslan heyvanların üz tutduğu çeşmənin, yaxud irmağın ətrafma selik tökür. Buradan keçən heyvanlar selik sahibinin, aslanm qoxusunu alan kimi özlərini itirir və yırtıcıya təslim olurlar.

1377 B. Qədimdə şəkər qamışından hazırlanan xüsusi tabaşir susuzluğu yatırmaq vasitəsi sayılırmış. Bunun üçün şəkər qamışını yığıb xırmanda alışdırar, yanıb kül olmamış üstünə torpaq atar, söndürər və içindəki ağ kristalları yığarmışlar. Bu ağ kristallar susuzluğu yatırmaq vasitəsi kimi işlədilərmiş. (prof. R.Əliyev).

1380-1381 B. Dünya malma aludəliyin, nəfsin, tamahın ucbatından dilxorsan, saralmısan. Onillik sirkə içibmiş kimi üz-gözünü turşudursan. Heyhat, sənin az qala yüzillik acgözlüyünü onillik sirkə apara bilərmi? Səfranı sirkə ilə müalicə etsələr də, bunun sənə xeyri yoxdur.

1382 B. Dədən Həzrət Adəmin qanı yeddi qatlı göylərin sürfəsində ikən ey yeddi çörək kömbəsinə bənzər yeddi səyyarəyə əl açıb dilənən İnsan, eyib deyilmi, nə üçün abrını-həyam tökürsən! Yetər, üzünün suyunu tökmə!

1387-1388 B. Ey yırtıcı nəfsinin yağında yanıb, qovrulan İnsan! Nə qədər ki sağsan, bu cahan mətbəxinin ocağında quru odun kimi od tutub yanacaqsan, o dünyada isə səni yalnız cəhənnəm alovları gözləyir.

## Doqquzuncu söhbət
## DÜNYA QAYĞILARINDAN QURTULMA BƏHSİ

1422 B. Biz kainatın əşrəfi yaranmışıq. Butün başqa varlıqlardan fərqli olaraq bizə düşünmək və dünya bilməcələrini qavramaq, anlamaq istedadı verilib. Yeddi qat göylərin sirlərini açan da bizik, fələyin əbcəddini, əlifbada hərflərin düzulüş qaydasım Yerin yazı taxtasında yazıb-oxuyan da biz!

1430 B. Sən qeyri-müəyyən bir nur damlası idin, Tanrı səni xəlq etdi, öz təfəkkürün ruh qüdrətin sayəsində Quzu (Həməl) bürcündən də yuxarılara ucaldın, bəxtəvərlik elçisi hüma quşu sənin uca başm üstündə qanadlarını gərdi.

1431-1435 B. Bir nur damlası ikən göydə sənin uçuş meydanın ucsuz-bucaqsız idi. Getdiyin yolun da sonu görünmürdü. Göydə aciz, avara qalıb yerə endin, gil ilə, su ilə birləşib xəlq olundun. Lakin yenə narahatsan. Bəzən Günəşi özünə doğru çəkir, bəzən də Günəş mövqeyinə yüksəlmək istəyirsən. Yer yuvarlağı dar gəlir sənə. Bircə ip üstündə oynamaq səni təmin etmir. Arzu və təfəkkür, ruh və könül səni yeni-yeni xariqələrə haraylayır, başqa iqlimləri kəşf etmək, ucalmaq sövdasmdasan. Heç yanda qərar tuta bilmirsən.

1436 B. Kamil insan özünün bütün qüvvəsini, bədən və idrak enerjisini bəşəriyyət və tərəqqi naminə xərcləyir, özu üçün yox, özgələr üçün yaşayır.

Buna görə müflisdir. O, qədim və köhnədir, çünki ruhu özündən əvvəl gəlib dunyaya. Təzədir, çünki bədəni ruhundan qat-qat gəncdir, dünən doğulub.

1437-1438 B. *Yavrusunu öldürən ana* - dünyamız. Ata öyüdləri – Həzrət Adəmin öyüdləri, günaha batmamaq və tövbə etmək tələbləri.

Beytin mənası: Səni maddi dünyaya bağlayan yırtıcı ehtiraslarından əl çək, mənəvi aləminin qayğısına qal! Atan Həzrət Adəmin yolu ilə get! Günahlarından əl çəkmək üçün tövbə qıl, təmizlən, pak ol!

1440 B. *Hədər keçən günlər* - zülm etməyə, ucuz ehtiraslara, sərvət, şöhrət, düşkünlüyünə sərf olunan çağlar. Bu hədər günlərin yerini doldurmağın yeganə çarəsi tövbə qılmaq, din yoluna qayıtmaq və gözəl yaşamağın qaydalarını öyrənməkdir.

1448 B. Bu beyt bizi Adəm gilinin qırx günə yoğrulması, çocuğun ana bətnində doqquz ay, doqquz gün, doqquz saat, doqquz saniyə yetişməsi və insanın yalnız 40 yaşında az-çox kəmalə yetməsi barədə düşüncələrə sövq edir.

1449 B. Ölərik, adımızı yeni doğulan çocuqlara, rütbəmizi, yerimizi başqa insanlara tərk edərik.

1450 B. Dini etiqada görə, İnsan qiyamət günu mizan-tərəzi və haqq- məhkəmə qarşısında bu dünyadakı əməlləri üçün hesab verməlidir, buna görə o, haqqın hökmü ilə dirildilir və məhkəməyə gətirilir.

## TÖVBƏSİNİ POZAN ZAHİDİN HEKAYƏTİ

1460 B. Alnımdakı yazı məni Kəbədən meyxanəyə atdı. Halalımdan əl çəkib harama qurşandım. Paklıq əlimdən çıxdı, çirkaba batdım, insanlıqdan əl çəkib nəfsə, tamaha uydum.

1470 B. Ulu göylər daim öz qasırğaları, ildırımları və göy gurultuları ilə yatmış insanı ayıltmağa, xəbərdar etməyə çalışır ki, ömürdən sonra da başqa bir mənəvi ömür var. Onu düşün! Öləndə yatmaq eyib deyil. Həyatda yatmaq isə eyibdir. Ayıl! O dünyaya köçmək üçün azuqə yığ, mənəvi ömrünü uzatmaq üçün çarələr tap.

1473 B. *Gecə yarı* - ömür yarı.

## Onuncu söhbət
## DÜNYANIN SONU HAQQINDA

1476 B. Prof. R.Əliyev yazır ki, onuncu qoşmanı Nizami Gəncəvi Sultan Səncərin (1117-1153) məşhur saray şairi Əvhədəddin Ənvəri (vəfatı: 1188) və bir bölük Xorasan münəccimi tərəfindən xəbər verilmiş tufana həsr etmişdir. Ənvərinin və onunla rəydaş olan ulduzşünasların 1176-cı ildə verdikləri xəbərə görə, 1186-cı ilin yayında iki nəhs səyyarə - Saturn ilə Mars Tərəzi

(Mizan) bürcündə qarşılaşacaq, bunun nəticəsində Ay tutulacaq və böyük tufan qalxıb Yer yuvarlağı ilə fələkləri alt-üst edəcəkdir. Nizami o çağın bir çox alim və ulduzşünasları kimi bir müddət Ənvərinin nəhs falına inanmış, onların yalançılığına bələd olandan sonra isə falın puçluğunu sübuta çalışmışdır. 1186-cı ilin yayında nəzərdə tutulmuş gündə nəinki heç bir tufan, qasırğa baş verməmiş, əksinə, hava çox mülayim və xoş keçmişdir. Bu halda camaat Ənvərini təqib edərək ələ salmağa başlamışdır. İndiyəcən araşdırıcıların diqqətini çəkməmiş bu. fakt "Sirlər xəzinəsi"nin yazılması tarixinin dürüstləşdirilməsində ciddi əhəmiyyətə malikdir.

1488 B. *Bircə ovuc torpaq* - insanın cismi.

1491 B. *Qəm küpü* - Yer kürəsi. *Matəm yaşılı* - Yer kürəsini əhatə edən fəza, göy.

Beytin mənası: Kədər bu dünyanın fitrətindədir, çünki kainatın əşrəfi olan İnsan gəldi-gedərdir, mahiyyətcə nakamdır.

1492 B. Qəm küpünü (Yer kürəsini) torpaqdan təmizləmək onu felən Yer kürəsi funksiyasından azad edib göyə, səmaya çevirmək deməkdir. Başqa sözlə desək, burada söhbət maddi aləmə aludəlikdən, acgözlükdən, şəhvətpərəstlikdən və s. eybəcər ehtiraslardan əl çəkib saflaşmaqdan, göylər kimi pak olmaqdan, mənəvi səmaya qovuşmaqdan gedir. Buna qadir olmayanlar çərxin qarşısında məğmun, aciz bəndələrdir, üzüqara adamlardır.

1493 B. *Yeddi nəhr* - yeddi səyyarə. *Dumanlı çevrə* - dünyamız. Beytin mənası: Dumanlı çevrədən, ətəyinizi murdarlayan dünyadan, maddi aləmdən qurtulmağa, bulaşıq ehtiraslardan təmizlənməyə, pak olmağa çalışın, səyyarələr dünyasına, mənəviyyat aləminə can atın!

1494 B. Bir halda ki, mənəvi aləmdən bunca xəbərsizsiniz, onda əl çəkin bu maddi aləmdən, qara bir xətt ilə damğalayın Yer kürəsini, yeri-göyü alt- üst edin, alın, çıxarın səmaların əynindən ulduzlar ilə düymələnmiş geyimini!

1498 B. Bütövlükdə göylər əzəmətli bir sədəfə bənzəsə də, əsil sədəf deyil, gözləri ulduz kimi işıldayan yırtıcıdır.

1500 B. Keçmiş münəccimlərin fikrincə, ulduzlara hədsiz diqqət yetirmək ziyandır. İlan zümrüd şöləsindən kor olduğu kimi ulduza baxmaq ölçüsünü itirmiş insan da ziyan çəkə bilər.

1501 B. Göylər zahirən sədəfə bənzəsə də nə şöləsi var, nə də içərisinin sağlam dürrü, gövhəri. Ulduzlardan ibarət min-min gözü olsa da, kordur.

1505 B. *Qəbir* - dünyamız *Damın bacası* - dünyamızın ən uca nöqtəsi,məsələn, Everest.

Beytin mənası: Dünyada ölüm hadisəsinin qarşısını almaq mümkün deyil. Dünya fövqündə dayanmaq da qeyri-mümkündür. Qurtuluş yoxdur.

1506 B. Sərsəmlər, epileptiklər sağalmaq üçün, klassik təbiblərin göstərişilə qapısı, pəncərəsi bağlı qaranlıq odalarda yaşar və gun işığı görməzlərmiş (prof. R.Əliyev).

1510-1512 B. Təbiətin və cəmiyyətin inkişaf qanunauyğunluqlarını, çərxin gərdişini, onun teldən nazik, sapdan incə hərəkət yollarını anlamaq, dərk eləmək dünyada hər kişiyə müyəssər deyil, çox çətin, zor işdir, bəlkə də qeyri-mümkündür. Sən tükün ucundan da incə olan bu mətləbləri dərk etməyə girişsən, mətləbə çatacağına əmin olma, işin gedişi səni xəmirdən bir tük kimi kənara atar.

1515 B. Başmda papağın varsa, kişisənsə, deməli, ülvi bir mərama tapınmalı, baş əyməli, bu məram yolunda can yandırmalısan. Belində kəmərin varsa, deməli, bu, xidmət kəməridir, qulluq etməli, insani borcunu yerinə yetirməlisən.

1517 B. *Həyat ocağının şöləsi* - Günəş.

1523 B. Nəfəs iki mənada işlədilib: 1. Nəfəs. 2. Ah-nalə, qarğış (prof. R.Əliyev).

Başqalarının eybini göstərsən, əks-hücuma keçər, səni ləkələməyə çalışarlar. Necə ki, aynaya nəfəs dəyəndə ayna dumanlanır, ləkələnir.

1528 B. Nizami Gəncəvi hər hansı canlı və cansızda, təbiət, yaxud cəmiyyət hadisəsində ilk növbədə gözəli, yaxşını, müsbəti görməyə və bu barədə danışmağa çağırır. Tovus quşunun əlvan güllər kimi rənglər sərgisini görmədiyin halda yalnız çəlimsiz, eybecər ayaqlarını görmək, yalnız bu barədə danışmaq sənə yaraşmaz və hətta eyib gətirər.

1529 B. Nizami bundan əvvəlki beytdə dediyini təkrar edir və bir az da zənginləşdirir. Çirkində gözəli, adidə ülvini, qarada ağı görə bilmək, kəşf eləmək yalnız müdrik kişilərin hünəridir.

## İSA PEYĞƏMBƏRİN HEKAYƏTİ

1537 B. Əntiq Romada və Yunamstanda eyvanları dürlü quş və heyvan rəsmləri ilə bəzərmişlər. Şair həmin adətə işarə vuraraq Həzrət İsa peyğəmbərin dili ilə bildirir ki, bu it vaxtilə o qədər mahir, çevik, qüdrətli şikarçı olub ki, sahibi onun şəklini eyvanına çəkdirib.

1542 B. Dini anlayışa görə, Tanrı doqquz fələyi ona görə yaradıb ki,insanların eybinin üstünə pərdə çəksin və mələklər insanın yalnız savab işlərini görsün, günahlarını tam muşahidə etməyə macal tapmasınlar (prof.R.Əliyev).

1543 B. *Həlqə - xalta*, köləlik xaltası. Şair deyir ki, bu dar, üzükvarı dünyada hər şey sənin boynuna köləlik xaltası taxmaq, səni nökər, qul görmək istəyir. Əgər özün də bunu istəyirsənsə, deməli, kişi deyilsən, qulsan.

1544 B. Qədim münəccimlərin dediyinə görə, Süræyya ulduz topası Böyük köpək bürcünün xaltası mövqeyindədir, daha doğrusu, ikinci birincidə yerləşir. İkinci misra eşşəkdən yalnız yük daşımaq üçün deyil, həm də nəq-

liyyat vasitəsi kimi istifadə edən İsa peyğəmbəri yada salır. Şair özünün vəsf və ifşa obyekti olan qəhrəmanını - İnsam xalta gəzdirməməyə, eşşəklik etməməyə çağırır.

1547 B. Yəni Nizaminin dərdini çəkmək sənə qalmayıb.

## On birinci söhbət
## DÜNYANIN VƏFASIZLIĞI HAQQINDA

1552 B. *Qəm gəmisi* - dünyamız. *Yük* - yığdığın var-dövlət. Aydındır ki, nə qədər çox var-dövlət yığırsansa, gəmidə yükün bir o qədər ağır olacaq və tufan, qasırğa başlananda ilk növbədə yükü ağır olanlar batacaq.

1561-1562 B. O dünyanı bu dünyaya satına. Mənəvi aləmi, ruh dünyasını kaftara bənzəyən bu maddi aləmdən üstün tutmağı bacar!

1569 B. Orijinalda Nizami "hərislər" əvəzinə "duzsuz"lar məcazını işlədir. *Bu səhra* - dünyamız.

Beytin mənası: Yalnız kabab və şərab düşkünləri, hərislər və tamahkarlar bu səhranın, bu dünyanın od rənginə, zahiri parıltısına uyurlar. Düz və duzlu adamlar isə yanıb kabab olurlar.

## On ikinci söhbət
## DÜNYAYA VİDA

1607 B. Bu dünyanı at, o dünyanı tut. Bu dünya tor kimidir, qoy o tora dən yemək istəyənlər düşsün.

1610 B. Ölmək ərəfəsində ağla. O göz yaşından göyərən çəmən, yaxud fidan sənin başlanmağının rəmzi kimi yaşar, ruhunu yaşadar.

1611 B. *Dəvə xislətli olmaq* - oynamağı, gülməyi, sevinib rəqs etməyi bacarmaq. *Dəbbə* - içərisi otla və saman ilə doldurulmuş xaral. Bu xaralı filin ayağı altına atarmışlar ki, onu döyüş meydanına çıxmağa hazırlasınlar, düşmənləri bu xaral kimi tapdasın, əzişdirsin. Sonralar bu ifadə məcazi məna qazanmışdır. "Fil ayağı altına dəbbə atmaq" - boş yerə haray-həşir salmaq anlayışının sinonniminə çevrilmişdir.

Beytin anlamı: Ölum məqamı çatanda sevin, şadlan, dəvə kimi rəqs elə ki, bu dünyadan üzülüşüb o dünyaya gedirsən. Bunu bacarmasan barı haray-həşir qoparmağı unut, ölümünü cəsur, mərd qarşıla!

1615 B. *Bu natəmiz torpaq* - dünyamız.

Beytin mənası: Dünyamız bütünlükdə natəmizdirsə, orada təmizlik aramaq hədər deyilmi? Natəmizlikdən əl çəkib təmiz, pak ruh dünyasına qanadlan! Könlünü yalnız bu yolla saf su kimi paka çıxara bilərsən.

1616 B. O dünyaya yüngül, asan getməyini istəyirsənsə, bu dünyada yığdıqlarını payla, bəxş et ki, çevikləşəsən, son mənzilə uça-uça gedəsən.

1621 B. *Bu çevrə sınırı* - dünyamızın sərhədləri.

Beytin mənası: Maddi aləm hüdudlarını qıra bilməsən, mənəviyyat dünyası səni öz oxlarına hədəf qılacaq, ulduzlarını sənə tuşlayacaqdır.

1622 B. *Gecənin, gündüzün cızığı* - ömrün hüdudları. *Bu çevrə xətti* - dünyamızın hüdudları.

Beytin mənası: Maddi aləmə bağlı ömrün hüdudlarından kənara çıxmağı bacarsan, dünyamızın hüdudlarını da vurub keçəcəksən, yeni dünya - ruh və mənəviyyat aləmi qazanacaqsan.

1627-1629 B. *Dolaşıq kələklər* - fələyin kələfləri.

Beytin mənası: Özünün ruh və zəka qüdrətini dərk eləmiş və istedadını bəşəriyyətə həsr etməyə qadir insanın böyüklüyü qarşısında fələk heç bir şeydir, hətta ilan kimi qıvrılıb açılsa da acizdir.

1641-1642 B. Bu mətndə "şəkər" sözünün ikinci, məcazi mənası bilikdir, elm, tədbir, şirin dil kimi ülvi anlayışlardır. Nizami deyir ki, qızıla, yaxud şöhrətə, sərvətə, var-dövlət yığmağa susuzluğunu, təşnəliyini yalnız və yalnız zəka, tədbir, səbr, təmkin sayəsində söndürə, öldürə bilərsən. Necə ki, gündüz gecəni öz nuru ilə boğub öldürür, yaxud tədbirli filosof əfsun oxuyub təqdim etdiyi çiçəklə öz rəqibinə qalib gəlir.

## ÇƏKİŞƏN İKİ FİLOSOFUN DASTANI

1656 B. "*Nuşiqiya*" - novruz otu deyilən bitkidən hazırlanmış məlhəm ("Bürhani qatı").

1667 B. Beytin məzmunu Qurani-şərifin "əl-Ənam" surəsinin 77-ci ayəsindən iqtibas olunub: "O (İbrahim) çıxan Ayı görəndə dedi: "Bu, mənim Tanrımdır!" O, batandan sonra isə (İbrahim) dedi: "Mənim Tanrım məni düz yola hidayət etməsə, mən yolunu azmış adamlardan olacağam (prof. R.Əliyev).

1669 B. Nizamiyə görə könlü işıqlandıra bilmək - maddi dünyadan əl çəkib mənəvi dünyaya qovuşmaqdır. Ən böyuk səadət heç də maddi aləmdə deyil, yalnız ruhun qüdrəti sayəsində qazandığın mənəvi aləmdədir.

1670 B. *Ağ, qara lövhə* - gündüz, gecə. İnsan öz ömrünün gecəsini, gündüzünü təmizə çıxardıb pak etmək üçün tövbə qılmalı, suçlarının, günahlarının bağışlanmasını sidq ürəkdən ulu Tanrıdan diləməli və tövbəsinə layiq yaşamalıdır. Bu halda göz yaşı tökmək mənən təmizlənməyin rəhnidir və bu göz yaşı ümid gülabıdır. Başqa sözlə desək, sən bağışlanacağına və bundan sonra insan kimi yaşayacağına ümid bəsləyə bilərsən.

1671 B. Nizamiyə görə ölçü-biçi əsasında yaşamaq özünü nəfsə, tamaha, yırtıcı ehtiraslara təslim etməməyi bacarmaq deməkdir. Yalnız bu dünyada gözəl yaşamaqla, o dünyanı qazana bilərsən.

## On üçüncü söhbət
## DÜNYADAN ƏL ÜZMƏYƏ DAİR

1677 B. Bu dünyaya aldanma. Onun çeşməsi ilğımdır, aldadıcı serab (miraj) hökmündədir. Ömürdən sonrakı ömrünü düşün.

1684 B. *Cəfəri qızıl* - xıltı olmayan, ən saf, təmiz qızıl deməkdir. Prof.R.Əliyevin yazdığına görə, buna ona görə cəfəri qızıl deyirlər ki, məşhur ərəb xəlifəsi Harun ər-Rəşidin (783-809) vəziri Cəfər Bərməkinin əmri ilə yüzdə yüz, xalis qızıla sikkə vurmağa başlayıblar.

Beytin mənası: bu sarı gülə bənzər Cəfəri altununu payla, bağışla. Şam kimi qızıl şölə saç ki, öz nurun ilə işıqlanasan - bu dünyada rəhmət, o dünyada şəfqət qazanasan.

1685 B. Bütün canlılarda bədənin doqquz qapısı var: iki göz, iki qulaq, ağız, burun deşikləri və s. Altıbaşlı altun - məşhur İran alimi Vəhid Dəstgirdinin yazdığına görə xalis qızıldan qayrılmış altı başlı büt olmuş, sonralar bu ad həmin qızıl növünə aid edilmişdir.

1687 B. *Məqsəd sikkəsi* - Tanrının razılığını qazanmaq və el içində yaxşı ad qoyub getmək.

1689 B. Bəlkə hətta xeyli üstündürlər Çünki şahlar, krallar, səltənət imperiya başçıları xalqların, müstəmləkə məngənəsinə saldıqları ulusların qanını şüşəyə tutmaq hesabına varlanır, özlərinə qızıldan taxt-tac düzəltməklə bəşəriyyətin nifrətini, qəzəbini qazanırlar. Sikkə vuran dəmirçilər isə halal əmək adamlarıdır, buna görə rəğbətə, məhəbbətə layiqdirlər.

1690 B. İncil kitabında həyat tarixçəsi tam işıqlandırılmış əfsanəvi xəsis və hədsiz dərəcədə dövlətli Qarun ifrat simicliyinə görə Tanrı tərəfindən cəzalandırılmış, yer yarılmış və Qarunu saysız-hesabsız xəzinələri ilə birlikdə udmuşdur.

1691 B. Özünü qızıla təslim edənlər bədbəxtdir. Qızılı özünə təslim edənlər isə xoşbəxt. Sonuncular qızılı bir qızıl köhlənə döndərib cilovlayıb sürür, məqsəd mənzilinə çatırlar.

1696 B. Belə bir təsəvvür varmış ki, qızıl mədənləri yalnız şərqdə, gündoğandadır. Beytin yürütdüyü digər fikir budur ki, qızıl Günəş şərqdən doğur, qərbdə batır. Deməli, qızılın, işığın, səxavətin ilk vətəni şərqdir.

1698 B. Burada Günəş şərqli, Ay isə qərbli kimi təqdim olunur. Bəllidir ki, Ayın öz nuru yoxdur, yalnız Günəşin verdiyi şölə hesabına işıqlanır. Deməli, nur dilənçisidir.

1700-1701 B. Keçmişdə məhək daşını ən çox Dəməşq şəhərindən gətirərdilər. Xalislik əyarına malik ən saf qızıl isə Kiçik Asiyadakı Bizans imperatorlarına məxsus olmuş, bunu Rum qızılı adlandırmışlar.

## XAİN SOFU İLƏ HACININ DASTANI

1717B. Sofu elə yedi ki, əlinə düşən ovu,
Çırağı da bir gilə yağın möhtacı oldu.

Yəni əmanət pulu son qəpiyinədək xərclədi. Keçmişdə başqalarının heyvanı ilə qarışıq salmamaq üçün mal-qaranı damğalarmışlar. Bununla bağlı ideomatik ifadə yaranmışdır. "Filankəs ovunu elə yedi ki, heç damğa yeri də qalmadı". Şeyx də əlinə keçən əmanətilə bu cür davranır.

1718 B. Bizim Hacı elə ki, Kəbədən geri döndü,
Öz hindlisi önündə bir Türk kimi göründü.

Burada "hindli" anlayışı "üzüqaralıq", "Türk" ifadəsi isə "cəsurluq", "tələbkarlıq", "öz haqqını tələb edən qüdrət sahibi" ifadələrinin sinonimi kimi işlənmişdir.

1723 B. Belimi qırdı mənim o rükn qızılların.
Dözə bilmədim, yedim boynumdadır vəbalm.

*Rükni qızıl* - öz xalisliyi ilə məşhur olan və hökmdar Rükn-əd-Din Deyləmi tərəfindən zərb edilmiş qızıl pul.

1729 B. Öyüd verdi özünə: - Azca təsəllimiz var,
Dərvişin heç nəyi yox... Heçdən nə almaq olar?

Doğrudan da, dərvişin itaət və ibadətdən başqa nəyi var ki, ala biləsən?!

1731 B. Sofunun boğazmdan keçən o maldan qalan
Başı halqalı "Mim"lə kufi "Əlif"dir, inan.

"Mal" anlayışmdan yalnız "MA" hecası qalıb ki, bu da ərəbcə “yox” "heç" deməkdir. Sofunun başı halqalı "Mim"dən və kufi "Əlif"dən savayı verməli heç nəyi yoxdur.

1735B. Din - əyarlı qızıldır, vermə onu şeytana.
Fəğfurun şərəfini layiq görmə səgbana.

*Fəğfur* (baqpur) - Tanrı oğlu. Bu söz Yaxın və Orta Şərqdə Çin imperatorlarının ləqəbi olmuşdur. Burada isə şah mənasmdadır (prof. R.Əliyev).

Beytin mənası: Saf qızıl olan dini şeytanlara sofular kimi təslim etmə, ulu şahların bilərziyini it saxlayanların əlində xaltaya, midbərə döndərmə!

1743 B. Torpaqla qurd dostluğu eləyir daim külək,
Özü yüngül, əli boş, heç nə itirməyəcək.

*Qurd dostluğu* - felən düşmənlik.

1744 B. Sənin diləklərinin tərəzisi olan zər,
Beş rükət namazının fatihəsinə bənzər.

Yəni namaz qılanda sən Allahı, peyğəmbəri yox, öz varidatını artırmaq yollarını düşünürsən. Bu cur namaz qılmaq, əslində bütün namazlarının axırına çıxmağın deməkdir.

## On dördüncü söhbət
## QƏFLƏTDƏN OYANMA ŞƏRTLƏRİ

1748 B. Xəbərsizsən aləmin mavi dairəsindən,
Dövr eləyən Günəşdən, göylərin mərkəzindən.

Yalnız özünün zəka və ruh qüdrətini dərk edənlər - ariflər bu dünyanın gedişini, kainatın bilməcələrini anlamağa qadirdirlər, sən yox!

1761 B. Kabab olan ciyərə səpilmiş duzdur şərab,
Duzsuzlara, kəmlərə qismət olsun bu əzab.

Duz qatılmış üzüm suyu olan şərab əslində ciyərləri yandırıb kabab edən oddur, atəşdir. Duzsuzlar, ağıldan kəmlər bu odla ciyərlərini yandırırlar.

1766 B. "Əlif'sənsə, qanadsız quşa dön, barsız yaşa!
Ya "Bey" kimi bar gətir, ömrü gözəl vur başa.

Şax və məğrur qamətinlə öyünmək istəyirsənsə, "Əlif' kimi yalqız və mütəkəbbir dayan və əksinə, həyat xəzinəsindən bəhrələnmək istəyirsənsə, başıaşağı, təvazökar "Bey" kimi dolan, məhsuldar ömür sür!

1768 B. Sən ki, tikan deyilsən dırmanma yüksəklərə,
Əlsiz-ayaqsız gül ol, bizi qərq elə ətrə.

Lovğalığı ucbatından dimdik dayanan, yüksəklərə can atan, bəzən hətta divar üstündə bitən, hər şeydən uca görünmək istəyən tikan kimi gözə girmə, başıaşağı, təvazökar yaşayan, bəzən hətta əli, ayağı bilinməyən qızılgül kimi yaşa ki, həndəvəri rayihənə qərq edəsən.

1772 B. Özünü kölgəlikdən qurtara bilsən əgər,
İnan, eyiblərin də kölgə kimi çəkilər.

Gözəl və cəsur yaşamağı, içəridən nurlanmağı bacarsan kölgəlikdən, köləlikdən, mənəvi zülmətdən, ətalətdən, sıxıntı və eybəcərlikdən xilas ola bilərsən. Öz işığında eyiblərin əriyər, yox olar.

1773 B. Zülmətdə əyləşməyə dözə bilmir hər kişi,
Təkcə dirilik suyu görə bilir bu işi.

Cəbrə qatlaşmaq, unudularaq yaşamaq, irtica zülmətinə davam gətirmək, dözümlü və iradəli olmaq hər kişinin işi deyil. Yalnız öz köks qəfəsini qaranlığında dirilik suyu saxlamağı bacaranlar, bəşəriyyətə xidmətin, nəciblik və xeyirxahlığın dərin qaynaqlarını öz varlığında yaşatmağa qadir olanlar bu səadətə çatırlar.

1774 B. Başı yerdə, ayağı göydə olan ey qafil,
Sənin fikir göylərin alt-üst olub, bunu bil!

Sən ruh aləmində yaşamaq əvəzinə maddi aləmə yapışıb qalmısan. Nəciblik, xeyirxahlıq, insana xidmət bayrağı daşımaq əvəzinə sərvət, şöhrət dalınca sürünürsən, yırtıcı ehtiraslara köləsən. Ömrün baş-ayaqdır. Özünü dərk et, ayağa qalx!

1776 B. Paltarını bu teştdə təmiz yumaq istəsən,
Ucal, suyu Günəşin qaynağından istə sən!

Yəni cəmiyyət əlaqələrindəki çirkdən təmizlənmək istəsən, yüksəlməli, öz ruhunun günəşinə qovuşmalısan!

## ZALİM PADŞAH İLƏ DÜZ DANIŞAN KİŞİNİN DASTANI

1790 B. Ürəkləri sındıran zülmkar bir şah vardı,
Dirəşməkdə, höcətdə Həccacı mat qoyardı.

Həccac Yusif oğlu (661-714) Ömərilər sülaləsinin xəlifələri adından xilafətin müəyyən vilayətlərini idarə edən görkəmli dövlət xadimi olmuşdur. Xilafət düşmənlərinə qarşı mübarizədə, güman ki, əsil rəqəmləri şişirdən salnaməçilərin dediyinə görə, 130 min adamı edama məhkum etmişdir. Həccacın vəfatı günündə isə ömərilərin dustaq evlərində onun əmrilə azadlıqdan məhrum edilmiş 15 min kişi və 30 min qadın olmuşdur. Buna görə Yaxın Şərq ədəbiyyatında onu qəddar zülmkar saymaq dəb halına düşmüşdur. Bununla belə, güman etmək olar ki, onun surəti ömərilərə düşmən kəsilmiş Abbasilər sülaləsinin tarixçiləri tərəfindən təhrif edilmişdir. Qədim salnamələrin birində deyilir: "Namuslu adamlara münasibətində o, yaxşı insan, üsyançılara münasibətində isə qəddar idi. Nəzərə almalıyıq ki, Həccacın hakimiyyət illəri zidd qüvvələrin toqquşduğu, həyəcanlı və mürəkkəb bir dövr olmuşdur.

1792 B. Aytək, güntək itigöz bir xəfiyyəsi vardı,
Bağlı qalan işləri ustalıqla açardı.

Gecənin qaranlığı hər şeyi gizlətdiyi, sirri batırdığı halda Ay və dan yeri sirr açan sayılır. İşıqda hər şey görünür, gizlinlər, bilməcələr açılır.

## On beşinci söhbət
## PAXILLARDAN ƏLHƏZƏR

1818-1819 B. Çınlayır dünya sazı... rəqqası yoxdur, heyhat!
Dəniz cəvahir dolu... qəvvası yoxdur, heyhat!
Qılınc, tac parıltısı, dirhəm şöləsi, gövhər,
Nə istəsən buyur, seç... bərq vurur xəzinələr.

Təbiət və cəmiyyət gözəlliklər, ülviliklər ilə doludur. Oğul istəyir ki, qollarını çirməsin, istedadına arxalansın və bu sonsuz gözəlliklərə bədii lövhələrdə canlandırmağa qadir olsun! Gerçəklikdəki gözəllikləri canlandırmağa böyük sənət, böyük sənətkar gərək!

1827 B. Dünya yolçuluğunda gör nə qədər yol gedən,
Bir az da ağıllıdır daldakı öndəkindən.

Arxadan gələn şairlər, yeni gənclər öndə gedənlərdən, qocalardan, bəzən daha ağıllı, daha istedadlı olurlar. Çünki onlar qabaqda gedənin də təcrübəsini mənimsəyə bilirlər. Halbuki öndə gedən çox vaxt arxada gələnin özündən və irsindən xəbərsizdir.

1828 B. Yalnız idrak əhlinə yaraşır şərəf, ad-san,
İdrak üçün fərqi yox, cavansan, ya qocasan.

Sənət aləmində başlıca meyar heç də gənclik, yaxud qocalıq deyil, ilk növbədə istedadır, idrakın qüdrətidir. Buna görə şərəf də, çələng də, adsan da yalnız və yalnız istedada görə müəyyənləşdirilməlidir. İstedadı qiymətləndirməyi bacarmayan cəmiyyət naqisdir və bəlkə antihumanistdir.

1829 B. Eşitdim: qocalırkən mərcana çevrilir daş.
Düşün bir az, hər daşdan mərcan yaranmır, qardaş!

Məgər hər saçı ağarmışa ağsaqqal demək olar? Məgər hər daş mərcana çevrilir?

Nizami poemanın bu fəslini yazırkən saraya soxulmuş qoca şerbazlardan şiddətli dərəcədə pislik görmüş, zərbə dadmışdır. Buna görə fəslin demək olar ki, hər beyti mənəvi cəhətdən qocalmışlara qarşı hiddətlə, sağlam nifrətlə doludur.

1830 B. Xəbislər qocaldıqca bir az da quduzlaşır,
Ləçər arvadlar kimi qeyzi başmdan aşır.

Poemanın orijinalmda "ləçər arvad" ifadəsi əvəzinə "dağlı arvad" məcazı işlədilir. Dağlı arvad - əfsanəyə görə dağda yaşayan, gözəgörünməz bir qadındır, qışqırana əks-səda verən odur. Əslində əks-sədanı yaradan içiboş yuvalar, zağa, kaha və mağaralardır. Nizami saraya soxulmuş şerbaz əleyhdarlarını həmin içiboşlara, ilan, əqrəb yuvası maqaralara və boş hay-küy salan ləçər arvadlara bənzədir.

1833-1839 B. Qönçədən çıxmış gülün ətri zərif, incədir,
Fəqət köhnə tikanın yarası bərk incidir.

Dəyib xal salan üzüm - göz üçün bir tutiya,
İlansa qocalırkən dönüb olur əjdaha.

Cavanlarm başında ağıl qollu-budaqlı,
Kif atan başlar isə çox da xoşlamır ağlı.

Ayı, günü, həftəni öyrənmək istəyənlər,
Baxmaz köhnə təqvimə, baxsa da verməz səmər.

Aslanlardan çox yeyər acgöz, qoca köpəklər,
Ceyranın göbəyini canavar kimi sökər.

Məni çox da qınama, qorxsam qoca qurdlardan,
Mən ki məzlum Yusifəm, yerim də quyu, zindan.

Yox, qocalar gənc kimi vura bilməzlər yara,
Gəncin əlinin suyu bənzər yanar odlara.

Bu parcanın və onun davamının başlıca münaqişəsi gənclik ilə qocalıq arasında gedən mübarizədir. Nizami mənəvi qocalığı mənəvi gəncliyin ilk düşməni, başlıca döyüş və mübarizə qaynağı hesab edir, buna görə təfəkkürü, ruhu qocalmışları "yara vuran köhnə tikana", "əjdahaya çevriliş qartımış ilana", içində ağıldan başqa hər şey olan "kif atmış başa", köhnəlmiş və əhəmiyyətini itirmiş cırıdır təqvimə, aslanlardan çox yeyən "qoca köpəyə", "ceyranın göbəyini sökən canavara" bənzədir və əksinə, gəncliyi birinci növbədə, mənəvi gəncliyi səciyyələndirmək üçün ən gözəl, işıqlı bənzətmələr seçir: quru tikanın antonimi olan "qönçədən çıxmış gül", "dəyib xal salan üzüm", "qollu-qanadlı zəka ağacı", "əlinin suyu oddan, alovdan qüdrətli xilqət" bu bənzətmələr sırasındadır.

1841 B. Ağ yasəmən çatarmı yamyaşıl, tər söyüdə?
Ağ saçları qoyarmı o bənzəsin hindliyə?

Burada yasəmən qocalığın, söyüd gəncliyin rəmzidir. Məgər istedadsız ağ saçlı qocalar istedad və gənclik timsalı hindliyə bənzəyə bilərmi?

1843 B. Yalnız xudbinlərdi, bax, bərk tutanlar köhnəni,
Haqqa tapman ərlər xudbinliyin düşməni.

Mənəvi cəhətdən qocalmışlar, xudbinlər yaşamaq haqqını itirmiş köhnəlikdən dördəlli yapışmışlar, buna görə onlar Allah, insaf, vicdan kimi ulu anlayışlardan min ağac uzaq düşmüşlər. Haqqı, Allah yolunu tutan gənclər isə xudbinliyin düşmənidirlər, tərəqqi uğrunda sağlam mübarizdirlər.

1844 B. İndi bilal gördüyün Ay ki, saçır nurunu,
Kamal çağına ercək, bədr adlandır sən onu.

Bu gün aypara sandığın gənc sənətkar sabah dolğun Ay kimi şəfəq saça bilər, ovun bədrini hilal ikən görməyi bacar.

1845 B. Cavan xurma ağacı yüksəldimi səmaya,
Əlini elə at ki, çata bilsin xurmaya.

Nizami özünü və öz poeziyasını artıq bar verən xurma ağacına bənzədir, əleyhdarlarını xəbərdar edir ki, bu xurma ağacına hörmətlə, ehtiramla yanaşmalısan. Əks halda, xurma yemək əvəzinə əlinə, ağzına tikan batar.

1853 B. Bəxt ucaldan bayrağı kim aparsın irəli?
Yalnız onu hifz edən igidlərin əlləri!

Böyük bir poeziya bayrağı ucaldılıbsa, gərək hamı, qocalı-cavanlı öz nəfəsilə onu dalğalandırsın, ucaltsın, irəli getməsinə yardım qılsın!

## GƏNC ŞAHZADƏ VƏ ONUN QOCA DÜŞMƏNLƏRİNİN HEKAYƏTİ

1867 B. Bağlamasan kökünə təzə bulağı, arxı,
Tufanla güləşərmi çinarın qol-budağı?

Köhnəlmiş, sozalmış, qurumuş arxın lili, üfunəti təzə fidanın köklərini yandırıb çürüdə bilər, sən onun kökünə can verəcək yeni arx, yeni bulaq çək ki, qalxıb qanadlansın, qasırğalarla güləşə biləcək əzəmətli çinara çevrilsin!

1869 B. Özünü dərk edənin öz könül vaizi var,
Ən gözəl öyüdləri qulağına pıçıldar.

Nizami Gəncəvi burada "özünü dərk edən" hökmdar deyərkən Bəhram şah Ərzincanlını, "ən gözəl öyüdləri" onun qulağına pıçıldamağa qadir "könül vaizi" dedikdə isə özünü nəzərdə tutur.

1870 B. Ağlını - qılıncını çıxar qınından bir an,
Nə vaxtacan onu sən qında saxlayacaqsan?

Bəhram şah Ərzincanlıya üz tutan Nizami özünü zəka qılıncına bənzədir və şahdan tələb edir ki, bu qılınc qında qalmasın. Zira bu sənət qılıncı köhnə mücrüdən çıxarılmayıb, Tanrı tərəfindən göndərilmiş ülvi bir töhfədir. Pak nəfəsli ilham, istedad sahiblərindən hökmdarlar gərək heç nəyini əsirgəməsin.

## On altıncı söhbət
## MƏSLƏKDƏ ÇAPUQ İRƏLİLƏMƏ

1882 B. Adəm asqırığının Məsihə çatdı səsi,
Qoy natiqlərə çatsın yalnız dövlət xütbəsi.

Cəbrail Həzrət Adəmin birinci asqırığını gizlətmiş və Məryəm ananın köynəyinin qoluna üfürmüşdür ki, bundan boylu olub çocuğunu, gələcək peyğəmbər İsanı - Məsihi dünyaya gətirmişdir. Belə bir qüdrət, Cəbrail vasitəçiliyi dövlət başçıları üçün xütbə oxuma girəvəsi yalnız Nizami kimi natiq sənətkarlara yaraşır!

1887 B. Yalnız saxta sikkənin paxırını açır od,
Oddan nə qorxun sənin, ey saf qızıl, ey yaqut?!

İradə və məslək xadimləri çətinlikdə daha da bərkiyir, saflaşır, həyatın nə şaxtasından çəkinir, nə atəşindən. Necə ki, od içinə düşəndə qızıl daha da saflaşır, başqa ərintilərdən təmizlənir. Yaqut isə odda yanmır.

1912 B. Covza bürcündən doğub çağır səadətini,
Dövrün xoşbəxt oğlu ol, sən də sına bəxtini.

Klassik astronomların dediyinə görə, Günəşin Covza (Əkizlər) bürcündən keçdiyi çağlarda (22 may - 22 iyun) anadan olan çocuqlar xoşbəxt taleyə malik olur. Çoxuşaqlı hökmdarlar bu etiqad ilə öz dəliqanlılarına eyni sayda qoz verir, qozu sındırmalarına tamaşa edərmişlər. Kimin heç bir qozu-cevizi çürük çıxmasa o, Covza bürcü şöləsinə layiq sayılar, vəliəhd təyin olunarmış. Nizami burada "ceviz" və "covza" sözlərinin səs uyarlığından mahiranə istifadə etmişdir.

1914 B. Rahat çağladığından sellər, sular bəxtiyar.
Dügümlü ud ağacı odda yanar, kül olar.

*Ud ağacı* odda yandıqda ətir saçır. Buna görə manqalı udun köməyilə qalayırlar.

1922 B. Bizim doqquz katibin bir cüt hünərnaməsi,
Nişan verə bilmədi mənə dolu bir əksi.

*Bir cüt hünərnamə* - gecə, gündüz. *Doqquz katib* - doqquz fələk.

Beytin mənası:. Yer üzündə elə bir kişi tapılmadı ki, yaşamaq qanunlarını tam dərk etməyə qadir olsun. Doqquz katibin (doqquz fələyin) nə gecəsi, nə gündüzü həmin adamı nişan verə bilmədi.

## On yeddinci söhbət
## TAPINMA VƏ TƏCRİD BƏHSİ

1964 B. Əqlin - canındır sənin, bədəni, cismi sənsən, Canın bir xəzinədir, sehri, tilsimi sənsən.

Buna görə tilsimi sındırmalısan bədəninə əziyyət verməlisən ki, canını-xəzinəni xilas edə biləsən. Yalnız bircə yolla - sərvət, şöhrət, şəhvət acgözlüyündən, kirli ehtiraslardan əl çəkməklə sən bu nadir xəzinəni özündə kəşf edə bilərsən.

1972 B. Tutuquşu gülənde çatladı qəndin bağrı,
Kəkliyinsə ağzını yumdu qaqqıltıları.

Tutuquşu güləndə orta həddi gözlədiyi və gözəl nitq nümayiş etdirdiyi üçün onun şirinliyindən qənd, şəkər xəcalət çəkdi, bağrı çatladı. Kəklik isə orta həddi gözləyə bilmədi, qaqqıltıları dünyanı başına götürdü, buna görə özünü qartallara nişan verdi, ovlandı, ağzı biryolluq yumuldu.

Nəticə: güləndə, qonuşanda, yeyib-içəndə, hər işdə orta həddi gözlə, ifrata varma!

1980 B. Hər sevinən ürəkdə yanğılı bir qəm də var,
Hər gündüzün gövhəri gecə bətnindən doğar.

*Gündüzün gövhəri* - Günəş.

## MÜRŞİD İLƏ MÜRİDİN HEKAYƏTİ

*Mürşid* - yol göstərən, rəhbər, nəsihətçi, bələdçi, öz müridlərinə rəhbərlik edən dini təriqət başçısı. Mürid - şagird, tərəfdar, ardıcıl; bir təriqətdə şeyxin, yaxud murşidin ardınca qoşan təriqətçi. Təriqət - yol, dini məslək yolu.

1998 B. Sən ki eşşək deyilsən, əl çək bədən yükündən,
Zahidlik yükü daşı, xam, deyilsən, əgər sən.

Başqalarının qanını sormaq, zülm etmək, nəfs, tamah acgözlüyü, şöhrət və şəhvət düşkünlüyü kimi murdar ehtiraslara təslim olanlar bu dunyada öz boynuna çox ağır yük götürür və yükün ağırlığı altında çökürlər. Arif və cəsur insanlar isə bu cür qeyri-insani yükdən imtina edir, bəşəriyyətə xidmət yolunu seçirlər.

1999 B. Sənin zahidlik xəttin əyilməsə, düz olsa,
Yas nədir bilməyəcək, hamı batsa da yasa.

*Zahid* - ibadətçi, pəhrizkar, asket. Sənin zahidliyin zahiri deyilsə, doğrudan da, dinə, Tanrıya, düzlüyə, bəşəriyyətə xidmətdən ibarətdirsə, onda sənə zaval yoxdur, heç vaxt ətəyin yaş olmayacaq, biabır olmayacaqsan.

2000 B. Zahidliyin göz diksə zərli şah xələtinə,
Bənzəyər Süleymanla zənbil hekayətinə.

Dünyanm məşhur tacidarları başma qızıl tac qoyub eyninə zərli libas geyənlər zahidlik yoluna düşdükdə daha əzəmətli görünürlər. Beləlləri ən böyük hökmdar olduğu halda zənbil hörən və öz əllərinin rəngi ilə yaşayan Süleyman peyğəmbərə bənzər.

2001 B. Dəruni zahidliyin qəbası altmda şam,
Hidayət nuru saçar, qızıl saçar hər axşam.

Pilətəsindən, yağından və alışıb yanan cismindən, canından başqa heç nəyi olmayan şam, gecələr əsil zahidə bənzər: həndevərinə düzlük (hidayət) nuru və qızıl səpdiyi halda hay-küy salmadan yanar və bu yolda canını qurban verər.

2002 B. Xoşdur, zahid görünsə hətta meyxanələrdə,
Xəzinələr saxlanır çünki viranələrdə.

Aclıq, qıtlıq, yoxsulluq olan yerdə zahidlik onsuz labüddür. Meyxanələrdə, nemətlərin sərgisi açılan yerlərdə, saray və kəşanələrdə zahidlik etmək isə ikiqat qəhrəmanlıqdır. Çünki burada nəfsi saxlamaq və başqaları haqqında düşünmək, onların, yoxsulların rifahı haqqmda qayğı bəsləmək daha böyük hünər istəyir. Bir də zahidin (Tanrı bəndəsinin), halal adamın hərəmxanaya qədəm qoyması - viranəyə, xarabalığa girməsi kimidir. Nə qəm, nə yaxşı xəzinələr məgər elə xarabalıqda yerləşmirmi?

2003 B. Zər yelənli bayrağın altında olduğundan,
Nizami zahidliyi səfa gətirir müdam.

Nizami zahidliyi heç də nemət qıtlığı ucbatından deyil, əksinə, o zər yelənli bayrağın altında, hökmdar, sultan himayəsində yaşayır, buna görə qənaətcilliyi və zahidliyi ikiqat igidlikdir, səfa gətirən zahidlikdir.

## On səkkizinci söhbət
## İKİÜZLÜLƏRDƏN ƏLHƏZƏR

2004 B. Daim özünə bənzər saxta sikkələr kəsən,
Qəlbi kimi boş qəlib yapanları tanı sən.

Könül mədənindən inci və dürr kimi çıxardığın sözləri saxtakarlara, saraya soxulmuş şeirbazlara, sərvət və şöhrət dilənçilərinə göstərmə. Onların qəlbi qəlpdir. Onlar bəşəriyyətə sənət numunəsi əvəzinə "boş qəlib" təqdim edirlər ki, içində heç nə yoxdur.

2006 B. Qarşında işıq kimi parlaq görünər onlar,
Arxanca kölgə kimi oğrun sürünər onlar.

Zahiri bəzək-düzəklərinə, rütbə, vəzifə, çələnk və təltiflərinə, imtiyazlarına uyma. Üzdə parıltılı görünsələr də, içəridə zülmət kimidirlər, arxanca kölgə kimi sürünən casuslar, şaiyəbazlar səni güdaza vermək üçün fürsət, girəvə güdənlərdir.

## SİR SAXLAYAN İLƏ CƏMŞİDİN DASTANI

2072 B. Başını doqquz göydən dışarı çıxaranlar,
Dəruni aləminin meydanında at çapar.

Kainatın mənəvi hökmdarları yalnız və yalnız öz nəfsinə qalib gəlməyi bacaranlar, hər cür acgöz və yırtıcı ehtirasları boğub ram edə bilənlərdir ki, göylərin doqquzuncu qatından yuxarı qalxırdı ərşə, Tanrı mərtəbəsinə yüksəlir və özlərinin ruh aləmində köhlən səyirdirlər.

2074 B. Eşqin gizli qalması bir möcüzə sayılır,
Elə ki üzə çıxdı, xərabatda bayılır.

Eşq yalnız o zaman möcüzə səviyyəli gözəlliyə, ülviyyətə çevrilir ki, ürəkdə bəslənir, faş edilmir. Elə ki, aşiq və məşuq bu sirri açdı, dilə-dişə saldı bir gün onları xərabatda bayılmış görürlər. Yəni böyük məhəbbət əvəzinə yataq həyatı, cismani yaxınlıq müşahidə edilir.

2075 B. Sirr düyünü vurarkən din ipliyi seçdilər,
Həllacın da ipini bu pambıqdan eşdilər.

*Həllac* - pambıqdarayan və X əsrin məşhur filosof- sufi şairi Mənsurun ləqəbi.

Beytin mənası: Məhəbbətin sirr kisəsinin ağzı dinin sapı ilə bağlanıb. Onu bağlı saxlamağı bacarmalısan. Əks halda səni Mənsur həllacın aqibəti bəklər. Sirri açdığına, "Mən - həqqəm!" deyə haray çəkdiyinə görə boğazına sabunlu ip, kəndir keçirildi.

2076 B. Nə qədər ki, bağlıdır qönçə rahat, salamat.
Dönür qan çanağına açılan kimi, heyhat.

Nə qədər ki, səba və Günəşlə vüsal sirrini saxlaya bilir, qönçə salamatdır. Elə ki, bu sirri açıb gülə çevrilir, dərhal qanını töküb onu dərir, aparırlar.

Nəticə: sirri qorumalısan!

## On doqquzuncu söhbət
## AXİRƏTİ QARŞILAMAQ HAQQINDA

2087 B. Sənə - dindən əl çəkib dünya tələb edənə,
2088 B. Dinin keşikçiləri görün nə deyir, nə!
"Qayıt ədalətsizin, nakəsin qapısından, Bu sirlər sarayının ətrafını gəz, dolan!"

*Dinin keşikçiləri* - peyğəmbərlər. Ədalətsizin, nakəsin qapısı - dünyamız. Sirr sarayı - axirət evi.

2089 B. Dünya bu odlu səhra səni coşdurdu... ancaq,
Burda gizlətdiklərin orda aşkar olacaq.

Dünya dedikləri bu odlu səhrada görduyün ilğımlar - dəbdəbələr, kəşanələr, sərvət, şöhrət və şəhvət yollarında qazandığın zahiri və müvəqqəti uğurlar səni coşdurur, havalandırır, unudursan ki, bu dünyadakı alçaqlıqların üçün o dünyada haqq məhkəməsi, mizan-tərəzi qarşısında hesab verməli olacaqsan! Bütün zülmlərin, xalqların qanını sormaq üçün tələ, tor qurmağın, əliuzunluğun, acgözlüyün üzünə çırpılacaq, haqqın divanından yaxa qurtara bilməyəcəksən!

2116 B. Onun dərinliyində itib batar mağaran,
O sonsuzluq yanında bir heç olarsan, inan.

*Mağara* - dünyamız.

Beytin mənası: Mənasız yaşayanların dünyada heç bir izi qalmır. Belələri kainat adlı sonsuzluqda heç kimidirlər, sanki heç dünyaya gəlməyiblər.

2120 B. Hanı, biçə bilibmi göylər elə bir donu,
İki papaqlı oğru çala bilməsin onu?

*İki papaqlı oğru* - gecə, gündüz: çərxin gərdişi.

Beytin mənası: Elə bir adam varmı ki, əcəl onu apara bilməsin?!

2122 B. Üzr, naz qapısından de, hansını açdın sən?
Həmin qapı uzünə açılacaq təzədən.
Yəni bu dünyada nə əkmisənsə, o dünyada onu biçəcəksən.
2131 B. Qurşun rəngli qalanı - bu göyləri zəbt elə,
Bu əbləh Xüttəlanı yəhərlə min, dön yelə.
*Xüttəlan* - Şərqi Türküstanda vilayət adı. Burda türklər öz cins atları ilə məşhurdu.
Beytin mənası: Xüttəlan atını minib çap, bu dünyadan elə sürətlə get ki, heç izin-tozun da qalmasın. Ruh aləmini, qurşun qalanı tutmağa tələs.

## HARUN ƏR-RƏŞİD İLƏ DƏLLƏYİN DASTANI

2138 B. Xəlifəlik təxtini alırkən ələ Harun,
Ucalmışdı bayrağı Abbas oğullarının.
*Abbas* - Məhəmməd peyğəmbərin əmisi. Abbasilər xilafəti (750-1256) onun xələfləri və din tərəfdarları tərəfindən təşkil edilmişdir.

## İyirminci söhbət
## ƏSRDAŞLARIN YARAMAZLIĞINA DAİR

2167 B. Çiynimizdə cüt mələk dərdimizi çəkmədə,
Bizimlə ülfətindən şeytan belə qüssədə.
Dini etiqada görə, qiyamət - məhşər günü gəlib çatanda hər insanın çiynində əyləşəcək Rəqib və Ətid adlanan iki mələkdən biri savab İşlərimizi, o biri bəd əməllərimizi qələmə alacaqlar. Onlar indidən bizim üçün qüssə çəkirlər ki, görün bəşəriyyətin gördüyü savab iş nə qədər cılız, alçaqlıqları, suçları, günahları nə qədər böyükdür. Bizi yoldan çıxarmalı şeytanlar, divlər belə qüssə çəkir ki, görün kimə yoldaş, qohum olmuşuq?! (Vəhid Dəstgerdi).
2170 B. Gecədən qaranlıqmış qiyamətin səhəri,
Sübh namaz qılanların hanı bayraq əlləri?
*Bayraq* - paklıq və zəfər timsalıdır. Hanı elə insanlar ki, sübh namazına qalxanda göylərə doğru açılmış əlləri bayraq qədər pak və zəfər müjdəçisi olsun?!
2176 B. Külə döndər qəlbini, vəfa yalnız ondadır,
İnsaf gilindən doğan reyhanınız ondadır.
Mənası: Torpağa dön ki, hər şey torpaqdan doğur.
2177 B. Ürəyin qazandığı hər qələbə, hər zəfər.
Sədaqətdən eşilmiş ən möhkəm yaya bənzər.
İnsanda ən ülvi hisslərin, xeyirxahlıq və qəhrəmanlığın qaynağı ürəkdir. Buna görə Nizami onu möhkəmlikdə kaman kirişinə bənzədir.

2184 B. Riyazət hünərini bir tamaşa zənn elər,
Ərənlər barəsində qara fikrə düşənlər.

Paxıl və alçaq adamlar qəhrəmanlığı bəyənməz, bunu qəhrəmanın özünü göstərməsi, oyunu kimi qələmə verərlər.

2185 B. Səxavətli mərdlərə israfçı deyir onlar,
Sədaqəti, vəfanı müftə qulluq sayanlar.

Vəfa və sədaqət duyğusundan yoksun (məhrum) olanlar bu hünərin daşıyıcılarını lağa qoyar, özünü bütünluklə xalqa, sənətə və bəşəriyyətə həsr etməyi gərəksiz, boş şey, israfçılıq adlandırarlar.

2186 B. Səxavət onlar üçun-yalnız rişxənd qaynağı,
Müdrik söz, qüdrətli söz - qurumuş sel yatağı.

Qəhrəmanlıqla nəfəs alan böyük soz yaradıcılarınm gündəlik mətanəti cır, cılız, miskin adamların rişxəndinə səbəb olar. Poeziya bahadırlarının yaratdığı müdrik sözü, qüdrətli sözü "qurumuş sel yatağı" adlandırmaqdan utanmayan bu zavallılar yaddan çıxarırlar ki, həyatda hər şey gəldi-gedəridir, qalan bircə iradə, ilham və zəka gücündən yaranmış sözdür.

2201 B. Mənim könül bağımdan dərdiyim hər şerimi,
Onlar inkar edirlər əski Nuh qövmü kimi.

Kafirlər, iman gətirməyənlər Nuh peyğəmbəri inkar etdikləri kimi başı gora əsən bu qoca şeirbazlar, saraya soxulmuş məddahlar da mənə qarşı cahad elan etmişlər. Lakin poeziya gəmim bu ümumdünya daşqmından sağ-salamat qurtaracaq, bu ədəbi cırtdanların hamısı selə, suya qərq olacaqlar.

2202 B. Sən ey Xızrın bayrağı, ucal, bir qəza törət!
Yağdır, xoş nəfəsli Nuh, məlunlara qarğış et!

Dini etiqada görə, İskəndər zülmətə dirilik suyu ardınca gedəndə bu dirilik suyunu çoxdan içmiş, əbədiyyət qazanmış, yaşıl geyimli Xızr da ona qoşulmuş, dara düşənlərə, nicat umanlara öz nicat funksiyasını yerinə yetirmişdir. Nizami bircə gilə nura tamarzı qalan bu qaranlıq dünyada, alçaq mühitdə poeziyanın, böyük sənətin, dirilik suyu ardınca qoşduğunu bildirir, bu yolda Xızrı yardıma haraylayır, onun bayrağını öz başı üstündə görmək istədiyini bildirir, Nuh peyğəmbəri də çağırır ki, bəd duası ilə məlunları - onu gözü götürməyən saray məddahlarını tufana qərq etsin.

## BÜLBÜL İLƏ QIZILQUŞUN DASTANI

2221 B. Fələk görür işini daim dinməz-söyləməz, Çəmbərindən başını heç kəs qurtara bilməz.

Haray-həşir qoparmadığma və işini sakitcə gördüyünə görə hər şey fələyin ixtiyarında, hökmündədir. Hələ bircə nəfər də tapılmayıb ki, onun çəmbərindən, həlqəsindən, dar ağacının ilgəyindən başını qurtara bilsin.

## KİTABIN SON SÖZÜ

2223 B. - Tanrı sənə yar olsun, katib, sabahın xeyir!
2224 B. Mən son nöqtəmi qoydum, daha qələm sənindir.
Naxış vur ki, bu xalçam səmalarla yarışsın.
Buqələmun qələmim rənglər sərgisi açsın.

Dan yeri söküləndə bitirdiyim kitabım, ey katib, daha indən belə sənin qələminin hökmündədir. Ona elə bir naxış vur ki, yaratdığını xalça öz rəngləri, xalları, ovsunları ilə səmaları heyran qoysun, fələklərin xalçasından daha zivər, daha münəvvər görünsün.

2235 B. Ayaqlarım bu yurda bənd olsa da... nə zərər?
Əlimdə, ovcumdadır bəlkə bütün ölkələr.

Özü Gəncədən çıxa bilməsə də, Nizami, poeziyasının cahan şöhrəti qazanacağanı elan edir.

2239 B. Uca boyun geyimi boya bərabər gərək,
Ta qalxarkən ayağa utanmaya o mələk.

Nizami Gəncəvi mələk kimi gözəl bir poema yaratdığını bildirir və bu gözələ yaraşan geyim, mükafat, çələng umduğunu dastanın ithaf obyektindən - Bəhramşah Ərzincanlıdan gizlətmir.

## MÜNDƏRİCAT

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktorlar: | *Rauf Cəfərov*<br>*Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Rəşad Həmidov* |
| Kompyuter yığıcıları: | *Bəsti Cəfərova*<br>*Aygün Məmmsdova* |
| Korrektorlar: | *Elmira Teymurova*<br>*Pərinaz Səmədova* |

Yığılmağa verilmişdir 29.04.2004. Çapa imzalanmışdır 04.11.2004.
Formatı 60x90 Vi6. Fiziki çap vərəqi 16,5. Ofset çap üsulu.
Tirajı25 000. Sifariş 161.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.